**1924-cü ildən çıxır**

# AZƏRBAYCAN MƏKTƏBİ

**TƏSİSÇİ**
**Azərbaycan Respublikası**
**Təhsil Nazirliyi**

**May-İyun**
**№ 3 (661)**
**2014**

**Elmi-nəzəri, pedaqoji jurnal**

## BU NÖMRƏDƏ

LİSENZİYA № 022589

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı:** Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş: 06

Jurnal redaksiyanın kompyuter mərkəzində yığılıb səhifələnmiş, "Ərgünəş" FM-də (nəşriyyat-poliqrafiya müəssisəsində) çap olunmuşdur.

**В этом номере**



**In this number**

# Müəllimlərin bilik və səriştəsinin sınaq qiymətləndirilməsi barədə Azərbaycan Respublikası təhsil nazirinin əmri

Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli 13 nömrəli Sərəncamı ilə təsdiq olunmuş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən yüksək nüfuzlu təhsilverənin formalaşdırılması əsas hədəflərdən biri kimi müəyyənləşdirilmişdir. Bu hədəfə nail olmaq üçün müəllimlərin peşəkarlıq səviyyəsinin daim yüksəldilməsini, müəllim peşəsinin nüfuzunun artırılmasını, müəllimin karyera inkişafı və fəaliyyətinin stimullaşdırılmasını təmin edən yeni sistemin yaradılması nəzərdə tutulmuşdur.

Dövlət Strategiyasının icrası istiqamətində ümumi təhsil müəssisələrində işləyən müəllimlərin peşəkarlıq səviyyəsinin qiymətləndirilməsi və əlavə təlim ehtiyaclarının müəyyənləşdirilməsi məqsədilə “Azərbaycan Respublikasının Təhsil Nazirliyi haqqında Əsasnamə”nin 13.5-ci bəndini rəhbər tutaraq

**ƏMR EDİRƏM:**

1. 2014-cü ilin iyun ayında Bakı şəhərinin bütün dövlət ümumi təhsil müəssisələrində çalışan müəllimlərin bilik və səriştəsinin sınaq qiymətləndirilməsi aparılsın.

2. Bakı Şəhəri üzrə Təhsil İdarəsinə tapşırılsın ki:

2.1. Bakı şəhərinin ümumi təhsil müəssisələrində işləyən müəllimlərin ixtisaslar üzrə siyahılarının bir həftə müddətinə hazırlanmasını təmin etsin;

2.2. 2014-cü il may ayının 25-dək hər bir ixtisas üzrə test bankının hazırlanması, ekspertizadan keçirilməsi, müəllimlərin sayına uyğun sual kitabçaları və cavab kartlarının çapı ilə əlaqədar

tədbirləri görsün;

2.3. müəllimlərin bilik və səriştəsinin sınaq qiymətləndirilməsi aparılacaq mərkəz, hər bir mərkəz üzrə rəhbər və nəzarətçiləri müəyyənləşdirsin;

2.4. sınaq qiymətləndirmənin məqsəd və mahiyyəti barədə pedaqoji heyətin məlumatlandırılmasını təmin etsin;

2.5. sınaq qiymətləndirmədə bütün müəllimlərin iştirakını təmin etsin;

2.6. sınaq qiymətləndirmə başa çatdıqdan sonra cavab kartlarının yoxlanılmasını təşkil etsin və nəticələri rəhbərliyə təqdim etsin;

2.7. nazirliyin aidiyyəti şöbələri ilə birlikdə sınaq qiymətləndirmənin nəticələrini təhlil etsin və müəllimlər əmək fəaliyyətinin optimallaşdırılması üzrə təkliflər hazırlasın.

3. Elm və ali təhsil şöbəsi (G.Hüseynova), Məktəbəqədər və ümumi təhsil şöbəsi (A.Əhmədov), İnsan resursları şöbəsi (F.Qədirov), Dünya Bankının maliyyə dəstəyi ilə Təhsil Nazirliyində həyata keçirilən Layihələrin Əlaqələndirmə Qrupu (E.Rüstəmov), Bakı Pedaqoji Kadrların İxtisasartırma və Yenidənhazırlanma İnstitutuna (A.Zamanov) tapşırılsın ki, sınaq qiymətləndirmənin nəticələri əsasında ümumi təhsil üzrə fənn kurikulumlarının və ixtisasartırma təhsili proqramlarının təkmilləşdirilməsi, müəllim hazırlığı proqramlarının yeniləşdirilməsi üzrə təkliflər hazırlayıb təqdim etsinlər.

4. Bakı şəhərində yerləşən dövlət ümumi təhsil müəssisələrinin rəhbərlərinə tapşırılsın ki, müəyyənləşdirilmiş vaxtda müəllimlərin sınaq qiymətləndirmədə iştirakını təmin etsinlər.

5. İqtisadiyyat şöbəsi (R.Orucov) sınaq qiymətləndirmənin keçirilməsi ilə əlaqədar müvafiq maliyyə məsələlərinin həll olunmasını təmin etsin.

6. İnformasiya şöbəsi (E.Əliyev) əmrin "Azərbaycan müəllimi" qəzetində dərc edilməsini, aidiyyəti struktur qurum və bölmələrə çatdırılmasını və Nazirliyin internet saytında yerləşdirilməsini təmin etsin.

7. Əmrin icrasına nəzarət nazir müavininə (C.Bayramov) həvalə edilsin.

**Mikayıl CABBAROV,**
***Azərbaycan Respublikasının təhsil naziri***

***6 may 2014-cü il***

# Təhsil Nazirliyinin sektor müdiri Emin Əmrullayevlə müsahibə

**- Bakıda çalışan orta məktəb müəllimlərinin fəaliyyətinin sınaq qiymətləndirilməsi zərurəti nədən yaranmışdır?**

- Təhsil sistemində keyfiyyətin qaldırılmasına, ayrı-ayrı müəllimlərin peşəkar inkişafına dəstək olmaq üçün bu tip qiymətləndirmələrin aparılması normal praktikadır. Dünyanın bir çox ölkələrində belə qiymətləndirmələr milli və ya regional səviyyədə həyata keçirilir. Bakıda da belə bir sınaq qiymətləndirmənin keçirilməsinin əsas məqsədi müəllimlərlə bağlı mövcud vəziyyəti, onlar arasındakı fərqləri dəyərləndirmək, müəllimlərin əmək fəaliyyətinin motivasiyasını qaldırmaqdır.

Düşünürük ki, bu sınaq qiymətləndirmənin nəticəsi olaraq, Bakı şəhərində rayonlar, müxtəlif fənlər, müxtəlif yaş qrupları və b. faktorlara görə ayrı-ayrı keyfiyyət göstəricilərinə daha yaxından bələd olmaq mümkün olacaqdır. Bu, gələcəkdə nazirlik tərəfindən müxtəlif qərarların verilməsi, müəllimlərin daha yaxşı hazırlanması istiqamətində müəyyən tədbirlərin həyata keçirilməsi, həmçinin ixtisasartırma, müəllimlərin yenidənhazırlığı işinin təşkili baxımından zəruri olan layihədir.

**- Sınaq qiymətləndirmədə iştirak edəcək müəllimlər bu prosesə necə hazırlaşa biləcəklər?**

- Artıq imtahanın strukturu bəllidir. İmtahanda 40 sual ixtisas fənni, 20 sual metodika, 20 sual isə müəyyən kommunikativ qabiliyyətlərin ölçülməsi ilə bağlıdır. Düşünürəm ki, müəllimlərdən hər hansı hazırlıq tələb olunmur. Çünki bu suallar müəllimlərin gündəlik iş prinsipləri ilə bağlı olacaq. İxtisasla bağlı suallar daha çox kurikulumu əhatə edəcək. Suallar siniflər üzrə strukturlaşdırılacaq. Yəni müəllimin hansı sinifdə hansı keyfiyyətdə dərs demək imkanları da müəyyənləşdiriləcək. Çünki bəzi müəllimlər aşağı siniflərdə daha rahatlıqla yüksək səriştəlilik göstərirlər. Yuxarı siniflərdə dərs dedikdə isə, müəyyən mənada, çətinlik çəkirlər.

Sualların metodika ilə bağlı hissəsi isə müəllimlərin tədris zamanı tətbiq etdiyi müxtəlif metodlar, yeni fənn kurikulumları, yeni yanaşmalar, hər hansı fəal təlim, interaktiv təlim metodlarının tətbiqi məsələlərini əhatə edəcək. Müəllimlər bu suallarla tədrisi müasir standartlar əsasında nə dərəcədə qura bilmək qabiliyyətlərinin olduğunu göstərəcəklər. Sualların kommunikativ hissəsi müəllimlərin hazırkı emosional durumu, onların ünsiyyətqurma qabiliyyəti, sinifi idarəetmə, liderlik qabiliyyətlərini və s. ölçmək üçün aparılan bir sorğu olacaq.

Çox önəmli məsələlərdən biri budur ki, sınaq qiymətləndirmə attestasiya və imtahanla qarışdırılır. Ancaq bunlar fərqli məsələlərdir.

**- Sınaq qiymətləndirmə zamanı zəif nəticə göstərən müəllimlərin fəaliyyətindəki zəif məqamlar hansı formada aradan qaldırılacaq?**

- Təbii ki, hər bir qiymətləndirmə nəticəsində müəyyən boşluqlar aşkarlana bilər. Adətən, belə boşluqların, çatışmazlıqların aradan qaldırılması üçün hansısa fəaliyyət planı hazırlanır. Təbii ki, bu barədə nəticələr məlum olduqdan sonra daha ətraflı danışmaq olar. Amma ümumilikdə bir məsələ aydındır ki, sınaq qiymətləndirmə müəllimlərin ayrı-ayrı sahələr, mövzular, fənlər üzrə peşəkarlıq səviyyəsini ölçməyə imkan verəcəkdir. Önəmli olan məsələ isə məktəblərdə keyfiyyətli tədrisin təşkilidir. Biz hamımız bunu qəbul etməliyik ki, məktəbdə müəllim

zəif olarsa, tədrisin keyfiyyəti və təşkili vəziyyəti də aşağı olar. Bu zəif məqamlar müəyyən edildikdən sonra nazirlik tərəfindən bir sıra tədbirlər həyata keçiriləcək. Müəllimlərin fəaliyyətindəki boşluqları aradan qaldırmaq üçün təlimlər, yenidənhazırlanma, ixtisasartırma kursları təlimləri təşkil ediləcək və müəllimlər bu təlimlərə cəlb olunacaqlar.

**- Qiymətləndirmənin nəticələri nə qədər müddətə bilinəcək?**

- Qiymətləndirmə Bakıda müxtəlif zonalar, müxtəlif fənlər üzrə iyun ayı boyunca keçiriləcək. Qiymətləndirmə keçirildikdən, təxminən, 1 həftə - 10 gün sonra nəticələr bilinəcək.

**- Sınaq qiymətləndirmədə yüksək nəticə göstərən müəllimlərin fəaliyyəti hansı formada optimallaşdırılacaq?**

- Nazirlik tərəfindən çox yüksək peşəkarlıq səviyyəsinə malik müəllimlər üçün müəyyən həvəsləndirmə tədbirlərinin görülməsi, bu müəllimlərin daha çox dərs saatı ilə təmin edilməsi, dərs bölgüsünün aparılması zamanı göstərilən nəticələrin nəzərə alınması nəzərdə tutulur. Ancaq xüsusi qeyd edilməlidir ki, sınaq qiymətləndirmə müəllimləri cəzalandırmaq üçün keçirilmir. Bu, daha çox müəllimlərin mövcud peşəkarlıq səviyyəsini ölçmək, nazirliyin gözləntiləri ilə müəllimlərin mövcud vəziyyəti arasında olan fərqi müəyyən etmək, müəllimlərin fərqli peşəkar istiqamətini daha da sürətləndirmək üçündür.

**- Qiymətləndirmədə yüksək nəticə göstərən müəllimlər üçün həvəsləndirici tədbirlərin tətbiqinə gələn tədris ilindən başlanılacaq?**

- Bəli. Təbii ki, bu nəzərə alınacaq. Stimullaşdırıcı tədbirlər peşəkarlıq səviyyəsi yüksək olan müəllimlərin nazirlik tərəfindən müxtəlif layihələrə cəlb olunması, müəyyən qiymətləndirmə layihələrinin, dərsliklərin hazırlanması, ayrı-ayrı mövzularla bağlı metodiki məsələlərin həllində iştirakı, ümumiyyətlə, təhsil islahatlarının həyata keçirilməsində bu müəllimlərin ideyalarının, yanaşmalarının tətbiqi formasında ola bilər. Həmin müəllimləri nümunə kimi digər müəllimlərə göstərməklə keyfiyyət standartlarını da müəyyən etmək həvəsləndirmə metodlarından biri ola bilər.

**- Sınaq qiymətləndirmələrin keçirilməsi dövriliyi necə olacaq?**

- Bu qiymətləndirmələr hər il olmasa da, mütəmadi olaraq keçirilməlidir və keçirilməsi də nəzərdə tutulur. Çünki bu, həm də nazirliyin öz işini qiymətləndirməsi və həyata keçirilən tədbirlərin səmərəliliyini ölçmək baxımından çox önəmlidir.

**- Sınaq qiymətləndirmənin ilk ixtisas, orta ixtisas və ali təhsil müəssisələrində çalışan müəllimlər üçün keçiriləcəyi gözlənilirmi?**

- Hazırda bu qiymətləndirmə ümumtəhsil müəssisələri üçün keçirilir. Orta məktəblərdə bu qiymətləndirməni keçirmək nisbətən asandır, amma ali təhsil müəssisələrində fənlərin sayı 500-dən daha çox olduğundan onu praktiki olaraq keçirmək daha çətindir. Buna görə də hazırda bu məsələ nəzərdə tutulmur.

**- Sosial məzuniyyətdə olan və əmək qabiliyyətini itirən müəllimlər sınaq qiymətləndirmədə iştirak etməyəcəklər. Həmin müəllimlərin sonradan bu prosesdə iştirakı təmin ediləcəkmi?**

- Bu müəllimlərin qiymətləndirmədə iştirakı sosial, tibbi nöqteyi-nəzərdən mümkün deyil. Buna görə də bu amil nəzərə alınır. Həmin müəllimlər üçün bu istisna hallar aradan qalxdıqdan sonra onların da gələcəkdə qiymətləndirmələrdə iştirakı nəzərdə tutulur.

***<u>Təhsilin inkişafı üzrə Dövlət Strategiyası</u>***

# ƏNƏNƏVİ TƏHSİLDƏN "DÜŞÜNCƏ VƏ TƏFƏKKÜR MƏKTƏBİ"NƏ DOĞRU

**Qulu Novruzov**
***Təhsil Problemləri İnstitutunun direktoru, hüquq üzrə fəlsəfə doktoru***

**Ənvər Abbasov**
***Təhsil Problemləri İnstitutunun direktor müavini, pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *düşüncə məktəbi, təfəkkür məktəbi, inkişaf konsepsiyası, dövlət strategiyası, səriştə əsaslı standartlar, 12 illik ümumi təhsil, intellektual dərslik, yaradıcı müəllim.*

***Ключевые слова:*** *школа разума, школа мышления, концепция развития, Государственная Стратегия, стандарты на основе компетенций, 12-тилетнее общее образование, интеллектуальный учебник, творческинастроенный учитель.*

***Key words:*** *school of thought, cognitive schools, development conception, state strategy, standards competences, 12 year general education, intellectual text books, creative teacher.*

Qloballaşan dünyada informasiyaların çoxaldığı, texnologiyaların gücləndiyi bir zamanda cəmiyyətin inkişaf tendensiyalarına münasibət də dəyişir. İnformatlaşma prosesinin getdiyi bir mühitdə fəaliyyət göstərmək, tolerant olmaq, informasiya cəmiyyətinin fəal üzvünə çevrilmək, kommunikativ bacarıqlara yiyələnmək, ən başlıcası, təfəkkür mədəniyyətinə sahib olmaq, kreativ keyfiyyətləri əxz eləmək müasir dünyanın hər nəfəri üçün həyati tələbata çevrilir. Ona görə də sosial fenomen olan təhsil insanların həyatının ayrılmaz bir hissəsi kimi onların ehtiyaclarına uyğun qurulmaqla yeni bir müstəvidə formalaşmağa başlayır. İndi elə bir ölkə yoxdur ki, orada təhsilin inkişafına fikir verilməsin, onun həyati tələbat kimi daimi yeniləşməsi istiqamətində tədbirlər həyata keçirilməsin. Təhsil özünün humanist və humanitar missiyasını insanlara daimi xidmət göstərmək və onların inkişafı naminə özünü yeniləşdirməklə yerinə yetirir.

Bu gün təhsildə baş verən dəyişikliklər qlobal dünyanın ümumi tələbatından irəli gəlməklə yanaşı, müstəqil respublika kimi Azərbaycanın inkişafyönümlü fəaliyyətinin nəticəsi olaraq meydana çıxır. Əldə olunmuş nailiyyətlər ölkədə aparılmış sosial-iqtisadi sahədə siyasətin məqsədəuyğun şəkildə həyata keçirildiyini aydın göstərir. "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasında qeyd olunduğu kimi, "Son illərdə nəzərə çarpan nailiyyətlərin əldə olunması da bilavasitə ölkəmizin modernləşdirilməsinə istiqamətlənmiş sosial-iqtisadi siyasətlə bağlıdır" (2). Respublikamızın müstəqillik

illərində bütün sahələrə aid fəaliyyətlərin təhlilinə, eləcə də inkişaf perspektivlərinə həsr olunmuş bu sənəddə təhsil sisteminə də münasibət bildirilir, onun irəliləyişlər əldə etdiyi göstərilir. Qeyd olunur ki, "Təhsilin məzmunca yeniləşməsinə istiqamətlənmiş islahatlar aparılmış, Azərbaycan təhsilinin Avropa təhsil məkanına inteqrasiyası istiqamətində əhəmiyyətli addımlar atılmışdır"(2).

Lakin bütün bunlar qlobal dünyanın inkişaf sürəti baxımından, eləcə də cəmiyyətin mühüm göstəricisi olan əmək bazarının tələblərinə uyğun olaraq yenidən nəzərdən keçirilməli, zəruri boşluqlar aradan qaldırılmalıdır. Bu mənada Respublika Prezidenti İlham Əliyevin 2013-cü il oktyabrın 24-də təsdiq etdiyi "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" ölkəmizdə yeni təhsil sisteminin qurulması və bu məqsədlə təhsil islahatlarının uğurla davam etdirilməsi baxımından sosial-iqtisadi əhəmiyyətli sənəd kimi dəyərləndirilir, orada təhsilin bütün pillələri ilə yanaşı, şəxsiyyətin formalaşmasını bir vəzifə kimi qarşıya qoyan ümumi təhsilin yeni müstəvidə inkişaf istiqamətləri müəyyənləşdirilir.

12 illik ümumi təhsil

Dünyanın təhsil təcrübəsi göstərir ki, ümumi təhsil quruculuğunda onun müddətinin müəyyən olunması xüsusi əhəmiyyət daşıyan problemlərdən biri hesab edilir. Ona görə də ümumi təhsilin müddəti müxtəlif ölkələrdə müxtəlif cür müəyyənləşdirilir.

Bu, o deməkdir ki, ümumi təhsilin müddətinin konkret olaraq müəyyənləşdirilməsi spesifik xarakter daşıyır və yerli şəraitə uyğunlaşdırılır. Burada yerli şəraitin xüsusiyyətləri, araşdırmaların nəticələri əsas götürülür. Azərbaycanda da ümumi təhsilin müddətinə ayrı-ayrı zamanlarda müxtəlif yanaşmalar olmuşdur: onun bir vaxtlar 10, sonralar 11 illik sistemləri tətbiq olunmuş və bu gün də 11 illik sistemdən istifadə edilməkdədir. Dövlət Strategiyasında göstərildiyi kimi, Azərbaycan ümumi təhsili 12 illik sistemə keçidin astanasındadır. "10 illik icbari ümumi orta təhsil və 2 illik tam orta təhsil modelinə mərhələli şəkildə keçidi təmin etməklə, 12 illik ümumi təhsil sisteminin yaradılması"(3) strateji tədbirlərdən biri kimi nəzərdə tutulmuşdur. Təbii ki, burada başlıca missiya ümumi təhsilin koqnitiv (idraki) xarakterini gücləndirməkdən, digər pillələrlə yanaşı, onun da beynəlxalq təcrübəyə uyğunlaşdırılmasından ibarət olacaqdır. Bu zaman başlıca şərt kimi ölkəmizdəki təhsil şəraiti, vəziyyət əsas götürüləcəkdir.

Dövlət Strategiyasında "məktəbə hazırlıq təhsilinin (1 il) icbariliyinin təmin olunması"(3) müasir zamanda yeni yanaşma tərzi kimi özünəməxsus mahiyyət və məzmun daşıyır. Ümumi icbari təhsil qurularkən onun nəzərə alınması mühüm bir vəzifə kimi meydana çıxır. İcbari təhsilin müddətinin 1 il uzadılması şagird şəxsiyyətinin formalaşdırılmasında, davamlı təhsil üçün zəruri bünövrənin qoyulmasında xüsusi əhəmiyyəti olan amil kimi çıxış edir.

Ümumi təhsilin "tam orta təhsil səviyyəsində təhsil müəssisələrinin müxtəlif istiqamətlər üzrə bölünməsi" (3) də strateji tədbirlərdən biri kimi nəzərdə tutulur. Fikrimizcə, burada humanitar ↔ təbiət-riyaziyyat ↔ incəsənət, yaxud humanitar ↔ təbiət ↔ riyaziyyat ↔ incəsənət istiqamətlərində struktur komponentlərindən istifadə etmək mümkündür. Bütün hallarda tam orta təhsil özündən əvvəlki səviyyə ilə müqayisədə diferensial olması, fundamental xarakter daşıması ilə fərqlənir. Cəmiyyətin ali təhsil almaq məqsədindən irəli gələn maraqlarını təmin edir. Belə olduğu təqdirdə, müasir dövrümüz üçün az qala ümumi təhsilə alternativ kimi yaranmış repetitorluq tədricən zəifləyərək sıradan çıxa bilər.

12 illik təhsil sisteminin yaradılmasında onun infrastrukturunun müəyyənləşdirilməsi vacib şərt hesab edilir. Səmərəli infrastrukturun qurulmasında ölkənin sosial-coğrafi şəraitinə uyğun məktəb şəbəkəsinin, eləcə də müvafiq normaların, standartların, praktik əhəmiyyət daşıyan prosedur qaydaların hazırlanması faydalı hesab edilir. Yeni infrastruktur müvafiq maddi-texniki, tədris bazasının yaradılmasını mühüm şərt kimi qarşıya qoyur. Təcrübələr onu göstərir ki, 12 illik təhsil üçün yeni infrastrukturun məqsədyönlü formalaşdırılması qabaqlayıcı sosial-pedaqoji tədbirlərin hazırlanmasını və həyata keçirilməsini tələb edir.

Səriştə əsaslı standartlar.

Dünyanın təhsil tarixində məktəblər həmişə humanist bir missiya daşımışdır. Onlar insanı formalaşdırmaq, inkişaf etdirmək kimi müqəddəs bir vəzifəyə qulluq etmişdir. Zaman-zaman cəmiyyətin ehtiyacları dəyişdikcə məktəblərə olan tələblər də yeniləşmiş, başqa mahiyyət kəsb etmişdir. Uzun illər hafizə məktəbi insanların xidmətində olmuş, əsrlər boyu onların inkişafını şərtləndirmişdir. Yaddaş məktəbinin mahiyyətində akademik biliklər vermək, şagirdləri öyrəndiklərinin həcminə görə dəyərləndirmək üstün yer tutmuşdur. Bu gün sosial mühit dəyişmiş, insanların düşüncə, idrak bacarıqlarına, yaradıcılıq qabiliyyətlərinə ehtiyac yaranmışdır. Aparılmış psixopedaqoji araşdırmalarda da bu problemlə bağlı müasir dövr üçün diaqnostik əhəmiyyət daşıyan nəticələrə gəlinmişdir. Belə ki, müasir dövrdə məktəbin, bütövlükdə təhsilin funksiyası dəyişir. Bu gün “şagirdlərin əqli inkişafı məktəbin başlıca sosial funksiyalarından biri kimi qiymətləndirilir” (4,9). “Müasir təhsil konsepsiyası ənənəvi didaktik sistemdən fərqli olaraq koqnitiv strukturların inkişafı problemini sadəcə olaraq hafizə məkanında deyil, yeni psixoloji məkanda – təfəkkür və hiss məkanında həll edir” (5, 263).

Müasir məktəbin şagirdlərinin nailiyyəti kreativ bacarıqlarının səviyyəsi ilə ölçülür. Onların məntiqi, tənqidi, yaradıcı təfəkkürünün formalaşması inkişafyönümlülüyün mühüm atributu kimi çıxış edir. Qlobal dünyanın inkişaf etmiş ölkələrindən biri kimi Azərbaycanın məktəblərində bu keyfiyyətlərin olması məntiqəuyğun bir zərurət kimi özünü büruzə verir. Bu səbəbdən də “Azərbaycan 2020: gələcəyə baxış” İnkişaf Konsepsiyasında konseptual olaraq gələcəyin ümumtəhsil məktəbi barədə proqnostik müddəa irəli sürülür və onun həyata keçirilməsi üçün tədbirlər nəzərdə tutulur. “Şagirdlərin idrak fəallığını, ümumi inkişafını ləngidən mövcud yaddaş məktəbindən, “təfəkkür və düşüncə məktəbi”nə keçidin təmin olunması məqsədilə sistemli tədbirlər görüləcəkdir”(2).

Bu müddəa “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda müəyyən olunmuş beş strateji istiqamətin hər birinə şamil edilir. İstər təhsilin məzmununun yaradılmasında, yüksəknüfuzlu təhsilverənlərin yeni idarəetmə sisteminin formalaşmasında, istərsə də müasir tələblərə cavab verən təhsil infrastrukturunun və yeni maliyyə mexanizmlərinin hazırlanmasında təfəkkür və düşüncə məktəbinə keçidin izlənilməsi diqqətdə saxlanılır.

Məlum olduğu kimi, artıq 2006-cı ildən ölkəmizdə Milli Kurikulum yaradılmış, onun ardınca fənn kurikulumları hazırlanaraq məktəblərimizin istifadəsinə verilmişdir. Eyni zamanda pedaqoji anlayış kimi təhsil kurikulumları barədə ümumi konseptual fikir formalaşmışdır. Bu fikirlər Təhsil Qanununda belə ifadə edilmişdir: “Təhsil Proqramı (kurikulum) – təhsilin hər bir pilləsi üzrə təlim nəticələri və məzmun standartlarını, tədris fənlərini, həftəlik dərs və

dərsdənkənar məşğələ saatlarının miqdarını, pedaqoji prosesin təşkili, təlim nəticələrinin qiymətləndirilməsi və monitorinqinin aparılması sistemini özündə əks etdirən dövlət sənədi"dir (1,8). Azərbaycanda qəbul olunmuş mövcud kurikulum modelinə təhsilin məzmunu (standartlar), strategiyalar (pedaqoji texnologiyalar), qiymətləndirmə mexanizmləri daxil edilmişdir.

Dövlət Konsepsiyasında kurikulumlara pedaqoji anlayış kimi müraciət olunmuş, həyata keçiriləcək birinci strateji istiqamətin hədəfi kimi təhsilin bütün pillələri üzrə, o cümlədən ümumi təhsil üzrə kurikulumların inkişaf etdirilməsi qeyd edilmişdir. Bu gün ölkəmizdə yalnız məktəbəqədər və ümumi təhsil pillələrində inkişaf etmiş dünya ölkələrinin kurikulumlarına uyğun kurikulumların hazırlanması təcrübəsi vardır. Digər təhsil pillələrində də belə kurikulumların hazırlanması ciddi pedaqoji problem kimi həllini gözləyir.

Dövlət Strategiyasında strateji hədəflərdən birində "səriştə əsaslı ümumi təhsil standartları və kurikulumlarının hazırlanması" vurğulanır. Bu müddəada standart və kurikulumların ayrıca ifadə olunması, artıq kurikulum anlayışına bir sıra xarici ölkələrdəki kimi, yeni yanaşma tərzinin formalaşdığını göstərir. Standartların kurikulumların strukturundan çıxarılaraq təkmilləşdirilməsi və ayrıca təqdim olunması zərurətini meydana qoyur. Hər halda standartlara ayrıca obyekt kimi yanaşılması onun kurikulumlarla əlaqəsini inkar etmir. Əksinə, onlar arasında bağlılığa daha çox diqqət yetirildiyini qabarıqlaşdırır.

Qlobal dünyada təhsilə qoyulan ümumi tələblərdən biri də onun standartlaşdırılmasıdır. Bu, formalaşan və inkişaf edən şagird şəxsiyyətinin ardıcıl olaraq müşahidə edilməsi və istiqamətləndirilməsi baxımından əhəmiyyət daşıyan bir prosesdir. Artıq ötən əsrin 70-ci illərindən başlayaraq genişlənən bu sosial proses hazırda daha geniş vüsət almaqla ölkəmizin təhsil həyatında da tətbiq olunmaqdadır. Təcrübələr göstərir ki, yaranmaqda olan təfəkkür məktəbinin inkişaf etdirilməsi məhz bu amillə daha çox bağlıdır. Şagirdin deklorativ biliklər qazanmasından yaradıcı fəaliyyətdə təzahür edən qabilliyyətlərinə qədərki inkişaf yolunda hər səviyyənin müşahidə edilməsi məhz standartlara əsaslanmaqla mümkündür. Bu mənada təhsil standartları şagirdlərin inkişafına yönələn və bu inkişafın ardıcıl şəkildə müşahidə olunmasına imkan yaradan bir alət kimi çıxış edir. Təhsil standartları həm məzmuna, fəaliyyətə, həm də nailiyyətə aid olmaqla müxtəlif növdə təsnif olunur. Ölkəmizin Təhsil Qanununda qeyd olunur ki, "Dövlət təhsil standartları təhsilin məzmununu, idarə olunmasını, maddi-texniki və tədris bazasını, infrastrukturunu, təhsilverənlərin keyfiyyət göstəricilərini, hər bir təhsil pilləsində təhsilalanların bilik, bacarıq və vərdişlərinin səviyyəsini müəyyənləşdirir" (1,14). Bu standartlar müəyyən dövrdə sabit qalmaqla sosial-pedaqoji əhəmiyyət daşıyır. Təhsil fəaliyyəti ilə məşğul olanların işinin nizamlanmasında özünün idarəetmə funksiyası ilə çıxış edir. İstər təhsil səviyyəsi, istərsə də ayrı-ayrı fənlər üçün müəyyən olunmuş bu standartlarda şagirdlərin sadəcə əldə edəcəkləri bilik və bacarıqlar deyil, onların şəxsiyyətini keyfiyyət cəhətdən müəyyən edən qabiliyyətlər ifadə olunur. Bunlar artıq müasir təhsil məkanında səriştələr (kompetensiyalar) kimi geniş şəkildə işlənməkdədir. Bu səriştələr şagirdlərdə idraki, hissi-emosional və psixomotor bacarıqlar əsasında formalaşır. Dövlət Strategiyasında Azərbaycan məktəblərinə bu baxımdan münasibət bildirilməklə, ilk növbədə, onun məzmununun səriştələrə əsaslanmaqla qurulmasının vacibliyi qeyd olunur. Göstərilir ki, "Son 30-

40 il ərzində elmi-pedaqoji tərəqqi, innovasiyalar və modernləşdirmə nəticəsində praktik bilik və vərdişlərlə zənginləşməyən, sırf nəzəri xarakter daşıyan təhsil öz fundamental əhəmiyyətini itirməkdədir. Bu baxımdan təhsilin məzmununun formalaşmasında akademik biliklərlə yanaşı, praktik bilik və bacarıqların, səriştənin vacibliyi önə çəkilir. Səriştə əldə edilmiş bilik və bacarıqları praktik fəaliyyətdə effektiv və səmərəli tətbiq etmək qabiliyyətidir. O, şəxsin qazandığı bilik və bacarıqların konkret fəaliyyətinin nəticəsinə çevrilməsini təmin edir" (3).

Bütün bunlar isə o deməkdir ki, yeni yaranan təfəkkür məktəbi şagirdlərin səriştəlilik səviyyəsini yüksəltməklə onlarda idraki qabiliyyətlər, hissi-emosional, psixomotor keyfiyyətlər formalaşdırmağı qarşıya ciddi vəzifə kimi qoyur. Bununla yanaşı, şagirdlərin yaşamağa, yaratmağa, kreativ fəaliyyətlə məşğul olmağa marağını artırır. Odur ki, Dövlət Strategiyasında "Səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsil məzmununun yaradılması"(3) müəyyən edilmiş istiqamətlərdən biri kimi qeyd olunur.

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, Respublikamızda 1999-cu ildən başlanan təhsil islahatlarında şagird şəxsiyyətinin formalaşmasına yönəlmiş, onların mənafeyinə uyğun, milli və bəşəri dəyərlər əsasında yeni təhsil sisteminin yaradılmasına başlanılmış və bu sahədə xeyli təcrübə əldə edilmişdir. Ümumi təhsildə Milli və fənlər üzrə standart və kurikulumların istifadədə olan nümunələri fikrimizi əsaslandırmaq baxımından xüsusi əhəmiyyət daşıyır. Milli səviyyədə müəyyənləşdirilmiş ümumi nəticələr mahiyyət və məzmununa görə şagirdə yönəlməklə bu gün daha çox aktuallıq kəsb edən səriştələrdir. Artıq həmin səriştələrin hazırlanmasından xeyli vaxt keçir. Yeni təsdiq olunmuş Dövlət Strategiyasında həmin səriştələrin hazırkı dövr baxımından nəzərdən keçirilməsini, onların 12 illik ümumtəhsil məktəbinin strukturuna uyğun olaraq təkmilləşdirilməsini tələb edir. Azərbaycanda minimum standartların hazırlanması dövlət siyasəti kimi həyata keçirilir. Tam orta təhsil pilləsində təlimin istiqamətlər üzrə qurulması istər-istəməz həmin səviyyəyə aid standartların hazırlanması tələbini qarşıya qoyur. Bu gün X-XI siniflər üçün konkret istiqamətlərin müəyyən olunması, heç şübhəsiz, onların məzmununun hazırlanmasını stimullaşdıracaqdır. Həmin siniflərdə zəruri fənlərə aid və istiqamətlər üzrə səriştələrin, minimum standartların hazırlanması həyata keçəcəkdir.

Respublikamızda təhsilin əsas məqsədi "Azərbaycan dövləti qarşısında öz məsuliyyətini dərk edən, xalqının milli ənənələrinə və demokratiya prinsiplərinə, insan hüquqları və azadlıqlarına hörmət edən, vətənpərvərlik və azərbaycançılıq ideyalarına sadiq olan, müstəqil və yaradıcı düşünən vətəndaş və şəxsiyyət yetişdirmək"dən ibarətdir (1,8). Ümumi təhsil bu məqsədin həyata keçirilməsi üçün üzərinə düşən missiyanı yerinə yetirir. Şagirdlərin ümumi təhsil üzrə zəruri bilik, bacarıq və vərdişlərə, eləcə də qabiliyyətlərə yiyələnmələrinə şərait yaradır. Bütövlükdə təhsil prosesinin şagird şəxsiyyətinə yönəlməsini təmin edir. İlk növbədə, bütün təhsil standartlarında şagirdlərin səviyyələr üzrə inkişafına qoyulan tələblər konkret olaraq öz ifadəsini tapır. Bu tələblər şagirdlərin bir şəxsiyyət kimi həm əqli və kommunikativ, həm də fiziki cəhətdən inkişafını əhatə edir.

İlkin təcrübələr onu göstərir ki, ümumtəhsil fənlərinin müəyyən olunması təsadüfi, yaxud ənənələrə əsaslanmaqla seçilməməlidir. Burada sosial şərait, müasir dünyanın inkişaf səviyyəsi, cəmiyyətin tələbatları, ən başlıcası əmək bazarının ehtiyacları nəzərə alınmalı, şəxsiyyətin ayrı-ayrı keyfiyyətləri ilə bağlı bacarıqlarının formalaşmasında la-

zım olan zəruri bilik, bacarıq və vərdişlərə yer ayrılmalıdır. Bu mənada hər bir fənn müəyyən olunarkən onlara bir vasitə kimi yanaşılmalı, məzmun komponentlərinin inkişafetdirici xarakterdə olması diqqət mərkəzində saxlanılmalıdır.

Yeni dərsliklərin yaradılması.

Dövlət Strategiyasında yeni dərsliklərin yaradılmasına və tətbiq olunmasına səriştəyə əsaslanan şəxsiyyətyönümlü məzmunun yaradılmasının mühüm istiqamətlərindən biri kimi yanaşılır. Ona görə də ümumi təhsillə bağlı müddəalardan birində "Kurikulumlara əsaslanan yeni dərsliklərin yaradılması, şagird və müəllimlərin mövcud dərslik sistemi ilə təmin olunması"(3) fəaliyyət strategiyasında başlıca vəzifələrdən biri kimi qeyd edilir. Təhsil tarixi boyu dərsliklərin yaradılması həmişə ciddi pedaqoji problem kimi maraq doğurub, təhsilin məzmununu ifadə edən komponentlərdən biri kimi dəyərləndirilib. Zaman keçdikcə yeniləşməsinə ehtiyac duyulan mühüm pedaqoji obyektlərdən birinə çevrilib.

Bu gün də təfəkkür məktəbinin astanasında dayandığımız bir məqamda dərslik probleminin həll olunması son dərəcə vacib olan bir məsələ kimi meydana çıxıb. Nəzərə alsaq ki, müstəqil Azərbaycanda ümumtəhsil məktəbləri üçün dərsliklərin yaradılması sahəsində vahid dövlət siyasəti həyata keçirilir (2005-ci ildə "Ümumi təhsil sistemində dərslik siyasəti" sənədi təsdiq olunmuşdur), eyni zamanda ölkədə dərsliklərin yaradılması sahəsində tarixi ənənələrə söykənən təcrübə vardır. Bundan əlavə, son dövrlərdə yeni təhsil proqramlarına əsasən müasir dərsliklərin hazırlanması istiqamətində xeyli emprik araşdırmalar aparılmış və nümunələr hazırlanmışdır. Bu, ötən islahatçılıq fəaliyyətində təhsilin məzmununun yaradılması baxımından əldə olunmuş nəticələrdən xəbər verir. Lakin dünyanın həyati bacarıqlarla zəngin intellektual təhsil sisteminin formalaşdığı bir zamanda bünövrəsini qoyduğumuz təfəkkür məktəbinin dərslikləri tamamilə yeni prinsiplərlə qurulmalı, informasiyaların, onun vasitələrinin bolluğu şəraitində özünün maraq effekti ilə fərqlənməli və şagirdin ən yaxın dostuna, müsahibinə çevrilməlidir. Təlim materiallarının ən zərurilərinin seçilməsində, şagirdlərin axtarıcılıq, müqayisə, ümumiləşdirmə, sistemləşdirmə, tətbiqetmə yaradıcılıq bacarıqlarının stimullaşdırılmasında şagirdlər üçün ən doğma olan bir kitaba çevrilməlidir. Dərslik nəticələrə doğru gedən yolda müəllimin bələdçilik fəaliyyətini tamamladığından onun potensial imkanları səviyyəsində qiymət alır. Bu isə istər-istəməz mahiyyət etibarı ilə ölkə üçün konseptual olan bir vəsaitə bəzi subyektiv yanaşılmaların əmələ gəlməsi ilə nəticələnir.

Şagirdlərin bir vətəndaş, şəxsiyyət kimi formalaşmasında əhəmiyyətli rol oynayan dərsliklərin yaradılması onu hazırlayanların səriştəliliyini, fənn standartları ilə işləyə bilmələrini, müasir təhsil təcrübələrinə və texnologiyalarına dair bacarıqlara malik olmalarını zəruri tələb kimi irəli sürür.

Bu gün dünyanın intellektual təhsil aləmində istifadə olunan müasir dərsliklərin öyrənilməsinə, Azərbaycan şəraitində istifadə oluna bilən, təfəkkür məktəbinin ehtiyac və tələbatlarına cavab verə bilən dərsliklərin elmi-pedaqoji əsaslarının araşdırılmasına ehtiyac vardır. Bu yanaşma tərzi həm dərsliklərin yaradılmasına, ondan istifadə olunmasına, həm də dərsliklər barəsində fikir mübadilələrinin müəyyən elmi-pedaqoji əsasda aparılmasına şərait yarada bilər.

Müasir dərsliklər təhsil standartlarının reallaşdırılmasında aparıcı rol oynayan texnoloji vasitələrdən biridir. Onun ölkə üçün konseptual xarakterdə hazırlanması və istiqamətverici funksiya daşıması müəllimlərin sərbəst və yaradıcı fəaliyyətinə imkan yara-

dır. Bu mənada müəllimlərdən yeni kurikulum və dərsliklərlə işləmək üçün xüsusi bacarıqlar tələb olunur.

Yaradıcı müəllim amili.

Müəllim həmişə olduğu kimi, bu gün də məktəbdə əsas sima hesab olunur. Onun fəaliyyəti övladlarımızın təlim və tərbiyəsinə xidmət göstərməklə müqəddəslik missiyası daşıyır. Təhsil alan hər kəs özünün gələcəyini müəllimində axtarır. Bu mənada bəşəriyyətin tarixi boyu müəllimin cəmiyyətdə oynadığı rol dəyişmir. Lakin dövr yeniləşdikcə onun funksiyalarına tələblər dəyişir. Qloballaşan dünyada təfəkkür məktəbinin müəllimi necə olmalıdır? Etiraf etmək lazımdır ki, təhsil islahatlarının həyata keçirildiyi müasir zamanda özünün yenilikçi fəaliyyəti, müasir təhsil texnologiyalarına yiyələnmələri ilə seçilən, müəllim müsabiqələrinin iştirakçısı olan, tədris resurslarının hazırlanmasında iştirak edən xeyli müəllimlər vardır. Onlar bizim dünənimizlə bu günümüzü, eləcə də sabahımızı uğurla əlaqələndirən, nəsillərin estafetinin ötürülməsində fəal iştirak edən müəllim kadrları kimi fəxarət yerimizdir. Lakin bu gün ölkəmizdə müəllim kadrlarına olan ehtiyacın ödənilməsi ilə bağlı həyata keçirilən tədbirlər, xüsusilə bu il Respublika üzrə 3286 vakant yer üçün verilmiş elana əsasən 18782 sənədin təqdim olunması, müsabiqədə əlavə yerləşdirmə ilə birlikdə 1474 nəfərin keçməsi pedaqoji kadr hazırlığında müəyyən problemlərin olduğunu diqtə edir. Belə ki, pedaqoji təhsilini yenicə başa vurub müəllimlik fəaliyyətinə başlayan gənc müəllimlər yeni təhsil mexanizmləri ilə işləməkdə çətinlik çəkirlər. İlkin araşdırmalar onu göstərir ki, onlar bakalavriat və magistratura səviyyələrində yeni təhsil texnologiyalarına yiyələnə bilmirlər. Bu da ondan irəli gəlir ki, Təhsil İslahatına başlanmasından on dörd ilə yaxın bir vaxt keçməsinə baxmayaraq, müəllimlik peşəsini öyrədən pedaqoji təhsil müəssisələrinin pedaqogika və metodika kafedralarında ənənəvi məzmun və texnologiyalar hələ də qalmaqda davam edir. Bununla yanaşı, Dövlət Strategiyasında qeyd olunduğu kimi, "Səriştəyə əsaslanmayan, əmək hazırlığında yetərincə rəqabətli olmayan əməkhaqqı sistemi və maddi stimullaşdırma mexanizmlərinin adekvat olmaması təhsildə müəllim amilinin inkişafına mənfi təsir göstərmişdir... Əksər müəllimlərin tədris prosesində tətbiq etdiyi metodlar müasir tələblərdən geri qalır. Bir çox hallarda təhsilalanlara əldə etdiyi bilikləri tətbiq etmək və müstəqil yaradıcı düşünmə qabiliyyətləri aşılanmır" (3).

Şagirdlər təlim prosesində nə zaman müəllimlərinə qulaq asmırlar? Dərs nə vaxt uşaqları darıxdırır, cansıxıcı olur? Professor Ə.Əlizadə özünün psixopedaqoji araşdırmalarında belə qənaətə gəlmişdir ki, "Dərsin maraqlı olmaması, şagirdin dərslə maraqlanmaması məktəb üçün özünəməxsus Bermud üçbucağıdır. Bu üçbucağın təsir dairəsində məktəb çox şey itirir. Sinifdə intizamsızlıq halları da bu kökdə əmələ gəlir, təlimdə geridə qalma halları da..." (4,168). Əslində belə bir vəziyyətin yaranması müəllim fəaliyyətindən qaynaqlanır. Müəllim özünün qeyri-peşəkar, səriştəsiz yanaşmaları ilə belə bir halın əmələ gəlməsini stimullaşdırır, ona rəvac verir. Müşahidə və təcrübələr göstərir ki, səriştəli müəllim pedaqoji prosesin çətinlik simptomunu asanlıqla aradan qaldıra və maraq effekti yarada bilir. Bununla o, şagirdlərin ürəyini fəth edir və məhəbbə-tini qazanır. Dünyanın qabaqcıl təhsil təcrübəsi göstərir ki, təlim-tərbiyə sahəsində nailiyyətlərin əldə olunması, ilk növbədə, müəllimin təhsilindən, yüksək peşəkarlığından asılıdır. Məşhur təhsilşünas Pasi Salberq özünün "Fin dərsləri: Dünya Finlandiyadakı təhsil dəyişikliklərindən nə öyrənə bilər" adlı kitabında Finlandiyadakı təhsil uğurlarının

səbəblərini izah edərkən belə qərara gəlir ki, "Əla müəllimlər və müasir müəllim təhsili olmadan bugünkü nailiyyətlərə çatmaq qeyri-mümkün idi".

Təfəkkür məktəbinin müəllimi tədqiqatçılığı ilə seçilməli, özünün pedaqoji fəaliyyətinə yaradıcı bir peşə adamı kimi yanaşmalıdır. Bütün mövcud resurslara, strategiyalara yaradıcı münasibət bəsləməli, hər bir addımda özünün şəraitə uyğun hazırladığı metodik mikrosistemlərindən istifadə etməlidir. Fəaliyyətinin layihələşdirilməsindən başlamış uğurlarının qiymətləndirilməsinə qədərki mərhələlərdə müəllimin yaradıcı fəaliyyəti aydın şəkildə görünməlidir. O, şagirdlərinin həyata, davamlı təhsilə hazırlanmasında, bir şəxsiyyət kimi dəyərlərə yiyələnməsində həlledici rolu ilə seçilməlidir. Yaxşı müəllimin əməkhaqqı fəaliyyətinə rəğmən müəyyənləşdirilməklə stimullaşdırıcı vasitəyə çevrilməli, onu növbəti uğurlara sövq etməlidir. Müəllimin əməkhaqqı həftəlik dərs saatlarına görə müəyyənləşsə də, bütövlükdə onun fəaliyyəti daha genişdir. Belə ki, o bəzən bir saat dərs üçün bir neçə saat hazırlaşmalı, məktəb pedaqoji, metodik mühitində fəaliyyət göstərməli olur. Bunlar müəllimin əməkhaqqını fərdi qaydada dəyərləndirməklə stimullaşdırılmasını tələb edir.

İdarəolunmanın yeni xarakteri.

Tarix boyu uzun illər yaşayıb inkişaf etmiş Azərbaycan məktəbi zaman-zaman özünün töhfələrini vermiş və böyük uğurlar qazanmışdır. Lakin bu gün çevik və dərin düşüncə, möhkəm bacarıqların tələb olunduğu müasir dünyada məktəb və təhsilə də tələblər dəyişmişdir. "Məktəb məkanında idrak (psixi) prosesləri konsepsiyasının əsas paradiqmaları inkişafetdirici və tərbiyəedici təlim prinsipləri ilə bağlıdır. Bu iki önəmli prinsipin qovşağında isə müasir məktəb özünün ən başlıca missiyasını yerinə yetirir" (5,4). Bu missiya isə öz növbəsində məktəbdə funksional dəyişikliklərin olmasını, düşüncə və təfəkkür məktəbi kimi yeni xarakter almasını tələb edir. Məktəbin istər maliyyələşmə və idarəetmə, istərsə də tədris-metodik sistemlərinin yeni prinsiplər əsasında qurulmasını zəruri vəzifə kimi qarşıya qoyur. Eyni zamanda, təhsil müəssisələrinin idarəetmə səlahiyyətlərinin və təhsilin nəticələrinə görə cavabdehliyinin artırılması, fəaliyyətin monitorinqi və qiymətləndirilməsi, təhsilin keyfiyyətini ölçən göstəricilər sisteminin təkmilləşdirilməsi, təhsilin maliyyələşdirilməsinin onun keyfiyyətinə yönəldilməsi, adambaşına maliyyələşdirmə mexanizminin tətbiqi və bu zəmində stimullaşdırıcı mexanizmlərin gücləndirilməsi və s. istiqamətlərdə islahatların aparılmasının vacibliyini meydana çıxarır.

Bu islahatlar məktəbə rəhbərlik və onun idarə olunmasının demokratikləşdirmə, humanistləşdirmə və humanitarlaşdırma prinsipləri əsasında yenidən qurulmasına təminat verəcək, onun düşüncə və təfəkkür məktəbi kimi inkişafını stimullaşdıracaqdır.

Dövlət Strategiyasından irəli gələn bu vəzifələr həm də ümumtəhsil məktəblərini idarə edən təhsil şöbələrinin yenidən qurulmasını, onların fəaliyyətinin məktəblərlə, ümumiyyətlə, təhsil müəssisələri ilə hesabatlılıq və inkişafın monitorinqi prinsipləri əsasında müasir idarəetmə mexanizmləri əsasında qurulmasını zəruri tələb kimi irəli sürür. Xüsusən bu gün özünü doğrultmayan metodik sistemin, o cümlədən metodkabinetlərin yenidən qurulmasını mühüm vəzifə kimi qarşıya qoyur.

Valideyn-məktəb əlaqəsi.

Yeni təhsil sisteminin qurulması, onun uğurla təşkil edilməsi və həyata keçirilməsində maraqlı olan tərəflərin əlaqələrinin yeni məzmunda qurulmasını tələb edir. Bu, müasir zamanda ümumi təhsilin başlıca fəl-

səfəsini təşkil edən mühüm məsələlərdən biri kimi şəxsiyyətin yetişdirilməsi, davamlı təhsilə hazırlanması missiyasından irəli gəlir. Müəllim belə bir fəaliyyətin həyata keçirilməsində özünün istiqamətverici, əlaqələndirici rolunu yerinə yetirməklə yanaşı, şagirdlərin öyrənmək, tədqiqat aparmaq, yaratmaq, təqdimatlar etmək kimi fəaliyyətlərini stimullaşdırır.

Bu prosesin keyfiyyət baxımından ağırlığı orada maraqlı olan üçüncü tərəfin olmasını tələb edir. Həmin üçüncü tərəf valideynlərdir. Əslində "məktəb-valideyn", yaxud "valideyn-məktəb" əlaqələri mahiyyət etibarilə yeni məsələ deyildir. Lakin bu gün valideynin uşağın davamlı inkişafına, ümumiyyətlə, məktəbli şəxsiyyətinin formalaşmasına yönəlmiş pedaqoji fəaliyyətə cəlb olunması yeni bir yanaşma tərzidir. Burada valideynlərdən uşaqlarının psixoloji xüsusiyyətləri, öyrəndiyi fənlərin fəlsəfəsi, standartlar, strategiya və qiymətləndirmə mexanizmləri, eləcə də məktəbdəki təlim yükü, öyrənmə fəaliyyəti və sair barədə müəyyən bilgilər almaq, məlumatlanmaq tələb olunur. Odur ki, Dövlət Strategiyasında strateji tədbirlərdən biri kimi "uşaqların davamlı inkişafına yönəlmiş pedaqoji fəaliyyətə dəstək vermək məqsədi ilə valideynlərin sistemli şəkildə pedaqoji-psixoloji maarifləndirilməsi üçün "səriştəli valideynlər" proqramının hazırlanması" nəzərdə tutulur.

İlkin olaraq belə fikrə gəlmək olar ki, həmin proqram uşaqların səviyyəsinə, valideynlərin tələb və ehtiyacına uyğun yaradılmalıdır. Belə olan təqdirdə proqramın hazırlanması, reallaşdırılması, mühüm pedaqoji tədbirlərdən biri kimi, onu tətbiq edən təhsil müəssisəsinin üzərinə düşəcəkdir.

İstedadlılarla işin yeni mərhələsi.

Bu gün məktəbin fəaliyyətində başlıca istiqamətlərdən biri istedadlıların müəyyən olunmasından, onların inkişafına qayğı göstərilməsindən ibarətdir. Məktəb bu vəzifəni yerinə yetirməklə müasir zamanın çox vacib bir problemini həll etmiş olacaqdır. Psixoloqların qənaətinə görə, bu mühüm məsələnin nəzərə alınması çox vacibdir. Cəmiyyət üçün öncül olan bu missiyanın yerinə yetirilməsində son dərəcə diqqətli olmaq əhəmiyyət daşıyır. İstedadlıların çoxu diqqətsizlik ucbatından inkişafdan qalır. Başqa sözlə, "məktəbdə intellektual baxımdan qabiliyyətli uşaqların bir çoxu motivasiya çatışmazlığı ucbatından yaxşı oxumur" (5, 24). Belə olan təqdirdə necə etmək, hansı texnoloji vasitələrə əl atmaq lazım gəlir?

Təbii ki, müasir təfəkkür məktəbinin bir başlıca vəzifəsi də qabiliyyəti olan istedadlı uşaqları aşkar etməkdən, onlarla düşünülmüş qaydada ardıcıl və sistemli iş aparmaqdan ibarətdir. Psixoloqların fikrincə, uşaqlara birtərəfli yanaşmaq onların inkişafının düzgün qiymətləndirilməsi baxımından bizi yanlış istiqamətə apara bilər. Ona görə də uşaqların inkişafını düzgün qiymətləndirmək üçün psixoloji metodlardan istifadə etmək, diaqnostik iş aparmaq hazırkı şəraitdə məqsədəuyğun hesab edilir.

Bunun üçün də testologiya nəzəriyyəsi və təcrübəsindən istifadə etmək bu işi elmi əsasda ardıcıl və sistemli aparmaq üçün psixodiaqnostik mərkəzlər yaratmaq, xüsusi indiqatorlar və onların əsasında milli testlər hazırlamaq, istedadlıların seçimini həmin metodologiyaya əsasən qurmaq məqsədəmüvafiq hesab edilir.

Nəticə olaraq qeyd etmək lazımdır ki, ölkəmizdə qəbul olunmuş "Azərbaycan-2020: gələcəyə baxış" İnkişaf Konsepsiyası və "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"ndan irəli gələn vəzifə kimi Azərbaycanda "yaddaş məktəbi"ndən "düşüncə və təfəkkür məktəbi"nə keçid inkişafımızın hazırkı mərhələsində müzakirələrin, fikir mübadilələrinin

aparılmasını tələb edir. Biz bu məqalədə həmin problemin bəzi məqamlarına toxunduq. Ümidvarıq ki, bu müzakirə aktual bir məsələ kimi davam edəcək, ümumtəhsilin "düşüncə və təfəkkür məktəbi" kimi formalaşmasına töhfə verə biləcək mülahizələrin yaranmasına səbəb olacaqdır.

**İstifadə edilmiş ədəbiyyat**


1. "Təhsil haqqında" Azərbaycan Respublikasının qanunu. Bakı: Hüquq ədəbiyyatı, 2009.
2. http://www.edu.gov.az/view.php?-lang=az&menu=73&id=7492.
3. www.president.az › SƏNƏDLƏR › Sərəncamlar.
4. Əlizadə Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı: Pedaqogika, 2004.
5. Əlizadə Ə. İdrak prosesləri və hislər. Psixopedaqoji məsələlər. Bakı, 2006.


**Г.Новрузов,**
**А.Аббасов**

**На пути к школе разума и мышления**

**Резюме**

В статье рассказывается о выдвинутых задачах "Государственной Стратегии по развитию образования в Азербайджанской Республике". Даётся краткое изложение проделанных работ в области образования Азербайджана с начала реформ по сегодняшний день, а также раскрываются пять основных целей Государственной Стратегии. Создание содержания, основанного на результативной компетенции, подготовка педагогических кадров отношений между родителями и учителями и многое другое обосновывается формирование в этом направлении.

**G.Novruzov,**
**A.Abbasov**

**Towards newly forming thinking and cognitive schools**

**Summary**

The article is dedicated to the problems of State Strategy on the development of education. Five main objectives of the state strategy and summary of the work are noted here. Training of teaching staff, creating of content base for effective competency, training of teaching stuff and relations between teachers and parents are also being discussed.

# MÜƏLLİM PEŞƏKARLIĞINI ZƏRURİ EDƏN TENDENSİYALAR

**Yuliya Kərimova**
***Bakı şəhəri 23 nömrəli tam orta məktəbin direktoru***

***Açar sözlər:*** *interaktiv təlim üsulları, təhsil paradiqması, yeni pedaqoji mədəniyyət, müşahidəli tədqiqat, müəllim peşəkarlığı, müəllim səriştələri və keyfiyyətləri çərçivəsi.*

***Ключевые слова:*** *интерактивные методы обучения, образовательная парадигма, новая педагогическая культура, исследование по наблюдениям, профессионализм учителей, компетенции и качества учителей.*

***Key words:*** *interactive teaching and learning methods, educational paradigm, new pedagogical curlture, observational studies, teachers' professionalism, teachers' competencies and qualities.*

Dünya ölkələrində yeni təhsil konsepsiyaları tətbiq olunur. Artıq 6 ildir ki, Azərbaycan məktəblərində də yeni təhsil proqramları həyata keçirilir. Təbiidir ki, islahatlar prosesində dəyişikliklərdə müəllimlər həlledici sima kimi çıxış edir. Bu da aydındır ki, təhsildə aparılan kompleks islahatların təsiri nəticə etibarı ilə məhz sinif otaqları mühitində reallaşır və şagirdlərin göstərdiyi təlim nəticələrinin yüksəlməsinə xidmət edir. Bu baxımdan ölkəmizdə də çox iş görülür. Azərbaycanda təhsilin inkişafını və onun həyata keçirilməsini konseptual baxımdan əsaslandıran iki ən vacib sənədin: "Azərbaycan Respublikasında ümumi təhsilin konsepsiyası (Milli Kurikulum)" (2006) və "Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları)"nın (2011) təhlili bir daha təsdiq edir ki, məktəblərdə pedaqoji proses təhsilalanın bütöv şəxsiyyət kimi formalaşması tələbatlarına cavab verməli, cəmiyyətin təhsil gözləntilərini doğrultmalı və dövlət tərəfindən müəyyən olunmuş məqsəd və vəzifələr lazımlı səviyyədə yerinə yetirilməlidir. Bunlar ciddi məsələlərdir. Əslində yeni təsdiq olunmuş təhsilin konsepsiyası 20-30 il əvvəlki təhsil siyasətindən əhəmiyyətli dərəcədə fərqlidir.

Qeyd etmək vacibdir ki, Azərbaycan təhsil paradiqmasının dəyişdiyi yeganə ölkə deyil və şəxsiyyətyönlü təhsil baxımından digər ölkələrin təcrübəsi və getdiyi yollar da göz önündədir.

Şəxsiyyətyönlü təhsildə şagirdlərin arasında olan fərqliliklər ciddi şəkildə qəbul edilir və təlim prosesinin planlaşdırılmasında əsas amil kimi çıxış edir. Bu prosesdə, həmçinin qiymətləndirmə diaqnostik xarakterdə olub davamlı aparılır, həm də bu zaman mənimsəmədə fərqlilikləri və çətinlikləri üzə çıxartmaq məqsədi güdülür. Belə qiymətləndirmənin nəticələri isə növbəti mərhələnin planlaşdırılması üçün zəruri hesab edilir. Pedaqogika və psixologiya elmi onu da əsaslandırmışdır ki, intellekt müxtəlif mənalarda şərh edilir və müxtəlif yollarla inkişaf etdirilir. Təlim prosesi bir-birindən fərqlənən intellekt tipləri üzərində qurulur. Bu prosesdə şagirdlərin müxtəlif qavrama üslubları da öyrənilir, təlim-tədris üsulları və strategiyalar məhz müxtəlif öyrənmə üslubları nəzərə alınaraq seçilir və tətbiq olunur.

Tədris prosesində ardıcıl olaraq şagirdlərin ehtiyacları, seçimləri və maraqları nəzərə alınaraq müxtəlif iş formaları tətbiq olunur. Bu zaman təlim fəaliyyətləri şagirdlərin hazırlıq səviyyələri, maraqları və öyrənmə üslubları nəzərə alınmaqla qurulur. Müşahidələr göstərir ki, qiymətləndirmə üçün müxtəlifsəviyyəli (diferensial) tapşırıqlar və vasitələr tətbiq olunur. Həm də bu zaman vaxt tədris vahidləri arasında çevik bölünür, şagirdlərin inkişafı və nailiyyətləri əsas götürülür. Fərdi qavramaq dərəcələri nəzərə alınaraq müəllim tərəfindən onlara müxtəlif oxu materialları təklif olunur, müxtəlif şərh və izahatlara şərait yaradılır. Bu prosesdə müəllim şagirdlərə özünüdərketmə və özünüidarəetmə bacarıqlarının formalaşmasında da kömək göstərə bilir.

Yuxarıda qeyd olunan məsələlər Mərkəzi Şərqi Avropa ölkələri ilə yanaşı, müasir dövrdə Azərbaycan məktəblərinin yaşadığı keçid proseslərini də xarakterizə edir. Hazırkı dövrdə Azərbaycanda bu prosesləri əks etdirən kurikulum islahatı məktəblər və müəllimlər qarşısında yeni məqsədlər qoyur. Belə ki, 2010-cu ildə təsdiq olunmuş "Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları)" sənədi ümumi təhsilin məzmunu qarşısında bir sıra yeni tələblər qoyur. Təhsilin məzmununa dair bu rəsmi sənəddə qoyulan tələblərin əksəriyyəti məhz şəxsiyyətyönlü təhsil paradiqması ilə uyğunlaşır. Mühüm məqam odur ki, 24 oktyabr 2013-cü ildə Azərbaycan Respublikasının Prezidenti tərəfindən təsdiq olunmuş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" da şəxsiyyətyönlü təhsil məzmununun və kurikulumların yaradılmasını ən vacib strateji istiqamətlərdən biri kimi müəyyən edir. Bu o deməkdir ki, ölkəmizin təhsil sistemi üçün konseptual sənədlər tərəfindən müəyyən edilən məqsəd və vəzifələr öz əksini real məktəbdə, müəllimin gündəlik işində tapmalıdır. Çünki öyrənmə prosesi məhz məktəblərdə baş verir, orada tənzimlənir və dəyərləndirilir. Məlumdur ki, təhsil islahatı prosesi çərçivəsində mühüm addımlar atılmışdır. Orta məktəb fənləri üzrə nəticəyönümlü kurikulumlar yaradılmışdır, artıq interaktiv təlim üsulları və yeni dərs modeli tətbiq olunur, fərqli şagird nailiyyətlərinin qiymətləndirilməsi yanaşmaları və mexanizmləri işlənilir, yeni dərsliklər və şagird üçün digər vasitələr yaradılır, kitabxana fondları zənginləşdirilir, İKT vasitələri məktəblərin gündəlik həyatına daxil olur və geniş istifadə olunmağa başlayır.

Qeyd etmək lazımdır ki, yeni kurikulumun tətbiqi vəziyyətinin öyrənilməsi məqsədilə aparılan uzunmüddətli tədqiqatlar göstərir ki, müəllimlərin yeni yanaşmalara qarşı münasibətləri statik deyil. Belə ki, 2009-2010-cu illərdə yeni kurikulumların tətbiqinin ilkin vəziyyətinin öyrənilməsi məqsədilə aparılmış tədqiqatlar göstərmişdir ki, təhsil islahatları və məhz məzmun islahatını sorğuda iştirak etmiş müəllimlərin içərisində dəstəkləməyənlər də vardır. Bu da həqiqətdir ki, ölkəmizin müxtəlif regionlarında aparılmış sinif müşahidələri isə göstərmişdir ki, şagirdlərin inkişafında yeni fənn kurikulumlarının rolunu müəllimlər bir neçə aspektə görə müsbət dəyərləndirirlər:

- Yeni kurikulum şagirdlərin öyrənməsini, tədqiqat aparmasını tələb edir və beləliklə də, ümumiləşdirmə və nəticəçıxarma kimi məntiqi bacarıqları inkişaf etdirir.

- Yeni kurikulumla aparılan dərslərdə şagirdlər öz fikirlərini sərbəst şəkildə bildirir, həm də mənimsədikləri materialı təhlil etməyi öyrənirlər. O da var ki, əvvəlki kimi yadda saxlamaq və möhkəmləndirmək artıq önəmli hesab edilmir. Bunun əvəzində şagirdlər bilikləri tətbiq etməyi öyrənirlər.

Bundan əlavə, müəllimlər artıq ilkin mərhələdə şagirdlərin akademik bacarıqlarını sosial bacarıqlarla əlaqələndirirlər. Təhliletmə və tətbiqetmə dərslərində fəal iştirak

və sərbəst fikir ifadə etmək eyni dərəcədə vacib məsələ kimi vurğulanır.

Maraqlıdır ki, mövcud müsbət dəyərləndirmənin fonunda tədqiqata cəlb olunmuş müəllimlərin xeyli hissəsi məhz köhnə fənn proqramları ilə işləmək və köhnə dərsliklərlə təlimin aparılması barədə arzularını ifadə etmişdilər: sorğudan keçmiş müəllimlərin bir qismi ibtidai təhsildə bütün fənlər üzrə köhnə proqramla işləmək arzularını qeyd etmişdilər, bir qismi isə bəzi fənlər üzrə köhnə proqramlara qayıtmaq istəmişdilər. İlkin mərhələdə aparılmış tədqiqatlar göstərmişdir ki, müəllimlərin əksəriyyəti interaktiv üsulların tətbiqində çətinliklərlə qarşılaşırlar. Digər ciddi problem isə müəllimlər tərəfindən formativ qiymətləndirmənin tətbiqi və onun əhəmiyyətinin başa düşülməsi ilə bağlı olmuşdur.

Bütün bunlar müəllimlərin aparılan islahatlara qarşı münasibətinin formalaşması və vaxt keçdikcə dəyişməsinə gətirib çıxartmışdır. Əgər ilkin tədqiqatlar mərhələsində (2009-2010-cu illər) müəllimlər islahatları daha yüksək dəstəkləyir və konstruktiv yanaşırdılarsa, 2011-2012-ci illərdə keçirilmiş ortamüddətli tədqiqatda yanaşmalar müxtəlif olmuşdur. Üstəlik, kurikulumların tətbiqində müəllimlərin qarşılaşdıqları çətinliklərin sayı da artmışdır. Belə ki, kurikulum üzrə təlimlər zamanı vaxtın azlığından materialın az əhatə olunması, fənn kurikulumlarının tətbiqinə dair metodiki vəsaitlərin az olması, bütün fənlər üçün eyni dərs strukturunun və eyni üsulların tətbiq olunması tələbi, yeni qiymətləndirmə üsullarının tətbiqi üçün vəsaitlərin məhdud olması kimi faktlar tədqiqatda iştirak edən müəllimlərin işində çətinliklər yaratmışdır. Bütün bunları yeni kurikulumların tətbiqinə müəllimlərin hələ tam alışmaması kimi anlamaq olar. Ortamüddətli tədqiqatlar zamanı müəllimlər kurikulumun tətbiqində və ümumiyyətlə, təhsilin keyfiyyətinin yüksəldilməsində müəllimlərin islahatlara qarşı yanaşmalarının dəyişməsi üçün motivasiyanın olmaması və ümumi peşəkarlıq səviyyəsinin aşağı olmasını əngəl törədən amillər sırasında qeyd etmişdilər (Ortamüddətli müşahidəli tədqiqat, 2012).

Tədqiqatlar vasitəsilə sinif otaqlarında nələr baş verdiyini göstərən bu faktlar sübut edir ki, kurikulum islahatının ilkin mərhələsində müəllimlərin verdiyi dəstəyin səviyyəsi daha yüksək olmuşdu. Bu, onların öz peşəkarlıq səviyyələrinə olan inam və uzunmüddətli təcrübələrindən irəli gələn dəstək və dəyərləndirmə idi.

Lakin o da bir həqiqətdir ki, illər keçdikcə, müəllimlərin islahatlara olan münasibətləri dəyişir. Bunun müxtəlif səbəbləri vardır. Onlardan biri odur ki, islahatlar başlayan dövrdə müəllimlərin mövcud peşəkarlıq səviyyəsi və təlim kursları vasitəsilə qazandıqları biliklər sinifdə kurikulumun tətbiqi üçün əlverişli və dəstəkverici mühitin yaradılması üçün kifayət deyildi. Bu o deməkdir ki, kurikulum islahatı zamanı müəllimlərə peşəkarlığın inkişafı ilə bağlı verilmiş biliklər, istifadə olunan iş formaları 2010-cu ilin konseptual sənədində göstərilən kurikulumun məqsəd və vəzifələrini reallığa çevirmək üçün lazımi qədər səmərəli və məqsədyönlü olmamışdır.

Onu da qeyd etmək vacibdir ki, müəllimlərin islahatlara dair münasibətlərinin dəyişməsi və verdikləri dəstəklərin zəif olması halları 2009-cu ildə Yeni Zelandiyanın Okland Universitetinin professoru, tədqiqatçı Con Hattye (John Hattie, 2009) tərəfindən də təsdiq olunmuşdur. Onun fikrincə, bütün ölkələrdə olduğu kimi, bizdə də müəllimlərin böyük bir qismi təlim-tədris üsullarının və yanaşmalarının dəyişməsini dəstəkləmir və adətən, dəyişmək tələbatlarını rədd etməyə çalışırlar. Müəllimlər tərəfindən uzun müddət tətbiq olunan üsul və yanaşmalar onların təcrübələrini şərtləndirən güclü faktordur. Bu faktoru aradan qaldırmaq və

sinif otaqlarında tətbiq olunan gündəlik təcrübələri və yanaşmaları yeniləmək və dəyişmək üçün xolistik, kompleks, şəxsiyyətyönlü və innovativ strategiyalar işlənməlidir. Müəllim peşəsini araşdıran digər xarici tədqiqatçı Y.Vikman "Avropada müəllim siyasəti" monoqrafiyasında (Wickman, 2010) qeyd etmişdi ki, müəllimlərin peşəkar bilikləri iş yerlərində formalaşmış ənənələrə və intuitiv xarakterli biliklərə əsaslanır. Ona görə illər ərzində formalaşmış təcrübəni və peşəkar yanaşmaları dəyişmək və innovasiyalara doğru yönəltmək elə də asan iş deyil. Bununla yanaşı, Vikman yazır ki, bəzən müəllimlər öz peşəkar inkişaf ehtiyaclarını anlamaq və onları ifadə etməkdə belə çətinlik çəkirlər. Buna baxmayaraq, 2012-ci ildə ölkəmizdə aparılmış ortamüddətli tədqiqat zamanı sorğu ilə əhatə olunmuş müəllimlər peşəkarlıq səviyyələrini artırmaq üçün zəruri biliklərə yiyələndiklərini də qeyd etmişdilər. Belə ki, müəllimlər şagirdlərin müxtəlif qavrama qabiliyyəti və öyrənmə üslubları haqqında bilmək istədiklərini qeyd etmişdilər.

Göründüyü kimi, bütün bunlar şagirdyönlü təhsil paradiqmasına aid olan məsələlərdir. Bununla da belə nəticəyə gəlmək olar ki, yeni kurikulumun tətbiqində çətinliklərlə qarşılaşan müəllimlər paradiqmal dəyişiklikləri həyata keçirməli olduqlarını illər keçdikcə tədricən anlaya bildilər.

Oxşar islahatlar yolunu keçən müxtəlif ölkələrin təcrübəsi göstərir ki, müəllimin ənənəvi rolunun dəyişməsi yeni peşəkarlıq anlayışının yaranmasını tələb edir. Yeni peşəkarlıq anlayışı isə öz növbəsində ilkin hazırlıq və diplomdansonrakı təkmilləşmə sistemlərində mükəmməl dəyişikliklərin aparılmasını bir vəzifə kimi qarşıya qoyur. Bu işlərdə bir vacib strateji addım atılır: müəllimlərin "yeni peşəkarlığı" anlayışları işlənir və səriştələr toplusu (və ya çərçivələri) hazırlanır.

Müasir dövrdə Avropa İttifaqının təhsil siyasətini şərh edən sənədlərdə "yeni müəllim peşəkarlığı" anlayışı "ömürboyu öyrənmə bacarıqları" anlayışı ilə əlaqələndirilir. Bu anlayışa alışmaq, motivasiya, əməkdaşlığa həvəs və bacarıq, eyni zamanda yaradıcılıq kimi məsələlər daxildir. Belə ki, 2009-cu ildə Avropa İttifaqının üzv ölkələri üçün yaradılmış müəllim hazırlığı proqramları üçün tövsiyələrdə müəllimin peşəkarlığı üçün məhz ömürboyu öyrənmə konsepsiyası əsas prioritet kimi göstərilmişdir.

Azərbaycanda daim yeniləşən şəraitdə müəllimin rolunun və peşəkar biliklərinin dəyişməsi zərurəti 2007-ci ildə yaradılmış "Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının konsepsiya və strategiyası" sənədində qeyd olunmuşdur. Azərbaycan Respublikasında "Təhsilin İnkişafı üzrə Dövlət Strategiyası" isə cəmiyyətin bütün sahələrində (iqtisadi, ictimai, əxlaqi-mənəvi, siyasi) sürətli dəyişmələrin əks olunmasını və ömürboyu öyrənmə modeli üzərində təhsil sisteminin qurulmasının vacibliyinin mühüm hədəflərdən biri olmasını vurğulayır.

Hazırkı dövrdə "postsosialist" adlandırılan ölkələr, Mərkəzi-Şərqi Avropa və Balkan ölkələri regionunda müəllimin yeni peşəkarlığı konsepsiyaları işlənilməkdədir və həmin konsepsiyalar üzərində müəllimlərin ilkin hazırlıq və diplomdansonrakı peşəkar inkişaf sistemləri üçün mükəmməl islahatlar qurulmaqdadır. Bu strateji istiqamət üçün ən vacib başlanğıc komponenti kimi isə müxtəlif "milli müəllim standartları" və ya "müəllim kompetensiyaları çərçivəsi" tipində sənədlər hazırlanmaqdadır. Məsələn, 2011-ci ildə Serbiyada ölkənin Milli Kvalifikasiyalar Çərçivəsi qəbul olunandan sonra müəllim peşəsi və peşəkar inkişafı üçün səriştələr standartları yaradılmışdı. "Kompetensiya" və ya səriştə anlayışı isə belə açıqlanır: təhsil sahəsində kompleks fəaliyyət-

lərin icra edilməsi üçün mühüm bacarıqlar toplusu. Bu sənəd peşəkar müəllimin mühüm səriştələrini 4 əsas istiqamətdə toplayır:

• Məzmun sahəsi: tədris edilən fənn və təlim üsulları; təlim və tədris metodikaları; şagirdlərin fərqliliklərinin formalaşması və inkişafına dəstəklərin verilməsi; şagirdlər, valideynlər və iş yoldaşları ilə ünsiyyət və əməkdaşlıq etmək bacarıqları.

Həmin regionun digər ölkəsi Monteneqroda müəllimlərin peşəkar kompetensiyaları isə 8 əsas sahə üzrə qruplaşdırılır:

Şagird və təlim prosesi.

Təlim mühiti və şərait.

Peşə bilikləri və kurikulum üzrə biliklər.

Metodoloji biliklər.

Planlaşdırma.

Qiymətləndirmə və dəyərləndirmə.

Peşəkar inkişaf.

Liderlik potensialı/təşəbbüskarlıq və əməkdaşlıq.

Bu ölkədə müəllim standartlarının yaradılması, əsasən, müəllimlərin məktəbdaxili peşəkar təkmilləşməsi, mentorluq məqsədləri ilə tətbiq olunması üçün nəzərdə tutulur. Qeyd etmək lazımdır ki, bu ölkədə həmin sənəd üzərində işlər davam etdirilməkdədir.

Müəllimin peşəkar səriştələrini təyin edən və ümumiyyətlə, müəllimlərin hazırlanması və diplomdansonrakı təkmilləşmə sistemlərinin inkişafı üçün strateji konseptual sənədlərin ən maraqlı nümunəsini Bosniya və Herseqovinanın timsalında görmək olar. Belə ki, bu ölkədə müəllimlik peşəsinin təkmilləşməsinə dair uzunmüddətli layihə həyata keçirilməkdədir. 2008-ci ildə başlanan layihə yerli qeyri-hökumət təşkilatları və hökumət təşkilatlarını da əhatə etmişdir. Layihənin məqsədi “21-ci əsrdə cəmiyyətin davamlı inkişafını təmin etmək üçün nə cür müəllimlər fəaliyyət göstərməlidir?” sualına cavab tapmaqdan ibarət idi. Nəticədə layihə qrupu geniş kompetensiyalar çərçivəsini yaratmış, ölkə ictimaiyyətinə təqdim etmişdi. Bosniya və Herseqovinanın kompetensiyalar çərçivəsi müəllimlər üçün peşəkarlıq standartlarını 6 böyük sahə üzrə qruplaşdırır.

Öyrənən və öyrənmə prosesi; öyrətmə və qiymətləndirmə; öyrənmə mühiti; peşəkar inkişaf və məsuliyyət; məktəb, ailə və icma arasında əməkdaşlıq; məktəbin inkişafı və təhsil sisteminin təkmilləşməsi.

Ənənəvilikdən kənara çıxan və müəllim üçün zəruri hesab edilən bu keyfiyyətlər 3 amilin əsasında açıqlanır: bilik-müəllim nəyi bilməli, bacarıq - nəyi bacarmalı və dəyər – müəllim nəyə inanmalıdır (nəyi dəyərləndirməlidir).

Qeyd etdiyimiz ölkələr tərəfindən səriştələr çərçivəsinin hazırlanması, yuxarıda qeyd etdiyimiz kimi, müəllim hazırlığı konsepsiyasının işlənməsi və yeni müəllim kadrlarının hazırlığı, davamlı peşəkar inkişaf sisteminin yaradılması istiqamətlərində aparılan işlərin ilk strateji addımıdır. Bunlar Avropa İttifaqının üzv ölkələri üçün tövsiyələr hesab oluna bilər. Belə səriştələr çərçivəsi olan siyasi sənəd ölkələr üçün müəllimin yeni peşəkarlıq sisteminin yaradılması və fəaliyyət göstərməsi üçün bünövrə kimi çıxış edir və mühüm dərəcədə hər hansı bir dövlətin hökumətinin təhsilə və təhsilverənlərə münasibətini göstərir. Ona görə müəllim səriştələrinin çərçivəsi Avropa İttifaqında müəllim hazırlığı üçün daha dəyərli hesab edilir.

Bütün qeyd olunanlar ölkəmizdə aparılan islahatların məktəb və sinif otaqlarında səmərəliliyin yüksəldilməsi üçün vacib istiqamətin olmasının mühümlüyünü ön plana çəkir. Ölkəmizdə müəllim hazırlığı və müəllimlərin peşəkar təkmilləşməsində olan yanaşmaların dəyişməsi zərurətini də burada qeyd etməmək mümkün deyildir. Bütün bunlarla yanaşı, bir sıra vacib olan mühüm

istiqamətlərin müəyyən edilməsi nəzərə alınmalıdır. Müstəqil ölkənin özünün unikal şəraiti, inkişaf xüsusiyyətləri nəzərə alınmaqla yeni müəllim peşəkarlığı anlayışı və ondan irəli gələn müəllim hazırlığını özündə əks etdirən normativ sənədlər işlənilməlidir.

Ölkənin yeni təhsil siyasətini təyin edən mühüm sənədlərdə elan olunmuş deklarativ çağırışların reallığa çevrilməsinə zəmin yaratmaq üçün müəllimlərin real ehtiyacları təhlil olunmalı, onlar üçün yeni innovativ peşəkar biliklər və bacarıqlar müəyyənləşdirilməli, yeni səriştələr formalaşdırılmalıdır. Bütün bunları reallaşdırmaq üçün isə birinci addım müəllimlərin yeni kurikulumun tətbiqində rast gəldikləri problemləri öyrənməkdən, onların ehtiyaclarını təhlil etməkdən və bu ehtiyacların hansı səbəblərdən irəli gəlməsi məsələlərini müəyyən etməkdən ibarət olmalıdır. Yeni və təcrübəli müəllimlərin gördükləri və yaşadıqları müxtəlif və fərqli problemlərin öyrənilməsi, ölkə miqyaslı ciddi araşdırmaların aparılması və indiyədək aparılmış tədqiqatların nəticələrini dərindən öyrəndikdən sonra yeni qabiliyyətlərə yiyələnəcək müəllimlərin hazırlanmasına başlanmalıdır.

*Rəyçi: dos. Ə.Abbasov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, № 5.
2. Ümumi təhsil pilləsinin dövlət standartı və proqramları (kurikulumları). // Kurikulum, 2010, № 3.
3. Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının konsepsiya və strategiyası. www.gov.az – Qanunvericilik, Konsepsiyalar.
4. Avropa İttifaqının müəllim hazırlığı üçün "Müəllim kompetensiyaları və kvalifikasiyaları üçün əsas prinsiplər". 2010. http://ec.europa.eu/education/policies/2010/doc/principles_en.pdf ) .
5. Vidoviç V., Velkovski Z. Teaching profession for the 21 century. Belgrade. Center for Education Policy Publication. (2013).
6. Rado P. Transition in Education. Institute for Public Policy Publication. 2001.
7. Wickman Y. European teacher policies. 2010.

**Ю.Каримова**

**Тенденции, необходимые для профессионализма учителя**

**Резюме**

В статье рассматриваются вопросы имплементации нового национального курикулума в Азербайджане. Анализируются результаты национальных исследований, проведенных в период с 2009 по 2012 годы, которые представляют возможность увидеть трудности, с которыми сталкиваются учителя и причины, порождающие эти трудности. Автор поднимает вопрос о необходимости разработки концептуально нового подхода к понятию "профессиональный учитель".

**Y.Karimova**

**Tendencies demand teachers' competencies**

**Summary**

The article is dedicated to the curriculum implementation. The results of long term national research undertaken in the period of 2009-2012 shows the problems and challenges of teachers. It is noted that enhancing teachers 'professionalism and competencies is important.

# NƏTİCƏYÖNÜMLÜ VƏ ŞƏFFAF İDARƏETMƏ MODELİNƏ DAİR

**Qafar Hüseynov**
***Bakı şəhəri, MLK-nın direktoru,***
***filologiya elmləri doktoru***

***Açar sözlər:*** *nəticəyönümlülük, məktəb rəhbərliyi, pedaqoji fəaliyyət, təhsilin keyfiyyəti, pedaqoji dəyərlər, əməkdaşlıq, şəffaflıq, İnkişaf Proqramı.*

***Ключевые слова:*** *результат обучения, руководство школы, педагогическая деятельность, качество образования, педагогические ценности, сотрудничество, прозрачность, Программа Развития.*

***Key words:*** *result oriented, school administration, pedagogical activities, the quality of education, pedagogical values, cooperation, transparency, Development programme.*

Azərbaycan təhsili özünün yeni mərhələsini yaşayır. 2013-cü ilin oktyabrında qəbul edilmiş Təhsilin inkişafı üzrə Dövlət Strategiyası pedaqoji ictimaiyyət tərəfindən rəğbətlə qarşılanmış və təhsilimizin gələcəyi barədə düşüncələrə yol açmışdır. Aydın məsələdir ki, Strategiyadan irəli gələn müddəalar təhsildəki mövcud durumdan innovasiyalar rejiminə keçmək üçün vacib çağırış oldu. Bu barədə mətbuatda geniş müzakirələrin aparılması, təkliflərin söylənilməsi də təsadüfi deyildir.

Strategiyanın çox mühüm inkişaf istiqamətlərindən biri də idarəetmədə nəticələrə görə cavabdehlik və şəffaflığın həyata keçirilməsidir. Təhsilin inkişafı üzrə Dövlət Strategiyasında oxuyuruq: "Təhsilin keyfiyyətinin yaxşılaşdırılması üçün təhsili idarəetmə sisteminin yenidən qurulması, bu sahədə insan resurslarının inkişaf etdirilməsi və müəllim peşəsinin nüfuzunun artırılması zəruridir".

Ümumxalq əhəmiyyətli bu dövlət sənədində xüsusi təyinat kimi idarəetməyə xüsusi önəm verilməsi, "təhsildə tənzimləmə, idarəetmə və nəzarət funksiyalarının dəqiq müəyyən edilməsi" kimi fikirlərin olması məktəb rəhbərləri üçün bir inkişaf stimuludur. Hər kəs bu müddəalar üzərində düşünməli, öz işini bu aspektdə qurmağa səy göstərməlidir.

Məktəbin idarə edilməsində bu vacib amillərin birləşdirilməsi, nəticəyönümlülüyün birbaşa idarəçilikdə şəffaflıqla bağlılığı məsələləri aktuallığı ilə seçilir. Nəticəyönümlülüyün izlənməsi bir neçə faktla bağlıdır. Bunu formal olaraq aşağıdakı sxemdə göstərmək olar.



Hər bir faktoru əhatə edən müddəaları aşağıdakı bölgü ilə göstərmək olar:




II. Təhsildə innovasiyaların tətbiqi hər bir müəllimin innovativ laboratoriyalarda birgə iş fəaliyyətini qurmasıdır. Laboratoriyalar aşağıda göstərilən istiqamətlər üzrə fəaliyyət göstərə bilər:




Laboratoriyaların fəaliyyətinin mahiyyətini təqribən aşağıdakı kimi göstərmək olar.

"İnsan-insan" laboratoriyasında birləşən müəllimlərin arasında təlim-tərbiyə işləri üzrə əməkdaşlıq aşağıdakı kriteriyalar üzərində qurulur:

1. Tərbiyə işində müəllim və şagirdlərin birgə işi (şagirdlərin asudə vaxtlarının səmərəli keçməsinə yönəlir).

2. Təhsildə geridə qalan şagirdlərlə birgə iş (burada psixoloqun köməyi ilə geridə qalan şagirlərdən mikroqruplar təşkil olunur. Bu zaman eyni şagird bir neçə mikroqrupa düşə bilər, bu, bir neçə fəndən geri qalmadan irəli gələ bilər).

3. Şagirdlərin təlim-tərbiyə işində aktiv mövqelərini inkişaf etdirmək sahəsində birgə iş (burada psixoloqun köməyi ilə hazırlanmış diaqnostik material əsas tutulmalıdır).

4. Tədris ili ərzində əməkdaşlıq ideyalarına əsaslanan metodik tövsiyələrin və innovasiya bankı yaradanların birgə işi (burada əməkdaşlıq edən müəllimlər müəyyən bir problem üzrə yeni dərs üsullarını, metodiki və pedaqoji məruzələri toplayıb geniş pedaqoji auditoriyaya çatdırmaq məqsədi ilə çalı-

şırlar: məsələn, mimio dərslər yaradan qrup; elektron dərslər yaradan qrup və s.).

“İnsan-elm” laboratoriyasında birləşən müəllimlər bu və ya digər fənlərin tədrisində dünya pedaqoji aləmində baş verən yenilikləri öyrənir, yeni texnologiyaların tətbiqi sahəsində məktəbin inkişaf proqramına öz töhfələrini verirlər. Bu tədris laboratoriyasında iş aşağıdakı istiqamətlər üzrə qurulur:

1. Elmi-pedaqoji və metodiki yeniliklərin internet və kütləvi yayımında izlənməsi və məlumatların toplanması.

2. Toplanmış elmi-pedaqoji yeniliklərin işdə tətbiqi, aprobasiyaların nəticələri əsasında məruzə və çıxışların hazırlanması.

3.Yeni texnologiyaların tətbiqi vasitəsilə müxtəlif yaş qruplarında (V-VII siniflər, VIII-IX siniflər) monitorinqin aparılması.

4. İnklüziv siniflərdə monitorinqin aparılması.

“İnsan-idman” laboratoriyasında müəllimlərin apardığı iş şagirdlərin və müəllimlərin sağlamlığının qorunmasına yönəlir. Müxtəlif idman növləri ilə məşğul olmaq üçün növbəti seksiyalar təşkil olunur, aktiv idman növləri ilə müxtəlif səbəblər üzündən məşğul ola bilməyən şagird və müəllim kontingenti üçün “Relaksasiya” zalı fəaliyyət göstərir. Laboratoriyanın rəhbəri idman müəllimi deyil, o sahənin bilicisi təyin olunur ki, bu da müxtəlif subyektiv amillərin aparılan işin keyfiyyətinə təsir etməməsi üçün mühüm amildir.

“İnsan-mədəniyyət” laboratoriyasında, əsasən, humanitar fənlər blokunun müəllimləri birləşir. Laboratoriya işçilərinin əsas məqsədi dünya mədəniyyətinin dünəni və bu gününün inkişaf mərhələləri ilə təkcə şagirdləri deyil, pedaqoji kollektivi də tanış etməkdir. Mədəniyyətin və ədəbiyyatın bir-biri ilə sıx əlaqədə inkişaf etmələrini izləyən laboratoriyanın müəllimləri aşağıdakı istiqamətlərdə məruzə və çıxışlar hazırlayırlar:

1. Antik dövrdə fəlsəfənin inkişafı, dövrün yeniliklərinin müasir şəraitdə məktəb sistemində tətbiqi;

2. İntibah dövründə ədəbiyyatın, elmin inkişafı, nadir ədəbi əsərlərin, kəşflərin müasir məktəblərdə istifadəsi;

3. Müasir dövrdə elm, mədəniyyət və ədəbiyyat sahəsində baş verən yeniliklərin uyğun gələninin məktəbdə tətbiqi, yeniliklərə yaradıcı münasibət bəslənməsi.

“İnsan-təbiət” laboratoriyasında biologiya, coğrafiya, kimya, fizika müəllimləri birləşir. Bu laboratoriyada işin əsas məqsədi şagirdlərin ekoloji tərbiyəsinə, Azərbaycanın flora və faunasının öyrənilməsi və inkişafında rol oynayan alimlərin həyat və yaradıcılığının öyrənilməsinə yönəlir. Burada iş aşağıdakı istiqamətlər üzrə qurulur:

1. Ekoloji tərbiyənin elmi–nəzəri əsaslarının öyrənilməsi, şagirdlərdə elmin bu sahəsində maraq dairəsinin genişləndirilməsinə yönəlmiş tədbirlər;

2. Azərbaycanın flora və faunasının öyrənilməsi üçün materialların toplanması, son zamanlar elm və təbabətdə baş verən yeniliklərin toplanması və şərhi, ekskursiyaların təşkili və bu sahəyə marağı yüksək olan şagirdlərin və müəllimlərin yaradıcı işini əks etdirən sərgilərin nümayişinə yönələn işlər;

3. “Məktəb ekologiyanı qoruyacaq bir adadır” adlı ekoloji dərnəkdə Bakı parklarının, Xəzərin bitki və heyvanlar aləminin öyrənilməsinə yönələn işlər.

III. Təhsilin məqsədi və proqnozlaşdırma kriteriyaları aşağıdakı kimi göstərilə bilər.

✓ Hər təlim növü üzrə nəticələr var.

✓ Məntiqi təfəkkürə üstünlük verilir.

✓ Hər təlim növü üzrə inkişaf dinamikası izlənilir.

✓ Oxu vərdişlərinə yiyələnmə səviyyəsi izlənilir.

✓ Təhsilin keyfiyyətinin yüksəlməsi yolunda monitorinqlər keçirilir.

IV. Təhsilin keyfiyyətinin artırılması

istiqamətində iş qurulması aşağıda göstərilən istiqamətlər üzrə ola bilər:

1. Təhsil nəticələri aşağıdakı bölgü ilə izlənilir:

✓ Bilik, bacarıq, vərdişlər

✓ Şəxsiyyətin inkişaf göstəriciləri

✓ Tədrisdə alınan mənfi effektlərin azaldılması (həddən artıq yüklənmə, fiziki inkişafa təsir edən amillər, keyfiyyətsiz avadanlıq, sanitar-gigiyena qaydalarına əməl olunmaması və s.)

✓ Fənlər üzrə monitorinqlərin keçirilməsi

✓ İstedadlı uşaqlarla iş

✓ Təhsilində geridə qalanlarla iş

✓ Kurikulumun tətbiqi ilə bağlı iş

✓ İnklüziv təhsil

2. Tədris həm təlim, həm tərbiyə, həm də inkişaf amilidir prinsipinin həyata keçirilməsi üçün meyarlar aşağıdakı kimidir:

✓ Tədris yüksək səviyyədədir.

✓ Fənn üzrə peşəkar müəllim əksəriyyət təşkil edir.

✓ Tərbiyə yüksək səviyyədədir.

✓ Məktəbdaxili intizam qaydalarına əməl olunur.

✓ Fənn üzrə gənc müəllimlərə kömək edilir.

✓ Tərbiyə işinə valideynlər və icma üzvləri cəlb olunur.

3. Məktəb rəhbərliyinin peşəkar olması idarəçiliyin əsası, şəffaflığın təminatıdır. Peşəkarlığın kriteriyaları aşağıdakılardır:

✓ Məktəb rəhbəri innovasiyalara qatılır.

✓ Məktəb rəhbərliyi şəxsiyyətdir. Davranışında, geyimində, ünsiyyətində nümunədir.

✓ Məktəb rəhbərliyi biliklidir, hər bir dərsini açıq elan edir.

✓ Məktəb rəhbərliyi texniki personalı daim diqqətdə saxlayır.

✓ Məktəb rəhbərliyi istedadlı şagirdə diqqətli olmalı.

V. İdarəetmədə şəffaflığın əsas prinsiplərini aşağıdakı ardıcıllıqla göstərmək olar.



"İdarəetmənin düzgün təşkili – şəffaflığın təminatıdır" tezisinə əsaslansaq, idarəetmədə hansı nəticələri ala bilərik:

✓ Məktəbin İnkişaf Proqramı fərqli yazılacaq, innovasiyalara üstünlük veriləcək. Məsələn,

| Proqramın istiqamətləri | Zəif və güclü tərəflərin xarakteristikası | İstiqamətlər üzrə qoyulan məqsəd | Fəaliyyət sahələri üzrə planlaşdırma | Resurslar, kadr potensialı | Nailiyyətlərin əldə edilməsi kriteriyalarının monitorinqi |
|---|---|---|---|---|---|
| Rəhbərlik | | | | | |
| Tədris planı | | | | | |
| Şagird nailiyyəti | | | | | |
| Komandanın kvalifikasiyası | | | | | |
| Psixoloji mühit | | | | | |
| Məktəb resursları | | | | | |

✓ Müəllim şəxsiyyəti cəmiyyətdə daima vurğulanacaq;

✓ Şagirdlərə münasibət dəyişəcək, Təhsil Strategiyasının əsas istiqamətlərindən biri olan – təhsilalanların fərdi xüsusiyyətlərini nəzərə alan innovativ təlim metodları və texnologiyaları vasitəsilə təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən yüksəknüfuzlu təhsilverənin formalaşdırılması həyata keçiriləcək;

✓ Məktəb rəhbərlərinin icmada rolu artacaq;

✓ Valideynlərin məktəb seçimi spektri genişlənəcək;

✓ Təhsilin keyfiyyətinin yüksəldilməsi, istedadlı şagirdə, təhsilində geridə qalan şagirdlərə münasibət yaxşı mənada dəyişəcək; şagirdlərin dərsdənyayınma halları aradan götürüləcək.

Məktəb üzrə pedaqoji dəyərlər ənənəsinin olması aşağıda göstərilən kriteriyalar üzrə müəyyən olunur:

✓ Məktəbin himni, bayrağı, emblemi var;

✓ İstedad bankı var;

✓ Qabaqcıl təhsil işçilərinin bankı var;

✓ İnklüziv təhsilə cəlb olunanların prolongir bankı var;

✓ İcma ilə iş qurulub;

✓ Peşəkar icma bankı var;

✓ Məktəbin şöhrət bankı var.

Beləliklə, Təhsil Strategiyasında qoyulan məsələlər hər bir məktəb rəhbərinin yaradıcılıqla işləməsini tələb edir. İdarəetməyə dair qazanılmış və qazanılacaq zəngin təcrübələrdən hər məktəb səmərəli faydalanmalıdır. Məqalədə göstərdiyimiz sxemlər doqma deyildir. Bizcə, hər bir məktəb rəhbəri belə sxemlər üzərində düşünməli, ən faydalılarının üzə çıxarılıb, qabaqcıl təcrübə kimi tətbiq olunmasına ardıcıl fikir verməlidir.

*Rəyçi: dos. İ.Cavadov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan məktəbi, 2013, № 5, səh. 6-17.

2. Azərbaycan müəllimlərinin XIV qurultayında Azərbaycan Respublikasının təhsil naziri Mikayıl Cabbarovun məruzəsi. // Azərbaycan məktəbi, 2014, № 1, səh. 7-19.

**Г.Гусейнов**

**Модель управления, ориентированная на результат и прозрачность**

**Резюме**

В статье рассматриваются проблемы современного менеджмента школы в свете основных направлений Государственной Стратегии по развитию образования.

**G.Husseinov**

**Transparent management and result oriented model**

**Summary**

In the article it is spoken about the problems of modern management of schools in terms of basic directions of State Strategy on development of education.

* * *

***<u>İnnovasiyalar</u>***

# MÜASİR İNFORMASİYA TEXNOLOGİYALARI VƏ VASİTƏLƏRİ TƏHSİLDƏ

**Tofiq Məmmədov**
***Naxçıvan Müəllimlər İnstitutunun dosenti, pedaqogika üzrə fəlsəfə doktoru***

*Azərbaycanda gərək virtual dərslər, yeni texnologiyalar geniş yayılsın, bütün məktəbləri əhatə etsin. Bu çox böyük, mürəkkəb, çoxlu maliyyə vəsaiti tələb edən proqramdır. Amma biz bunu etməliyik. Çünki biz gələcəyə baxmalıyıq.*

**İlham Əliyev**
**Azərbaycan Respublikasının Prezidenti**

***Açar sözlər:*** *informasiya, innovasiya, təhsil, texnologiya, elektron tədris, resurslar.*

***Ключевые слова:*** *информация, инновация, образование, технология, электронный урок, ресурсы.*

***Key words:*** *information, innovation, education, technology, electron teaching, resources.*

XXI əsrin əvvəllərində həyatın bütün sahələrində olduğu kimi Azərbaycan təhsilində də əsaslı müsbət dəyişikliklər baş vermişdir: Təhsil haqqında Azərbaycan Respublikasının Qanununun qəbul edilməsi, təhsil islahatlarının keçirilməsi, milli dəyərləri saxlamaqla dünyanın inkişaf etmiş ölkələrinin təhsil sisteminə inteqrasiyası, Boloniya Konvensiyasına qoşulma, ilk dəfə olaraq təhsildə kredit sisteminin tətbiqi, "hafizə", "yaddaş" məktəbindən "təfəkkür", məktəb modelinə keçidin əsasını təşkil edən yeni fənn proqramlarının (kurikulumlarının) təhsilə tətbiqi və s. Bu dəyişikliklərə informasiya texnologiyalarının sürətli inkişafını, "informasiya partlayışı"na səbəb olan böyük həcmli informasiyaların toplanması, informasiya cəmiyyətinə keçid, təhsilin bütün pillələrində onun səmərəsini təmin edən keyfiyyətinə yüksək dərəcədə müsbət təsir edən İKT-dən istifadə kimi prosesləri də əlavə etmək olar. Müasir sivilizasiya insan fəaliyyətinin bütün sahələrində düzgün və vaxtında alınan biliyin təmin edilməsinə yönəlmiş inkişaf dövrünə-informasiyalaşdırma əsrinə qədəm qoydu. Hal-hazırda informasiyalaşdırma prosesinin təsiri ilə yeni ictimai quruluş-informasiya cəmiyyəti formalaşır. İnformasiya cəmiyyəti-informasiya resursları istehsalını və informasiyada əlyetərliyin mümkünlüyünü təmin edən, iqtisadiyyatı biliyə əsaslanan, elitar təbəqə, inkişaf etmiş infrastrukturlar, innovasiyalar, beynəlxalq tələblərə cavab verən informasiya texnologiyaları və yüksəksəviyyəli texnoloji parklarla səciyyələnir. Lakin bəşəriyyətin özünün və mədəniyyətinin sonrakı inkişafında olduğu kimi hər bir insanın da mədəni simasının in-

kişaf tendensiyalarını başa düşmək və təhlil etmək lazımdır. Bu tendensiyalara təhsilin informasiyalaşdırılması prosesləri də öz təsirini göstərir. Təhsilin informasiyalaşdırılması prosesləri təlim və tərbiyənin psixoloji-pedaqoji məqsədlərinin həyata keçirilməsinə yönəlmiş müasir informasiya texnologiyalarının işlənilməsi və istifadəsinin nəzəriyyə və təcrübə ilə təmin olunması prosesidir. Bu proses müasir cəmiyyətin informasiyalaşdırılmasının əsas istiqamətlərindən biridir. Təhsili peşə və ümummədəni tərkiblərə ayıraraq qeyd etmək olar ki, təhsilin informasiyalaşdırılması prosesi nə qədər intensivdirsə, gələcək mütəxəssislərin peşə fəaliyyətində informasiya texnologiyalarının tətbiqinə yönəlmiş təhsilin peşə tərkibi də bir o qədər güclü qurulmalıdır. Müasir informasiya texnologiyalarından istifadə etməyi bacarmayan şəxs dinamik inkişaf edən cəmiyyətin adaptasiya mexanizmlərinin birindən məhrum ola bilər. İnformasiya mədəniyyəti formalaşdıqca informasiya vasitələri və texnologiyaları insan həyatının ayrılmaz hissəsinə çevrilir. Müasir təhsildə İKT-nin öyrənilməsi kimi, onun tətbiqində aşağıdakı iki tələb nəzərə alınmalıdır:

1. Müasir informasiya cəmiyyəti şəraitində cəmiyyətin hər bir üzvünün həyata və uğurlu fəaliyyətə uyğunlaşması; öz peşə fəaliyyətlərində yeni İKT-ni tətbiq etməyi bacaran yüksəkixtisaslı mütəxəssislərin hazırlanması;

2. Peşə fəaliyyətində İKT-nin tətbiqi üçün bilik, bacarıq və vərdişlərin əldə olunması; İKT-ə yiyələnməklə istəklərin həyata keçirilməsi.

Bazar iqtisadiyyatı yanaşmasında insan mədəniyyətinin inkişafı ərzində toplanmış mədəni, mənəvi sərvətlərin daşıyıcıları olan bəşəriyyətin gələcək üzvlərinin formalaşmasına deyil, gələcək mütəxəssislərin hazırlanmasına daha çox diqqət ayrılır. Bu problem mövcuddur və İKT-nin tətbiqi və istifadəsində qabaqcıl ölkələrdə özünü daha çox göstərir. Məsələn, texnoloji cəhətdən inkişaf etmiş ölkələr üçün (ABŞ, Yaponiya, Qərbi Avropa ölkələri) dar ixtisaslı mütəxəssislər hazırlayan istiqamətlər xarakterikdir. Müasir İKT getdikcə daha da mürəkkəbləşir və onların öyrənilməsinə xeyli vaxt və zehni əmək sərf edildiyi üçün bu tendensiya obyektivdir. Buna görə də İKT-ni tətbiq edərkən tədris prosesi çox vaxt səmərəli olmur, təhsilin ümummədəni tərkibi ikinci plana keçir və ona daha az diqqət ayrılır.

Cəmiyyətin müasir üzvünün mədəni simasının, mənəvi və mədəni dəyərlərinin formalaşmasında İKT-nin rolu danılmazdır. Dünyanın bir çox inkişaf etmiş ölkələrində informatika fənnin tədrisi I siniflərdən, bəzilərində isə hətta uşaq bağçalarından başlayır. Məsələn, Böyük Britaniyada bu fənn birinci sinifdə öyrənilir. Şagirdlər əvvəlcə əsas istifadəçi biliklərinə yiyələnir, tədricən yuxarı siniflərdə peşəkarlıq səviyyəsinə qədər təkmilləşdirilir. Cənubi Koreyada ibtidai siniflərdə istifadəçi bacarıqlarına yiyələnir, yuxarı siniflərdə isə fənni daha peşəkar səviyyədə öyrənirlər. Yaponiyada ibtidai siniflərdə sadə bacarıqlar tədris olunur, orta siniflərdə şagirdlər sənəd və cədvəllərlə işləyir, yuxarı siniflərdə isə tətbiqi proqramları dərindən öyrənirlər.

Azərbaycanda ibtidai siniflərdə informatika fənn kurikulumu tətbiq edilmişdir. Şagirdlər yaradıcı cəhətdən inkişaf edir, informasiya ilə işləyir və ən vacibi təhlil bacarıqlarına yiyələnirlər. Məktəblər kompyuterlərlə təchiz edilmiş (Azərbaycanda kompyuter-şagird nisbəti 1/20, Naxçıvan MR-də isə 1/15), İnternetə çıxışı, proyektoru, interaktiv lövhəsi və dərslər müzakirə stolları olan siniflərdə keçirilir.

İKT-nin mənfi xüsusiyyətləri: Hələ də mütəxəssislər arasında bir sıra ziddiyyətli fikirlər mövcuddur. Bu fikirlərə görə təhsildə İKT-nin istifadəsi şəxsiyyətin ümummədəni inkişafına və formalaşmasına mənfi təsir edir. Məsələn, Şəbəkə İKT-nin öyrənilməsi kommunikativ funksiyaya gətirir. Müasir gənclər tədricən insanlarla normal ünsiy-

yətdən və bütövlükdə cəmiyyətdən üz döndərirlər-onu elektron poçt, çat, forum, portal və s. əvəz edir, real həyatdan virtual-elektron həyata keçid başlayır. Bu zaman ünsiyyət tərzi dəyişir, dil sadələşir, əvvəlki ünsiyyət normaları yeni ünsiyyət normaları ilə əvəz olunur, nəticədə fərdiyyətçilik, sonda isə eqoizm kimi problemlər yarana bilər. İnformasiya ilə həddindən artıq yüklənmə insanları stress vəziyyətinə gətirib çıxarır. Belə vəziyyət insan təfəkküründə “informasiya yorğunluğu sindromu” adlanan psixi pozğunluq və xəstəlik yarada bilər. Telekommunikasiya və kompyuter texnologiyalarından istifadə fərdi xüsusiyyətlərin yaranmasına səbəb olur. Elə buna görə də gənclərin sosial fəaliyyəti zəifləyir, onlar cəmiyyətdə baş verən proseslərə, müasir mədəniyyətin problemlərinə biganə yanaşır. Uzun müddət internetlə məşğul olmaq “internetdən asılılıq sindromu”nun əmələ gəlməsinə səbəb olur ki, bunun nəticəsində insan öz hərəkətləri üzərində nəzarəti itirir, sosial izolyasiyaya (insanlarla ünsiyyətdən qismən və ya tamamilə imtina, dostlarından uzaqlaşmaq kimi hallar müşahidə olunur) səbəb olur.

İnternetin geniş yayıldığı ölkələrdə: İsveç-92,9%, Almaniya-82,7%, Cənubi Koreya-82,7%, Böyük Britaniya-84,1%, Yaponiya-80,0%, ABŞ-78,3%, Sinqapur-77,2%, Azərbaycanda isə 70,0%-ə yaxındır.

Mənfi halların qarşısını almaq üçün bəzi ölkələr hökumət səviyyəsində bir sıra tədbirlər həyata keçirirlər. Məsələn, Çin hökuməti internet xəstəliyinin profilaktikası üzrə milli proqram qəbul edib. Bu proqrama əsasən, yeniyetmə və gənclərin internet kafelərə, bar və diskotekalara daxil olması qadağan edilir. Finlandiyada isə həmin xəstəlikdən əziyyət çəkənlər hərbi xidmətə çağırılmır, onlara 3 il möhlət verilir və müalicə olunduqdan sonra hərbi xidmətini davam etdirirlər [2].

Azərbaycanda isə kompyuter oyunlarına meyil güclüdür. Saatlarla uşaqlar, yeniyetmələr və gənclər “İnternet Kulub”larda müxtəlif oyunlara həddindən çox vaxt sərf edirlər. Belə mənfi halların qarşısını almaq üçün müəllimlər və valideynlər, məktəblilər arasında maarifləndirmə işlərinin aparılması vacibdir.

İKT-nin müsbət xüsusiyyətləri:

• peşə təhsilində peşə uyğunlaşmasına səbəb olan və gələcək mütəxəssislərin özlərinin təkmilləşdirilməsinə təkan verən İKT haqqında baza biliklərini vermək;

• insanın ümummədəni tələblərini və maraqlarını artıran və müasir mədəniyyətin daşıyıcısı kimi şəxsiyyətin tam formalaşmasına yönələn yeni konsepsiyalar işləyib hazırlamaq;

• bunun üçün ölkə təhsilində İKT vasitəsilə mütəxəssislərin ixtisasartırma və təkmilləşdirmə sistemini inkişaf etdirmək və distant təhsilin elementlərini tətbiq etmək.

Yuxarıda təklif olunmuş yanaşmada mütəxəssislərin özünütəhsil, ixtisasartırma və təkmilləşdirmə prosesləri ön planda durur. Təhsil sahəsinin informasiyalaşdırılmasının əsas perspektiv istiqaməti müasir telekommunikasiya vasitələri və şəbəkə İKT-nin istifadəsindən ibarətdir. Təhsildə İKT informasiyanın toplanması, saxlanılması, işlənilməsi, təqdimatı, nəticəsi və yayılmasını təqdim edən metodlar toplusudur. Telekommunikasiya-təhsil və bilik üçün güclü vasitədir. Təhsilin telekommunikasiya sisteminə lokal və qlobal şəbəkələrdə təhsili təşkil etmək üçün lazım olan texniki vasitələr, proqram və metodik təminatdan ibarət kompleks kimi baxılır. Telekommunikasiya və şəbəkə informasiya texnologiyalarından istifadə etməklə müəllim və şagirdlər (tələbələr) aşağıdakı əlavə imkanlar əldə edirlər:

1. Ali və orta məktəblərdə, eləcə də özünüöyrənmə sistemlərində fənlərin dərindən öyrənilməsi üçün elmi tədris informasiyaları üzrə verilənlər bankı və biliklər bazasına məsafədən giriş;

2. Tədris müəssisələri, elmi-metodik mərkəzlər, ali və orta məktəblərin hər bir müəllim və tələbələri (şagirdləri) arasında

tədris, elmi və metodiki informasiyaların operativ mübadiləsi;

3. Ölkənin müxtəlif rayonlarından, eləcə də dünyanın bir neçə ölkəsindən gəlmiş müəllim, tələbə və ya məktəblilərin iştirakı ilə telekonfransların, seminarların, mühazirələrin və açıq dərslərin keçirilməsi;

4. Ümumi maraqları olan müxtəlif tədris müəssisələrinin alim, müəllim və tələbə yaradıcı kollektivlərinin elmi-metodik işlərinin təşkili.

Telekommunikasiyalar vasitəsilə tədris prosesinin təşkilinin ən sadə forması təhsil layihələridir. Müxtəlif xarici ölkələrdə telekommunikasiya layihələri tədris prosesinin ayrılmaz hissəsi olmuşdur. Məsələn, “Campus 2000” layihəsi (Kembric Universiteti) peyk rabitəsinin köməyilə Böyük Britaniyanın və digər ölkələrin 2000-ə yaxın məktəbini birləşdirir. Rusiya təhsil prosesində isə telekommunikasiya texnologiyaları 1989-cu ildən tətbiq olunmağa başlanmışdır, bu zaman Sovet-Amerika layihəsi olan “Məktəb elektron poçtu” həyata keçirildi. “Campus 2000” tədris telekommunikasiya şəbəkəsi ilə Moskvada altı məktəb elektron poçt vasitəsilə bir-birilə əlaqə saxlamışlar və daim informasiya mübadiləsi etmişlər. Azərbaycanda təhsil prosesində telekommunikasiya texnologiyalarından istifadə etmək üçün ilk addımlar 2005-ci ildə atılmışdır. Həmin vaxtdan respublikamızın ümumtəhsil məktəblərində İKT-nin tətbiqi proqramının icrasına başlanıldı. Son illərdə İKT-nin tətbiqində, infrastrukturların yaradılması və inkişafında, eləcə də ixtisaslaşdırılmış pedaqoji kadrların hazırlanmasında bir sıra təhsil layihələri və tədbirləri işlənmiş və həyata keçirilmişdir. İKT üzrə pedaqoji kadrların hazırlanması və təkmilləşdirilməsi Təhsil Nazirliyinin həmişə diqqət mərkəzindədir. İKT üzrə hazırlıq kursları mütəmadi olaraq davam etdirilir. Ölkə başçısı tərəfindən təsdiqlənən “2008-2012-ci illərdə Azərbaycan Respublikasında təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı” qeyd olunan məsələlərin səmərəli və kompleks həllinə yönəlib.

Azərbaycan Respublikasının Prezidenti möhtərəm İlham Əliyev 15 yanvar 2013-cü ildə Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2012-ci ilin yekunlarına həsr edilmiş iclasında qeyd etdi ki, MDB ölkələri içərisində (Rusiyadan başqa) ilk dəfə olaraq Azərbaycan 2013-cü ilin fevralında kosmosa özünün birinci milli rabitə peykini buraxacaqdır. Həmin müşavirədə 2013-cü il Azərbaycan Respublikası üçün İKT ili elan edildi. Eyni zamanda qeyd olundu ki, 2013-cü ildə Azərbaycanda bir dənə də olsun qəzalı və təmirsiz məktəb qalmayacaqdır. Bu fikrin arxasında müasir təlim texnologiyaları ilə (kompyuterlərlə, elektron lövhələrlə, multimedia avadanlıqları, proyektorlar, elektron kitabxana və s.) təchiz olunmuş, beynəlxalq standartlara cavab verən, yeni tipli təhsil ocaqlarının yaradılması nəzərdə tutulur. Kosmosa birinci milli rabitə peykinin buraxılması nəticəsində radio-televiziya verilişlərinin keyfiyyəti xeyli yaxşılaşacaq, lokal və qlobal şəbəkələrdə internetdən istifadənin sürəti dəfələrlə artmaqla yanaşı, istifadə qiyməti də xeyli ucuzlaşacaqdır. Təhsil ictimaiyyətinə məlumdur ki, indi təmir olunan və tikilən məktəblər, demək olar ki, tam yenidən qurulur, inkişaf etmiş dünya ölkələrinin məktəbləri səviyyəsində, hətta onlardan da yaxşı vəziyyətdə təqdim olunur.

Bu sahədə Naxçıvan Müəllimlər İnstitutunda da daxili imkanlar hesabına bir sıra faydalı işlər görülmüş və davam etdirilir. Belə ki, institutda yaradılmış “Kurikulum Mərkəzi”ndən, yalnız tələbələr (bakalavrlar, magistrlər) deyil, eyni zamanda, Naxçıvan MR-də çalışan bütün təhsil işçiləri faydalanır. “Kurikulum Mərkəzi”ndə ayrı-ayrı fənlərin tədrisinə aid kurikulumun tələblərinə cavab verən kifayət qədər çap materialları, fənlər üzrə elektron versiyalar (CD-ROM-optik disklərdə) hazırlanmış və təmənnasız olaraq müəllimlərə təqdim edilir.

2013-cü ilin respublikamızda İKT ili elan edilməsi ilə əlaqədar respublikanının bütün infrastrukturlarında, o cümlədən təhsil sistemində də bir sıra müsbət dəyişikliklər müşahidə olunacaqdır. Dünya təcrübəsi göstərir ki, İKT-dən istifadə etməklə qurulan müasir təhsil modeli təhsil işçiləri qarşısında da yeni vəzifələr qoyur. Müəllimlərdən öz ixtisasları sahəsində deyil, həm də yeni nəsil müəllimlərdən tədris etdikləri fənlərin məzmun və məqsədinə uyğun, öyrənənlərin fərdi xüsusiyyətlərini nəzərə almaqla, onların harmonik inkişafını təmin edən müasir təlim texnologiyalarını və İKT vasitələrini seçib tədrisdə səmərəli tətbiq edilməsi tələb olunur.

Tədris prosesinin səmərəliliyinin və effektliliyinin artırılması üçün yeni imkanlar verən telekommunikasiya vasitələrinin tətbiqinin digər forması distant tədris sistemidir. Distant tədris sistemi adi təhsil məsələləri ilə yanaşı, digər məsələləri də kifayət qədər effektiv həll edə bilən, telekommunikasiyalı və kompyuterli təhsil mühitindəki fərdi tədris sistemidir. Distant tədris texnologiyası müəyyən vaxtda müəllimin dəyərli məsləhət və fikirlərinə əsasən bilik massivinin sərbəst və nəzarət olunan istifadəsi prosesində insanla qarşılıqlı əlaqənin üsul, forma və vasitələr toplusudur.

Azərbaycanda distant tədrisin səmərəli istifadəsi şərtlərindən biri də xarici təcrübədən yararlanmaqdır. Xarici ölkələrdə-İngiltərə, ABŞ, Avstraliya, Kanada, Almaniyada beynəlxalq biznesin inkişafı məqsədilə təşkil olunmuş telekommunikasiya infrastrukturunun inkişafı distant tədris şəbəkələrinin inkişafı üçün əlverişli şərait yaradır. Hazırda respublikamızda orta təhsil sistemində distant tədris layihələri işlənib hazırlanmaqdadır. Universitetlərin, kolleclərin və orta təhsil müəssisələrinin hesablama texnikası ilə təchizi, həmçinin ixtisaslaşmış kadrların olması ölkəmizdə tələbə və şagirdlərin distant tədris formasının tətbiqi üçün kifayət qədər zəmin yaradır. Son illərdə dünyanın müxtəlif ölkələrinin universitetləri xarici dilləri öyrənmək üçün qiyabi təhsil və bütün özünütəhsil formaları ilə müqayisədə kompyuter və telekommunikasiya texnologiyalarının istifadəsinə daha çox diqqət ayırmışdır.

Təhsil sahəsində İKT-nin indiki vəziyyəti və perspektiv inkişafından aşağıdakı əsas nəticələr alınır:

1. Azərbaycanda bazar iqtisadiyyatına, demokratik cəmiyyətə keçid, dünya informasiya məkanına daxil olması ilə əlaqədar olaraq baş verən dəyişikliklər təhsil sahəsində müasir və perspektiv İKT–nin tətbiqi üçün əlverişli şərait yaradır. Artıq reallaşmış beynəlxalq təhsil layihələrindən toplanan təcrübə bu istiqamətdəki perspektivliyi göstərir.

2. Bir çox ümumtəhsil və peşə məktəblərinin informasiya və elm mərkəzləri ilə sıx əlaqələrin vacibliyi-bütün bunlar Azərbaycanda elm və təhsildə İKT-nin inkişafına təkan verir.

3. Bu gün kompyuter və televiziya texnikası, CD-ROM optik disklərdə olan tədris proqramları və multimedia texnologiyaları tədris prosesinin effektivliyinin artırılması üçün vasitələrdir.

Müasir telekommunikasiya vasitələrinin inkişafı tədris prosesinin təşkilatçıları və pedaqoqları üçün yeni imkanlar yaradır.

Məlumdur ki, ali təhsilin müxtəlif istiqamətləri var: ali iqtisadi təhsil, ali texniki təhsil, ali tibbi təhsil, ali pedaqoji təhsil, ali aqrar təhsil, ali hüquqi təhsil və s. Bu təhsil istiqamətlərinin ümumi cəhətləri olduğu kimi, xeyli fərqli, spesifik cəhətləri də var. İnkişaf etmiş ölkələrdə bu problemlər xeyli vaxtdır ki, ciddi tədqiq edilir, bu sahədə tədqiqatlara güclü investisiyalar qoyulur. Bu mənada ali təhsilin yalnız bir istiqaməti–ali pedaqoji təhsilin İKT əsaslı innovativ inkişaf problemləri barədə fikrimizi bildirəcəyik. Bu seçim həm də bizim uzun müddət ərzində pedaqoji təhsil müəssisələrində fəaliyyətimizlə bağlıdır. Müasir informasiya

cəmiyyətində tələbə lazımi məlumatı axtarmaq, seçmək, təhlil etmək, yeni informasiya yaratmaq, bu əsasda mövqe formalaşdırmaq, qərar qəbul etmək və qərarı həyata keçirmək kimi səriştələrə yiyələnməlidir.

Bu gün biz nəticəyönümlü, şagirdyönümlü, şəxsiyyətyönümlü təhsildən danışırıq, şagirdlərdə yaradıcılıq, tədqiqatçılıq, təşəbbüskarlıq, məsuliyyətlilik və cavabdehlik, liderlik bacarıqlarının formalaşmasını başlıca məqsədlərdən biri kimi ön plana çəkirik. Əgər bu keyfiyyətlər məktəb rəhbərləri və müəllimlərin hamısında olmazsa, onlar necə reallaşdırıla bilər?! Ümumi təhsilin məzmunu mütəxəssislər tərəfindən müəyyənləşdirilsə də, hər bir müəllim öz fənninin eksperti olmalı, proqramlara da, dərsliklərə də, təhsil prosesinin təşkilinə də yaradıcı münasibət bəsləməyi bacarmalıdır. Müəllimin vəzifəsi, sadəcə olaraq, dərslikdə olanları şagirdlərə (tələbələrə) danışmaq deyildir. Belə olan halda nə müəllim, nə də şagird (tələbə) inkişaf edə bilməz, dərsliklərin əsirinə çevrilərlər. Əsl müəllim bir informasiyanın neçə-neçə müvafiq informasiyalarla zənginləşdirilməsində, müstəqil araşdırma aparmaqla əlavə məlumatların toplanmasında, informasiyaların seçilməsində, zəruri olanların müəyyənləşdirilməsində, aldığı biliklər əsasında öz fikirlərini irəli sürməkdə şagirdlərə (tələbələrə) yardımçı olan, istiqamət verən şəxsdir. "Öyrənməyi öyrətmək" müddəasının əsasını da məhz bu amillər təşkil edir.

Müasir müəllimin əsas funksiyası öyrənənlərə öyrənməyi öyrətməkdir. Bunun üçün müəllim daimi inkişafda olmalıdır. Elmi biliklərin həcmi bu gün sürətlə artır, təhsilin məzmunu fasiləsiz daimi təkmilləşir, yaranan yeni biliklər davamlı olaraq universitet proqramlarına daxil edilir. İKT-nin sürətli inkişafı zaman və məsafəni qısaldaraq uzağı əlçatan edir, dünya sivilizasiyasının biliklərinə yol açır. Bu hal təhsil sahəsində daha çox müşahidə edilir. Bu sürətli inkişaf nəticəsində bu gün əldə edilən biliklər sabah kifayət etmiyə bilər. Çünki biliklər çox sürətlə inkişaf edir və sürətlə də öz mənasını itirə bilər.

UNESCO tərəfindən hazırlanan "XXI əsr üçün təhsil üzrə Beynəlxalq Komissiyanın hesabatının əsas müddəalarında" da bu məsələlərə xüsusi yer ayrılmışdır. Hesabatda deyilir ki, hamı əmin olmalıdır ki, elm və texnikanın cari və gələcək nailiyyətləri, o cümlədən məhsul istehsalında və xidmət sahəsində idrak və qeyri-maddi amillərin artmaqda olan əhəmiyyəti əməyin təşkilatlanması və gələcəyin cəmiyyətdə çalışanların statusuna yeni yanaşmanı zəruri edir. Yeni cəmiyyətin yaradılması üçün müxtəlif texnoloji nailiyyətləri qabaqlamaq lazımdır. Çünki müasir dünyanın dəyişməsi prosesi çox sürətlə baş verir.

Bu deyilənləri nəzərə alaraq belə nəticəyə gəlirik ki, ömürboyu öyrənmək lazımdır. B.e.ə. V əsrdə yaşamış çin filosofu Konfutsinin təbirincə, "təhsildən bəhrələnməyi bacaran millətlər firavan yaşayırlar".

Bu gün lazım gəldikdə öz biliyini təkmilləşdirmək kifayət etmir. Əvvəllər 5 ildən bir ixtisasını təkmilləşdirmək kifayət edirdi. İndi isə bütün peşə sahiblərinin daha tez-tez ixtisaslarını artırması vacibdir. Çünki yeniliklər keyfiyyətli məhsulun əldə edilməsinə daha rahat şərait yaradır.

Təhsil strategiyası şəxsiyyətə yönəlmiş yanaşma əsasında qurulur. Bu prosesin mahiyyətində öyrənən təlimin fəal iştirakçısı olur, müəllim və digər öyrənənlərin qarşılıqlı fəaliyyəti vacibdir. Müəllim və şagird (tələbə) arasındakı ünsiyyəti heç kim və heç bir texnologiya əvəz edə bilməz. Təhsilin müasir texnologiyası məzmunla tədris texnologiyalarının inteqrasiyasını təşkil edir. Bu isə müasir müəllimdən çeviklik, peşəkarlıq, tədrisə yaradıcı yanaşma və öyrənənlərin fərdi xüsusiyyətlərini nəzərə almaqla təlimdə İKT-dən istifadə bacarığı tələb edir. Hər bir şagirddə istedad gizlənə bilər. Müəllimin ustalığı ondadır ki, yalnız strategiyanın köməyi ilə şagirdin istedadını üzə çıxara

bilsin. İstedadı aşkar etmək üçün müəllimin öz peşəsində istedadlı olması prioritetdir.

Tədrisdə İKT-dən düzgün istifadə olunması tədris prosesinə yenilik gətirir, öyrənənin bilik almağa marağını artırır, müəllimin məşğələyə hazırlıq prosesini asanlaşdırır. Şagirdlər əvvəllər fənlərə aid məlumatı dərsliklərdən, sorğu kitabçalarından, dərs vəsaitlərindən, televiziya verilişlərindən alırdısa, bu gün bunları internet, elektron kitab və s. təşkil edir. İKT-dən tədris prosesində elə istifadə etmək lazımdır ki, şagird dərsdə fəal iştirak etsin, öz əməyinin bəhrəsini görsün və onu qiymətləndirə bilsin. Tədris materialını seçərkən sistemlilik, ardıcıllıq, əlçatanlıq, fərqli yanaşma, elmilik kimi əsas didaktik prinsiplərin gözlənilməsi vacibdir. Lakin universitetlərdə tədris materialının öyrənilməsinə ayrılan vaxt məhduddur. Belə vəziyyət tədris prosesində müasir texnologiyalardan, innovativ təhsil metodlarından istifadəni tələb edir. Əgər əvvəllər müəllim əsas informasiya mənbəyidirsə, indi vəziyyət dəyişmişdir. İndi müəllim informasiya mənbələri ilə tələbə arasında vasitəçi funksiyasını yerinə yetirir. O, tələbəyə müxtəlif təyinatlı informasiya mənbələri ilə səmərəli iş metodlarını, informasiya proseslərini öyrətməlidir. Bütün bu xüsusiyyətlər ali təhsilin, o cümlədən pedaqoji təhsilin məzmun və texnologiyasını təkmilləşdirməyi tələb edir. Müasir pedaqoji təhsilin məqsədi informasiya cəmiyyətinin tələblərinə uyğun yeni formatlı müəllim kadrlarını hazırlamaqdır. Bu gün universitetlərimizdə Avropa və dünya təhsil sisteminə inteqrasiya istiqamətində Azərbaycan Respublikasının təhsil sistemində islahatlar üzrə Dövlət proqramları həyata keçirilir. Strategiya və tədbirlər planına uyğun olaraq pedaqoji təhsilin informatlaşması istiqamətində aşağıdakı tədbirlərin həyata keçirilməsi nəzərdə tutulur:

1. Müəllim hazırlığında İKT-nin, yeni təlim üsulları texnologiyalarının tətbiqi.

2. Pedaqoji ixtisaslar üzrə təhsilalan tələbələrin biliyinin cari və yekun qiymətləndirilməsi üzrə yeni üsulların, texnologiyaların İKT vasitəsilə tətbiqi.

3. Pedaqoji təhsil müəssisələrində distant təhsil formasının tətbiqi.

4. Pedaqoji təhsil müəssisələrinin kompyuterləşdirilməsi, elektron təhsilin həyata keçirilməsi.

Göründüyü kimi, “Fasiləsiz pedaqoji təhsil, müəllim hazırlığının konsepsiya və strategiyası”nın tədbirlər planında pedaqoji təhsilin informatlaşması istiqamətində əhəmiyyətli layihələr nəzərdə tutulmuşdur. Bu layihənin həyata keçirilməsi üçün lazımi maliyyə dəstəyi olmalıdır. Müqayisə üçün bildirək ki, Qonşu Rusiya və Türkiyədə anoloji innovativ layihələr üçün hər bir universitetə ildə 2-8 milyon ABŞ dolları həcmində investisiya qoyulur, həmin universitetlərin inkişafının əsas səbəblərindən biri məhz investisiya siyasətidir. Bazar münasibətləri şəraitində təhsil siyasətinin mühüm hissəsi səmərəli investisiya siyasətinə bağlıdır, əgər investisiya təhsilin keyfiyyətini yüksəltmirsə, deməli, səmərəsizdir. İnformasiya cəmiyyəti şəraitində təhsilə qoyulan investisiya əsasən innovasiyalara, nəticə etibarilə təhsilin keyfiyyətinin yüksəldilməsinə xidmət etməlidir (yəni investisiyalar maddi obyektlərə yox, qeyri-maddi obyektlərə, elmtutumlu məhsullara yönəlməlidir). Pedaqoji təhsilin İKT əsasında innovativ inkişaf layihələrinin hazırlanması və icrası zəruri maliyyə dəstəyi olmasa mümkünsüzdür. Bu, müasir tələblərə cavab verən müəllim kadrlarının hazırlanması üçün zəruridir. Tələbələrin biliklərinin qiymətləndirilməsində bir çox qabaqcıl dünya universitetlərində uğurla tətbiq edilən “Elektron-test sistemi” layihəsi hazırlanıb müvəffəqiyyətlə sınaqdan çıxarılıb və bu gün də uğurla tətbiq edilir. XXI əsrin ən böyük təhsil innovasiyası olan distant tədrisin respublikamızda reallaşması öz müsbət həllini tapmaqdadır. “Fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının konsepsiyası və strategiyası” müvafiq tədbirlər planına uyğun olaraq respublikamızda distant

pedaqoji təhsil sisteminin inkişafına ciddi ehtiyac vardır. Bu gün əksər ölkələrdə, o cümlədən bir çox MDB ölkələrində müəllimlərin ilkin hazırlığı, yenidənhazırlığı və ixtisasartırması distant tədris texnologiyaları vasitəsilə reallaşır. Digər mühüm məsələ pedaqoji təhsil üçün elektron tədris resurslarının hazırlanmasıdır. Pedaqoji ixtisasların spektri və tədris planında olan fənlərin müxtəlifliyi, Boloniya prosesinə keçidlə əlaqədar tələbələrin müstəqil işlərinin xüsusi çəkisinin artması bunu tələb edir. Təhsilin informatlaşması elə bir prosesdir ki, burada beynəlxalq təcrübə çox fayda verə bilər. Lakin bu təcrübəni olduğu kimi respublikada tətbiq etmək mümkün deyil, burada zaman, məkan və imkan amilləri nəzərə alınmalıdır.

Klassik pedaqogikadan elektron pedaqogikaya, real pedaqogikadan virtual pedaqogikaya keçidin, kağız üzərində olan dərslik və testlərdən elektron dərslik və testlərə keçidin pedaqoji problemlərini tətbiq etmək vaxtıdır. Bu prosesdə təcrübəli pedaqoqlara, gənc tədqiqatçıların birgə fəaliyyətinə, elmi ənənələrə, innovasiyaların sintezinə ehtiyac var.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müntəzəm diqqət və qayğısı nəticəsində təhsil sisteminin maddi–texniki və tədris bazasının, bütövlükdə infrastrukturunun yenidən qurulması istiqamətində genişmiqyaslı böyük işlər görülmüşdür və həmin proses uğurla davam etməkdədir. Möhtərəm Prezidentimiz tərəfindən həyata keçirilən bütün bu tədbirlər təhsilin keyfiyyətinin yüksəldilməsində xüsusi əhəmiyyətə malik stimul olmaqla bərabər, təhsil idarəetmə orqanlarının və məktəb rəhbərlərinin, müəllimlərin səy və əzmkarlığının, məsuliyyət mədəniyyətinin, müasir tələblərə uyğun peşəkarlığın artırılmasını zəruri edir. Hazırkı dövr üçün taleyüklü sayılan həmin vəzifələrin reallaşdırılması başlıca məqsədlərdən biri kimi növbəti illərdə fəaliyyətimizin əsasını təşkil edəcəkdir.

*Rəyçi: dos. İ.Əhmədov*

**İstifadə edilmiş ədəbiyyat**

1. İlham Əliyevin Türkiyə Respublikasının Antalya şəhərində 2006-cı ildə keçirilən “Türkdilli Dövlətlərin və Topluluqların X Dostluq, Qardaşlıq və Əməkdaşlıq Qurultayı”ndakı nitqi.
2. Əliquliyev R., Mahmudova R. Şəxsiyyətin informasiya mədəniyyətinin formalaşdırılmasında təhsil sisteminin vəzifələri. // Azərbaycan məktəbi, № 2, 2012, s. 31-38.
3. Rahmankulova S. Texnologiya və informatika fənlərinin tədrisi sahəsində müasir beynəlxalq tendensiyalar. // Kurikulum, № 2, 2012, s. 21-26.
4. Məmmədov T. Təhsildə İKT. Naxçıvan: Əcəmi, 2011.
5. Гершунский В. Компьютер в зале сферы образования. М:, 1987.

**Т.Мамедов**

**Современные информационные технологии и средства в образовании**

**Резюме**

Статья посвящена современным информационным технологиям и средствам образования.

**T.Mammadov**

**Modern information technologies and resource in education**

**Summary**

The article is dedicated to modern information technologies and resources in education.

***Dilimiz, mənəviyyatımız***

# AZƏRBAYCAN DİLİ MƏNŞƏCƏ MÜASİR TÜRK DİLLƏRİNƏ MƏXSUSDUR

**Buludxan Xəlilov**
***filologiya elmləri doktoru, professor***

Azərbaycan dili öz mahiyyətinə görə dünyanın ən zəngin milli dillərindən biridir. Təsadüfi deyildir ki, ölkəmizin təhsil müəssisələrində Azərbaycan dili və onun tarixinin öyrənilməsinə xüsusi diqqət yetirilir. Azərbaycan dili qədim dövrlərdən başlayaraq bir sıra dillərlə qarşılıqlı əlaqədə olmuşdur. Hazırda dünyanın 90-a yaxın ölkəsində bu dildə danışanlar var. Ana dili kimi Azərbaycan dilində 50 milyona yaxın adam danışır. Bu dil mənşəcə türk dilləri qrupuna məxsusdur.

Türk dillərinin coğrafi əlamətlər (M.Kaşğari, V.A.Boqoroditski, İ.N.Berezin, V.V.Radlov, F.Y.Korş, L.Ligeti və başqaları), coğrafi – fonetik – qrammatik əlamətlər (A.N.Samoyloviç), tarixilik baxımından (S.Y.Malov), fonetik, leksik-qrammatik fərqlərin türk xalqlarının tarixi ilə əlaqəsini nəzərə almaqla (N.A.Baskakov) mövcud olan təsnifləri türkologiyada öz əksini tapmışdır. Bu cür təsniflərin hər biri uzun müddət türkoloqların diqqətindən də kənarda qalmamışdır.

Azərbaycan dili tipoloji təsnifə görə iltisaqi dillərdəndir və genealoji bölgüyə əsasən türk dilləri qrupuna mənsubdur.

Elmi ədəbiyyatda türk dillərinin təsnifi zamanı əsasən aşağıdakı prinsiplər nəzərə alınmışdır:

a) etnik-genealoji-mənşə əlamətlər prinsipi;

b) tarixi inkişaf prinsipi;

c) coğrafi ərazi prinsipi.

Etnik-genealoji-mənşə əlamətlər prinsipi əsasında türk dillərini B.Çobanzadə, Y.Nemet, L.Ligeti, G.Dörfer, F.Zeynalov və başqaları təsnif etmişdir.

Tarixi inkişaf prinsipi ilə türk dillərini S.Y.Malov, N.A.Baskakov, K.Qrenberq, Təhsin Banquoğlu və digərləri təsnif etmişdir.

Coğrafi ərazi prinsipləri ilə türk dillərini V.V.Radlov, F.Y.Korş, A.N.Samoyloviç (həm də fonetik əlamətləri nəzərə almışdır), V.A.Boqoroditski, V.Şott, Q.Ramstedt, K.Menqes və başqaları təsnif etmişdir.

Bu prinsiplər üzrə aparılan təsniflərin heç birində vahid bir prinsip gözlənilə bilməmişdir. Odur ki, bu təsniflərin hər birində digərlərinə də yer verildiyi, istinad olunduğu müşahidə olunur. Məsələn, etnik-genealoji-mənşə əlamətləri prinsipində coğrafi ərazi prinsipindən, tarixi inkişaf prinsipində etnik-genealoji-mənşə və coğrafi əlamətlər prinsipindən, eləcə də coğrafi əlamətlər prinsipində etnik-genealoji-mənşə və tarixi inkişaf prinsipindən uzaqlaşmaq mümkün olmamışdır.

XI əsrdə Mahmud Kaşğari türk tayfalarını dörd qrupa bölmüşdür: 1) peçeneq; 2) qıpçaq, oğuz, yemek, başqırd, basmıl, qay, yabaqu, tatar, qırğız; 3) çıqıl, tuxsi, yağma, iqraq, çaruq, çumul, uyğur, tanqut, xatay; 4) tabğac.

İ.N.Berezin 1848-ci ildə türk dillərini aşağıdakı kimi təsnif etmişdir:

I. Cığatay və ya Şərqi Türküstan dialektləri: uyğur, kuman, cığatay, özbək, türk-

mən, Kazan tatarları.

II. Tatar və ya cənub (qıpçaq) dialektləri: qırğız, başqırd, qumuq, qaraçay, mişar, noqay, Sibir tatarları.

III. Türk və qərb dialektləri: Dağıstan, Azərbaycan, Krım, Anadolu, Kiçik Asiya, Rumeli, Konstantinopol.

V.V.Radlov 1881-ci ildə türk dillərini belə təsnif etmişdir:

I. Şərq qrupu: Altay, teleut, Abakan, koybol, qızıl, tölös, beltir, barabin, küyerik, çulum, tuba, qaraqaş, uryanxay (tuva), karaim, uyğur dilləri.

II. Qərb qrupu: qırğız, qaraqalpaq, başqırd, Volqaboyu tatarları, noqay dilləri.

III. Orta Asiya qrupu: Tarançin, Hami, Aksu, Kaşğar, Yarkənd, Sart, Kokant, Zərəfşan özbəkcəsi, Buxarada və Xivədə yaşayan türklərin dilləri.

IV. Cənub qrupu: Türkmən, qumuq, Qaraçay, balkar, Azərbaycan, türk (Anadolu və Rumeli dialektləri), qaqauz və Krım tatarlarının dilləri.

A.N.Samoyloviç 1922-ci ildə türk dillərinin təsnifini aşağıdakı kimi göstərmişdir:

I. R qrupu: çuvaş, bulqar dilləri.

II. D qrupu: uyğur və ya şimal-şərq qrupu. Bu qrupa üç dil ailəsi daxil edilmişdir: t qrupu-yakut, d qrupu-soyon, qarakas, uryanxay, salar, Orxon-uyğur, z qrupu-koybol, kamsin, sarı uyğur, saqay, küyerik, kaça, beltir, şor, qızıl.

III. Tay qrupu-qıpçaq və ya şimal-şərq dilləri: Altay, qırğız, qumuq, qaraçay-balkar, karaim, tatar, başqırd, qazax, noqay dilləri.

IV. Tağlıq qrupu-cığatay və ya cənub-şərq dilləri: Şərqi Türküstan, özbək, qara tatarlar.

V. Tağlı qrupu – qıpçaq-türkmən və ya orta qrup: Xarəzm özbəklərinin dialektləri.

VI. Ol qrupu – türkmən və ya cənub-qərb qrupu dilləri: Azərbaycan, türkmən, türk, qaqauz dilləri.

B.Çobanzadə türk dillərinin təsnifini belə qruplaşdırmışdır: 1) yakut; 2) altay; 3) teleut; 4) kumandin; 5) yenisey türkləri; 6) uryanxay; 7) barabin; 8) qırğız; 9) noqay; 10) qumuq; 11) qaraçay; 12) başqırd; 13) sart; 14) özbək; 15) türkmən; 16) osmanlı; 17) tatar; 18) Azərbaycan; 19) çuvaş; 20) hun dilləri.

S.Y.Malov 1951-ci ildə türk dillərini dörd qrupa bölmüşdür:

I. Ən qədim türk dilləri: bulqar, uyğur (sarı uyğurlar), çuvaş, yakut dilləri.

II. Qədim türk dilləri: oğuz (qədim türk runik yazısı), tofa, tuva, uyğur (qədim uyğur yazısı), xakas, şor.

III. Yeni türk dilləri: Azərbaycan, qaqauz, kumandin, qıpçaq, peçeneq, poloves, salar, türk, türkmən, uyğur (Çin və ya Şərqi Türküstanın müsəlman uyğurları), özbək, cığatay, çulum.

IV. Ən yeni türk dilləri: başqırd, qazax, qaraqalpaq, qırğız, qumuq, noqay, oyrot (dağlıq Altay), tatar (Kazan, Kasimov, Mişar, Qərbi Sibir), çuvaş, yakut.

F.Zeynalov, demək olar ki, türk dillərinin təsnifini qəbilə-tayfa-xalq qaynayıb-qarışmasından sonra türk millətlərinin formalaşdığı zəmində vermişdir. Onun təsnifində türk dillərinin hər biri, demək olar ki, fonetik, leksik-qrammatik cəhətdən özünəməxsus ümumiləşdirici əlamətlər əsasında qruplaşmışdır. Türk dillərinin heç biri kənarda qalmamışdır. Onun təsnifində uzun illərdən sonra formalaşmış türk millətlərinin təbii olaraq ədəbi dilləri zəminində problemin həllinə nail olunmuşdur. Ona görə də F.Zeynalovun təsnifi daha ümumiləşdirici, eyni zamanda türk dillərini səciyyələndirən bölgüdür. F.Zeynalov türk dillərini aşağıdakı kimi təsnif etmişdir:

I. Oğuz qrupu – Azərbaycan, türkmən, türk, qaqauz, Krım-tatar dilləri;

II. Bulqar qrupu – tatar, başqırd, qaraçay-balkar, qumuq, karaim dilləri;

III. Qıpçaq qrupu – qazax, qaraqalpaq,

qırğız, altay, noqay dilləri;

IV. Karluq-uyğur qrupu – özbək, yeni uyğur, sarı uyğur, salar dilləri;

V. Uyğur-oğuz qrupu – tuva, karakas, xakas, komandin, şor, kuyerik, tobol, barabin dilləri;

VI. Çuvaş dili;

VII. Yakut dili;

Bu bölgünü bir az dəqiqləşdirməli olsaq, onda türk dillərinin təsnifini aşağıdakı kimi vermək daha məqsədəuyğundur:

Oğuz qrupu dilləri: Azərbaycan dili, türk dili, türkmən dili, qaqauz dili, Axısqa (Mesxeti) türklərinin dili, Balkan türklərinin dili.

Qıpçaq qrupu dilləri: Qazax dili, qaraqalpaq dili, qırğız dili, altay dili, noqay dili, Krım-tatar dili.

Bulqar qrupu dilləri: Kazan-tatar dili, başqırd dili, qaraçay-balkar dili, qumuq dili, karaim dili.

Karluq-uyğur qrupu dilləri: Özbək dili, yeni uyğur dili, sarı uyğur dili, salar dili.

Uyğur-oğuz qrupu dilləri: Tuva dili, tofalar (karaqas) dili, xakas dili, şor dili, Barabin tatarlarının dili, Çulım tatar dili.

Çuvaş və yakut dilləri: Çuvaş dili, yakut dili.

Coğrafi əlamətlər əsasında türk dillərini alman dilçisi V.Şott iyirmi bir qrupa, fin alimi Q.Ramstedt (1917-ci ildə) altı qrupa bölmüşdür. Türk dillərini coğrafi əlamətlər əsasında macar tədqiqatçısı L.Ligeti (1911) də təsnif etmişdir.

Türk dillərinin tarixilik baxımından təsnif olunmasında Qrönberq heç də az rol oynamamışdır. O, türk dillərini üç qrupda cəmləşdirmişdir:

1) Qədim türkcə: Orxon (göy türklər), uyğurlar;

2) Orta türkcə: Kaşğar (Qaraxanlı), cığatay, kuman, qədim osmanlı.

3) Yeni türkcə: cənub türkləri (osmanlı, Azərbaycan, türkmən), qərb türkləri (özbək, Xivə türkləri), şərq türkləri (Kaşğar, komul, Turfan, tarancı), şimal türkləri (altay, Abakan, soyon, uryanxay), qıpçaq türkləri (qırğız, Kazan tatarları, başqırd, karaim).

Türk dillərinin təsnifində Banquoğlu, R.Arat və Menqesin də zəhməti olmuşdur.

Alman tədqiqatçısı Q.Dörferin bölgüsü də diqqəti cəlb edir. O, Azərbaycan dilinin bir şivəsi olan xalaçcanı (İranda yaşayan) türk dillərinin müstəqil qolu hesab edir.

Dörfer türk dillərini belə qruplaşdırır:

1) Çuvaş dili, 2) Yakut dili, 3) Oğuz qrupu dilləri, 4) Qıpçaq qrupu dilləri, 5) Uyğur qrupu dilləri, 6) Cənubi Sibir türk dilləri qrupu, 7) Xalaç qrupu.

Türk dillərinin yayıldığı areallar üzrə də təsnifi olmuşdur. Məsələn, türk dillərinin cənub-qərb arealı: Azərbaycan dili, türk dili, türkmən dili, qaqauz dili, krım-tatar dili; türk dillərinin cənub-şərq arealı: özbək dili, uyğur dili, qazax dili, qırğız dili, qaraqalpaq dili; türk dillərinin şimal-qərb arealı: tatar dili, başqırd dili, karaim dili, çuvaş dili; türk dillərinin Şimali Qafqaz arealı: noqay dili, kumık dili, qaraçay-balkar dili; türk dillərinin Sibir arealı: altay dili, tuva dili, xakas dili; türk dillərinin Uzaq Şərq arealı: yakut dili.

Türk dillərinin tədqiqi və öyrənilməsində müxtəlif ölkələrin türkoloqlarının böyük rolu olmuşdur. Bunların ən xarakteriklərinin adını və əsərlərini, hansı ölkənin türkoloqları olmalarını xüsusi olaraq nəzərdən keçirmək lazımdır. Bu mənada türk dillərinin öyrənilməsində Rusiya türkoloqlarının xidməti danılmazdır. Rusiyada bu istiqamətdə olan işlər XVIII əsrdən başlanmışdır. XVIII əsrdə türk dillərinə aid olan abidələrin tədqiqində İ.T.Stralenberqin, Q.Millerin, İ.Fişerin böyük zəhməti olmuşdur. XIX əsrdən başlayaraq Rusiyada türk dillərinin qrammatik quruluşunun tədqiqi ilə bağlı xeyli araşdırmalar aparılmışdır. Məsələn, İ.Qiqanovun “Tatar dilinin qrammatikası”

(Kazan, 1801), M.Kazım bəyin “Türk-tatar dilinin qrammatikası” (Kazan, 1839; 1846), P.Melioranskinin “Qazax-qırğız dilinin qısa qrammatikası” (I, II, SPB., 1894-1897) və s. əsərlər xüsusi əhəmiyyət daşımışdır. XIX əsrdə lüğətşünaslıq sahəsində V.V.Radlovun yazdığı dörd cildlik “Опыт словаръя тюркских наречий” əsəri ən qiymətli əsər kimi türkologiya sahəsində mühüm yer tutmuşdur. XX əsrdə də Rusiyada türk dillərinə aid çox böyük işlər görülmüşdür. Ancaq bunların sırasında lüğətçiliklə bağlı olan N.Aşmarinin (“Словаръ чувашского языка”) lüğətini və “Древнетюркский словаръ” lüğətini xüsusi olaraq qeyd etmək lazımdır.

Yeri gəlmişkən qeyd edək ki, XX əsrdə türk dillərinin tarixi, türk dillərinin fonetikası, leksikası, dialektologiyası, qrammatik quruluşu sahəsində aparılmış tədqiqatlarda milli türkoloqların böyük xidmətləri olmuşdur.

Türk dillərinin, türkoloji məsələlərin öyrənilməsinə Almaniyada (V.Banq, K.Brokelman, Barbara Fleminq, Q.Dörfer və s.), Rumıniyada (V.L.Drimba, A.Cəfər, İ.Ziyəddin və s.), Polşada (A.Zayonçkovski, T.Kovalski və s.), Macarıstanda (Y.Nemet, L.Ligeti, L.Roşani və s.), Bolqarıstanda (Q.Qılıbovun, M.Mollova və s.), Türkiyədə (R.Arat, B.Atalay, O.A.Aksoy, N.Orkun, Təhsin Banquoğlu, Məhərrəm Ergin və s.), Finlandiyada (M.Kastren, Q.İ.Ramstedt, M.Resenen və s.) güclü maraq olmuşdur. Bundan başqa, türk dilləri, türkologiya məsələləri Yaponiyada, İsveçdə, Norveçdə, Fransada, Danimarkada, İtaliyada, Pakistanda, Amerikada, İngiltərədə, Avstriyada və digər yerlərdə tədqiq olunur.

**İstifadə edilmiş ədəbiyyat**

1. Zeynalov F. Türkologiyanın əsasları. Bakı: Maarif, 1981.
2. Baskakov H. Тюркские языки. Москва, 1960.
3. Qurbanov A. Türkoloji dilçilik. Bakı, 1993.
4. Cəfərov N. Türkologiya tarixinə ümumi bir baxış. Bakı, 2000.
5. Qurbanov A. Dünyanın dil ailələri. Bakı, 1994.
6. Xəlilov B. Türkologiyanın intibah dövrü. Bakı, 2001.
7. Xəlilov B. Türkologiyaya giriş. Bakı, 2013.
8. Yusifov M. Türkologiyaya giriş. Bakı, 2001.

**Б.Халилов**

**Азербайджанский язык относится к тюркской группе языков**

**Резюме**

В статье говорится о том, что азербайджанский язык действительно относится к тюркской группе языков, приводятся основательные доказательства.

**B.Khalilov**

**The etimology of Azerbaijan language belongs to modern Turkish languages**

**Summary**

In the article it is noted that Azerbaijan language belongs to the Turkish languages groups and some arguments are shown.

***Ali təhsil ocaqlarımız***

# ŞƏRƏFLİ YOL KEÇMİŞ TƏHSİL OCAĞI

**Qasım Məmmədov**
***ADNA-nın tərbiyə işləri üzrə prorektoru***

Azərbaycan Dövlət Neft Akademiyası şərəfli bir yol keçmişdir. Onun fəaliyyəti yarandığı gündən respublikanın iqtisadi həyatı ilə sıx bağlı olmuşdur. Belə bir təhsil ocağının yaranması dövrün, zamanın tələbi idi. Neft diyarı olan Azərbaycanda neft institutunun olmasına ciddi ehtiyac duyulurdu.

Əcnəbilərin işğalı dövründə Azərbaycanın neft sənayesinə ciddi zərər dəymişdi. 1913-cü ildə istismarda 3000 quyu olduğu halda 1920-ci ildə onların sayı 800-dən az olmuş, hasilat isə 1913-cü il səviyyəsindən (7609 min ton) 1920-ci ildə 2915 min tona qədər azalmışdı. Yeni qurulmuş sovet hökumətinin Azərbaycanın neft sənayesinin ehtiyatlarının işlənməsinə böyük ehtiyacı var idi. Ona görə də 1918-ci ilin iyununda Moskvada imzalanmış dekretlə neft sənayesi milliləşdirilmiş, onun bərpası və inkişafı üçün xüsusi plan tərtib olunmuşdu. Bu işlər isə genişmiqyaslı yenidənqurma və modernizasiya tədbirlərinin həyata keçirilməsini tələb edirdi. Belə məsələlərin həlli isə öz növbəsində yüksəkixtisaslı mütəxəssis kadrların hazırlanmasını respublikanın həyatında həlli vacib olan əsas problemə çevirmişdi. Məhz bu səbəbdən neft sənayesini mühəndis kadrlarla təmin edəcək ali təhsil müəssisəsinin yaradılması 1920-ci ilin mayın 20-də xüsusi komissiyanın gündəliyinə çıxarılmışdı.

14 noyabr 1920-ci ildə Azərbaycan İnqilab Komitəsi "Bakıda Politexnik İnstitutunun yaradılması haqqında" dekreti qəbul etmişdir.

İnstitutun Elmi Şurasının birinci iclası 15 dekabr 1920-ci ildə professor N.A.Dubrovskinin sədrliyi altında aparılmışdır. İclasda S.Vəkilov Elmi Şuranın katibi seçilmişdir.

1920/1921-ci tədris ilində institutda 1135 tələbə oxumuşdur. 15 dekabr 1922-ci ildə rəhbər partiya orqanları instituta kömək haqqında qərar çıxarmış və "Azneft" birliyinə institutun binasının və otaqlarının təmirini həyata keçirməyi təklif etmişlər. Daha sonra iri sənaye müəssisələri tələbələrin təqaüd fonduna yardıma cəlb olunmuşdur. Təsdiq olunmuş 475 təqaüddən 150-ni "Azneft" öz üzərinə götürmüşdür. 1920-1930-cu illərdə institutun məzunları içərisində 10 nəfəri, 1931-1932-ci illərdə 121 nəfəri, 1932-1936-cı illərdə 160 nəfəri azərbaycanlı olmuşdur. Fəaliyyətinin 15 ili ərzində 2614, sonrakı 5 ildə isə 2696 nəfər mühəndis kadrlarının hazırlanması institutun sürətlə inkişaf etdiyini sübut edirdi.

1930-1940-cı illərdə 1140 nəfər azərbaycanlı mühəndis diplomu almışdır. Bu institutu ilk qadın 1931-ci ildə, ilk azərbaycanlı qadın isə 1933-cü ildə bitirmişdir. 1940-cı ildə institutda 843 qadın oxumuş, onlardan 130-u azərbaycanlı olmuşdur.

Ölkəmizdə sənayenin tələblərinə müvafiq olaraq bir neçə adda fəaliyyət göstərmiş ali məktəbimiz müstəqillik dövründən - 1992-ci ildən Azərbaycan Dövlət Neft Akademiyası adlandırılmışdır.

Təhsil ocağımız, ulu öndərimiz Heydər Əliyevin sözləri ilə desək, Respublikamızda hal-hazırda fəaliyyət göstərən Azərbaycan Texniki Universiteti, Azərbaycan Memarlıq və İnşaat Universiteti, Azərbaycan Dövlət Aqrar Universiteti, Sumqayıt

Dövlət Universiteti və Mingəçevir Politexnik İnstitutunun yaranmasında ana rolu oynamışdır.

Yarandığı gündən Neft Akademiyası yanacaq-enerji və neft-kimya kompleksi sahələri üçün yüksəkixtisaslı mühəndis və elmi kadrların hazırlanması istiqamətində daima fəaliyyət göstərmiş, təhsil prosesinin, elmi-tədqiqat işlərinin təşkilində uğurlar qazanaraq SSRİ-nin qabaqcıl ali təhsil müəssisəsinə çevrilmişdir.

Neft Akademiyası keçmiş İttifaqda, respublikamızda, xarici ölkələrdə, yüksək dövlət vəzifələrində, sənaye, elm və təhsil sahələrində aparıcı yer tutan, tədris ocağımızı dünyaya tanıtdıran məzunları ilə fəxr edir.

Ümummilli liderimizin 2 il burada təhsil alması Neft Akademiyasının tarixində şanlı və əbədi iz qoymuş, onu məbədgaha çevirmişdir. Onun "Neft Akademiyasının Azərbaycanda sənayenin, iqtisadiyyatın, elmin, elmi-texniki tərəqqinin inkişafında xüsusi rolu olmuşdur" sözlərini yada salmaq yerinə düşər.

30 ilə qədər SSRİ Neft Sənayesinə və Dövlət Plan Komitəsinə rəhbərlik etmiş, həmyerlimiz Nikolay Baybakov, SSRİ Qaz Sənayesi naziri, Sosialist Əməyi Qəhrəmanı Sabit Orucov, Rusiyanın bir çox rayonlarında neft-qaz yataqlarını kəşf edən, Sosialist Əməyi Qəhrəmanı Fərman Salmanov, Hindistan neftinin atası sayılan, 3 dəfə SSRİ dövlət mükafatı laureatı alan Əyyub Tağıyev, kosmonavt Vitaliy Jolobov, Anqolanın Prezidenti Duş Santuş, "Lukoyl" şirkətinin Prezidenti Vahid Ələkbərov, Sovetlər İttifaqında kosmik uçuşlar üzrə dövlət komissiyasının sədri, general-leytenant, Sosialist Əməyi Qəhrəmanı Kərim Kərimov və yüzlərlə görkəmli dövlət və ictimai xadimlər, alimlər məhz bizim təhsil ocağımızı bitirmişlər.

ADNA-da kadr hazırlığı aparılan bütün ixtisaslara maraq və tələbat yüksək səviyyədədir. Cari tədris ilində bir çox ixtisaslar üzrə qəbul olan tələbələrin əksəriyyəti dövlət sifarişi əsasında təhsil alırlar. Bu göstərici bir tərəfdən, ali məktəbin reytinqini müəyyən edirsə, digər tərəfdən dövlət vəsaitini məqsədəuyğun şəkildə sərf etməyə sövq edəcəkdir.

Respublika Prezidentinin 22 may 2009 - cu il tarixli sərəncamı ilə "2009-2013-cü illərdə Azərbaycan Respublikasının ali təhsil sistemində islahatlar üzrə Dövlət Proqramı"nın təsdiq edilməsi təhsilin dövlət siyasətində ən mühüm prioritet olmasını bir daha sübut etmişdir. Hal-hazırda ADNA qarşısında duran əsas məsələ təhsilimizin Avropa təhsil məkanına inteqrasiya prosesinin, Boloniya Bəyannaməsinin tələblərinin yerinə yetirilməsi sahəsində işlərin sürətləndirilməsidir.

ADNA-nın beynəlxalq əlaqələrinin genişlənməsi məzunlarımızın dünya təhsil standartlarına uyğun hazırlanmasına imkan verməklə yanaşı, həm də məntiqi nəticə olaraq, ali məktəbimizi nəinki Azərbaycan vətəndaşları, eləcə də Çin, Türkiyə, Misir Ərəb Respublikası və digər xarici ölkə vətəndaşları üçün də cəlbedici edir. Bu kontekstdə qeyd etmək olar ki, hal-hazırda ADNA-da 500-dən artıq əcnəbi tələbə təhsil alır ki, bu da yüksək keyfiyyətli təhsil almaq məqsədilə Azərbaycan ali məktəblərini seçmiş əcnəbi tələbələrin 15%-dən çoxunu təşkil edir.

Bundan başqa, ADNA-da hər il beynəlxalq və milli şirkətlərin, qurumların onlarla əməkdaşı iki həftədən tutmuş bir il müddətinədək xüsusi kursların təlim proqramları əsasında öz ixtisaslarını artırırlar. Bizim tərəfimizdən onlar üçün bir sıra ixtisaslar üzrə mütəxəssislərin distansiya təliminə, bazar tələbatına uyğun, ixtisaslarının artırılmasına imkan verən metodik, proqram və texniki baza yaradılmışdır.

Ali məktəbimizin beynəlxalq əlaqələri "Əsrin müqaviləsi" ilə başlayan neft sazişləri imzalandıqdan sonra daha geniş vüsət al-

mışdır. Son illərdə ABŞ, Almaniya, Hollandiya, Fransa, İtaliya, Çin, Norveç, Rumıniyanın aparıcı tədris mərkəzləri ilə bir sıra beynəlxalq layihələr reallaşmışdır. Onların arasında 1999-cu ildən ABŞ-ın Corciya ştatının Dövlət Universiteti ilə realizə edilmiş bakalavr və magistr hazırlıq layihəsi, həmçinin 2004-cü ildən başlayaraq Almaniyanın Zigen Universiteti ilə birgə bakalavrların yeni texnologiya üzrə hazırlanması daha önəmlidir. Bu tədris layihələri çərçivəsində təhsil ingilis dilində və kredit sistemi əsasında aparılır. Məmnunluqla qeyd etmək olar ki, ADNA Azərbaycanın ilk ali təhsil ocağıdır ki, Zigen Universiteti ilə məzunlara birgə diplomların verilməsini razılaşdırmışdır.

Bundan başqa, 1999-cu ildən başlayaraq Sofiya-Antipolis (Fransa, Nitsa şəhəri) və Qenuya (İtaliya) universitetləri ilə birgə "Ətraf mühit və neft sənayesi" üzrə magistr pilləsində mütəxəssis hazırlığı aparılır. 2004-cü ildən Köln Universiteti və Hollandiyanın Heyerlen Ali Tətbiqi Məktəbi ilə birgə bakalavr hazırlığı, 2008-ci ildən başlayaraq isə "Avtomatlaşdırma və informasiya texnikası" və "Elektroenergetika" ixtisasları üzrə magistr pilləsində mütəxəssis hazırlığı həyata keçirilir. Köln Universiteti və Varşava Texnologiya Universiteti ilə birlikdə qərb standartlarına uyğunlaşan tədris planları əsasında "Neft sənayesində energetika menecmenti" ixtisası üzrə magistr hazırlığına başlanmışdır.

Yuxarıda qeyd olunan proqramlar çərçivəsində tələbələrimizin ABŞ, Almaniya və Fransanın müvafiq universitetlərində istehsalat təcrübəsi keçməsi və yuxarı kurslarda təhsillərini davam etdirməsi üçün razılaşma əldə olunmuşdur.

Hal-hazırda Azərbaycanda fəaliyyət göstərən beynəlxalq şirkətlərlə tədris, elm sahələrində əməkdaşlıq edilir, tələbələrimizə təqaüd verilir, onlar bu təşkilatların aparıcı neft və qaz sənayesi obyektlərində təcrübə keçir və şirkətlər məzunları işlə təmin edirlər.

ADNA respublikamızın neft-qaz sənayesi müəssisələri ilə sıx əməkdaşlıq edir. Bu əməkdaşlıq I və III kurs tələbələri üçün yay aylarında həmin müəssisələrdə tədris və istehsalat təcrübələrinin təşkil edilməsində əyani şəkildə görünür. Qeyd etmək lazımdır ki, müəssisələr tərəfindən tələbələrə təcrübə keçməkdə hər bir şərait yaradılır, onlar lazımi normativ-texniki sənədlərlə təmin edilirlər.

Bundan başqa, təhsildə yüksək göstəricilərə nail olmuş ADNA tələbələrinə respublikamızın neft-qaz sənayesi müəssisələri, ölkəmizdə fəaliyyət göstərən xarici şirkətlər – "LUKOYL", BP, "KCA Deutag", ARDNŞ, "Neftqazavtomat" ETİ, Heydər Əliyev adına Bakı Neft Emalı Zavodu və b. xüsusi və adlı təqaüdlər verilir ki, bu da gələcək alimlərin, menecerlərin, mühəndislərin hazırlanması işinə böyük dəstəkdir.

Neft Akademiyası qarşısında duran əsas məsələ Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 24 oktyabr 2013-cü il tarixli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasını" uğurla həyata keçirərək, Avropanın tanınmış universitetləri arasında layiqli yer tutmaqdır.

ADNA əməkdaşları tərəfindən yerinə yetirilən elmi-tədqiqat işlərinin nəticələrinin sənaye sahələrində tətbiqi istiqamətində işləri sürətləndirməklə yanaşı, iqtisadi səmərəliliyin təminini təşkil etmək qarşıda duran əsas vəzifələrdəndir.

Onu da qeyd etmək lazımdır ki, son illər tədris prosesinin səviyyəsinin yüksəldilməsi, maddi-texniki bazanın təkmilləşdirilməsi, kadr tərkibinin möhkəmləndirilməsi, eləcə də yeni informasiya texnologiyalarının tətbiqi, təhsilin Avropa standartlarına uyğun aparılması, müasir düşüncəli mütəxəssislərin hazırlanması məhz ADNA rəhbərliyinin xüsusi diqqəti və qayğısı sayəsində təmin edilmişdir.

***Pedaqogika***

# ОБЪЕКТИВНЫЕ ФАКТОРЫ ДИДАКТОГЕНИИ

**Гейдар Джафаров**
**доцент АГПУ, доктор философии**
**по педагогике**

***Açar sözlər:*** *didaktogeniya, psixogeniya, valeologiya, şəxsiyyətyönümlü təhsil, təhsilin məzmununun təkmilləşdirilməsi, maddi təhsil nəzəriyyəsi, formal təhsil nəzəriyyəsi, intensiv, ekstensiv, elmdə monopoliya, mənəvi sağlamlıq, cismani sağlamlıq, pedaqoji zorakılıq.*

***Ключевые слова:*** *дидактогения, психогения, валеология, личностно-ориентированное образование, совершенствование содержания образования, теория материального образования, теория формального образования, интенсивный, экстенсивный, монополия в науке, духовное здоровье, физическое здоровье, педагогическое насилие.*

***Key words:*** *didactic genie, psychogenic, vale logy, personality oriented education, maintenance perfection of education, material theory of education, formal theory of education, intensive, extensive, monopoly at science, moral health, physical health, pedagogical violence.*

В соответствующей научной литературе (см. 2-9) изложены интерпретации понятия “дидактогения”. Однако вместе с тем, на наш взгляд, к дидактогении в целом надо отнести все недостатки, которые встречаются на всех ступенях образования от дошкольного до докторантуры, а именно: 1) дальнейшее совершенствование содержания системы образования без учета естественных (природных) психологических, физиологических возможностей и интеллектуального уровня обучающихся; 2) недорозумения во взаимоотношених учителя и учащихся; 3) отсутствие проверки пригодности, специальной подготовки и способностей абитуриентов при приеме в высшие и средне специальные педагогические учебные заведения; 4) овладение педагогической профессией случайных людей; 5) слабая психолого-педагогическая и методическая подготовленность учителей, не компетентность в применении новых информационных и коммуникационных технологий в обучения; 6) составление расписания занятий без учета повышения и понижения энергетической напряженности обучающихся; 7) несоблюдение норм домашних заданий; 8) отсутствие в некоторых случаях паронормальных учебных условий и др.

Как видно, с одной стороны, между этими недостатками имеются определенные связи и взаимозависимости. Так, если не учесть некоторых субъективных факторов, то перечисленные недостатки {с научно-педагогической и методической точки зрения неправильное составление расписания занятий, нарушение норм домашних заданий, слабая психолого-педагогическая и методическая подготовленность учителей, не компетентность

в применении новых информационных и коммуникационных технологий обучения, отсутствие совместной целенаправленной, последовательной и координированной работы воспитательных институтов общества (семьи, школы и общественности), направленной на формирование у учащихся сознательного отношения к обучению; напряженные взаимоотношения участников учебно-воспитательного процесса и др.} в той или иной степени непосредственно или косвенно обуславливаются отсутствием проверки пригодности, специальной подготовки и способностей (конструктивных, организаторских, коммуникативных и гностических) абитуриентов при приеме в высшие и средние специальные педагогические учебные заведения (в отличие от музыки, спорта и живописи).

Мудрецы востока высказывали множество поучительных изречений о выборе профессии, приравнивали это к созданию семьи. В выборе профессии то же самое. Можно выбрать, любить не пятнадцать (согласно нормальной логике это невозможно), а одну профессию. Разумеется с учетом совета взрослых, родителей, учителей, классных руководителей, психологов школы, индивидуальных и половых особенностей, внутренних потенциальных психологических, физиологических возможностей, соответствующей проверкой состояния здоровья (медицинское обследование) и профессиональной пригодности с применением психолого-педагогических тестов и т.д. Счастье и долголетие людей объяснялось именно по этим приметам. Восточное изречение гласит: счастливы и долго живут те, которые с работы торопятся домой, а дома – на работу. Счастливы потому, что по душе и семья, и вид деятельности.

В учебном процессе высоких результатов можно достичь лишь тогда, когда совпадают цели субъектов (учить) и объектов (учиться) обучения. Как говорится в немецкой поговорке: “Коня насильно можно привести к водопою, однако заставить его пить воду невозможно”.

С другой стороны, следует учитывать, что учитель, руководствуясь политикой в сфере образования и ее принципами (гуманизм, демократизм, равенство, народность и светскость, качественность, эффективность, непрерывность, единство, постоянство, преемственность, либерализация, интеграция) (1, 11-12) и осуществляя свои обязанности (участвовать в претворении государственной политики в сфере образования, обеспечивать усвоение образовательных программ) (1, 44; 33.3.1-2), одновременно выполняет социальный заказ государства. Именно поэтому, например, неадекватные требования или неумеренное педагогическое воздействие с информационной перегрузкой не обуславливаются субъективной самоцелью учителей и преподавателей. Это, в определенном смысле слова, носит объективный характер. Ведь, как было отмечено выше, учитель по долгу деятельности стремится к усвоению учащимися содержания образования, соответственно его цели и установленным стандартам. Сказанное подводит нас к тому, что в учебном процессе негативное влияние деятельности учителя на духовное и физическое здоровье учащихся не всегда зависит от него самого.

В современной педагогической литературе особенно подчеркивается личностно-ориентированность образования. В действительности, между личностью и ее образованием существует тесная диалектическая взаимосвязь. Оно, так или иначе, непосредственно или косвенно связано с личностью. Образование, тесно связанное с непрерывным учением (учиться, учиться и учиться), сопровождает человека в течение всей его жизни, “от

колыбели до могилы” (пророк Мухаммед). В этом смысле, образование вне личности и общества немыслимо. Однако, к сожалению, иногда утверждения личностно-ориентированности и приоритетности сферы образования, направленной, прежде всего, на обеспечение физического и духовного здоровья, всестороннего развития, улучшение и повышение его благосостояния, уровня жизни, носят в какой-то степени декларативный характер.

Образование, как надстроечное явление, в настоящее время направлено не на всестороннее, а преимущественно на односторонее развитие личности и в целом не на ее духовное и физическое здоровье, а лишь на умственное развитие, повышение интеллектуального уровня, то есть на обеспечение страны “…самостоятельно и творчески мыслящими конкурентно-способными кадрами-специалистами, обладающими широким мировоззрением…, теоретическими и практическими знаниями…” (1, 12). Под понятием же личносто-ориентированности образования следует понимать, прежде всего, не только умственное, интеллектуальное, духовное, но также самое важное и самое главное их физическое развитие, а в действительности в целом обеспечение единства и гармонии духовного и физического здоровья, создание для этого в образовательных учреждениях всесторонних условий, независимо от типа, вида, уровня, ступени, форм собственности и др. Осуществление же положений цели образования требует, прежде всего, дальнейшего обновления, совершенствования, расширения и углубления его содержания.

Ради справедливости следует отметить, что эти процессы (дальнейшее обновление, совершенствование, расширение и углубление содержания образования) закономерны и неизбежны. Ибо по мере развития общественного сознания быстрыми темпами увеличивается также объем научных информаций о природе, обществе и человеке. Этот объективный процесс, следовательно, требует совершенствования содержания образования, соответственного текущим и в определенной степени перспективным потребностям общества.

Процесс совершенствования содержания образования, который начался еще в XVII веке (вспомним теории формального и материального образования: теория формального образования ведет свое начало от Локка (XVII в.) Песталоцци, Канта и Гербарта (XVIII-XIX вв.), а теория материального образования в конце XVIII – начале XIX в.), в начале XXI века еще более обострился. По подсчетам науковедов, с начала нашей эры для удвоения знаний потребовалось 1750 лет, второе удвоение произошло в 1900 году, а третье – в 1950 году, при росте объема информации за эти полвека в 8-10 раз. Причем эта тенденция все более усиливается, так как объем знаний в мире к концу XX века возрос вдвое, а объем информации увеличился более чем в 30 раз. Резко возрастает поток публикаций. Если 1900 году было около 10 тыс. научных журналов, то в настоящее время их уже несколько сотен тысяч. По всему миру рост научной и технической литературы увеличился до уровня 60 млн. страниц в год (11). В наше время объем научной информации удваивается каждые 6-7 лет. Это, в свою очередь, требует обновления и совершенствования содержания образования (предметных куриклиумов: учебные планы, программы, учебники, учебные пособия и др.) также соответственно каждые 6-7 лет на всех ступенях образования, начиная дошкольного до докторантуры.

Как видно, время удвоения объема накопленных научных знаний быстро

сокращается. В ближайшие 20 лет подобное удвоение может повторяться каждые 3-4, или 2-3 года. По данным некоторых источников, уже в наши дни удвоение объема научных знаний происходит каждые 2-3 года (12), а по другим данным – даже каждые 20 месяцев (11). Достаточно сказать, что, если в XVII веке И.Келлер потратил 4 года для того, чтобы рассчитать орбиту Марса, то современный компьютер сделает это всего за 4 секунды. В таких случаях содержание образования также придется совершенствовать соответственно каждые 3-4 или 2-3 года. С учетом перспективных потребностей общества государству потребуется десятки и сотни миллиардов средств на мобильную подготовку педагогических и научных кадров, повышение их квалификации, упрочение материально-технической базы учебных заведений, оснащение их самыми современными и совершенными ИКТО (информационно-коммуникационными технологиями обучения), обновление учебных планов, программ, учебников (если даже они будут электронными). Естественно, экономически слабые страны будут не в состоянии справиться с такой задачей, что повышает вероятность сосредоточения ведущих научных дисциплин в руках экономически развитых стран, а в конечном итоге их монополизацию. Система современного научного знания включает около 15 тыс. дисциплин. В авангарде науки идут фундаментальные исследования, которые требуют значительных капитальных вложений.

С учетом отмеченного в современных условиях совершенствование содержания системы образования осуществляется как интенсивным, так и экстенсивным путем, то есть с одной стороны увеличивается время получения общего среднего образования (с учетом дошкольного образования оно уже составляет 13-14 лет), а с другой, как нами было отмечено, на всех ступенях совершенствуется содержание образования. Все вышеизложенные являются порождающими дидактогению объективными факторами. Одним из объективных факторов, обуславливающих возникновение (1980) и развитие валеологии, как новой интегративной науки {ее основоположником считается русский ученый И.И. Брехман (1921-1994)} является именно устранение в определенной степени последствий дидактогении в системе образования и образовательных учреждениях, а также обеспечение и сохранение духовного и физического здоровья учащихся.

Таким образом, совершенствование содержания образования соответственно ускоренному темпу развития современной науки значительно опережает естественное развитие {даже с учетом процесса акселерации, хотя, по мнению русских ученых, за последние 20 лет стали регистрироваться и случаи децелерации (процесс, обратный акселерации, замедление процессов биологического созревания всех органов и систем организма)} (15) учащихся, приводит к педагогическому насилию, а в конечном итоге оказывает серьезное отрицательное влияние на состояние их духовного и физического здоровья. В целом устранение причин, порождающих дидактогению, или уменьшение ее негативного влияния обуславливается учетом нижеследующих противоречий:

1) противоречие между ограниченными (естественными, природными) возможностями учащихся по восприятию, переработке учебной информации и дальнейшим совершенствованием содержания образования;

2) противоречие между увеличением объема научных информаций и определением оптимального содержания образования;

3) противоречие между темпом естественного развития учащихся с учетом “зоны ближайшего развития” (Л.С. Выготский), а также процесса акселерации и ускоренным темпом увеличения объема научных информаций.

*Рецензент: проф. А.Пашаев*

**Использованная литература**

1. Закон Об образовании Азербайджанской Республики. Баку, 2012. 64 с.
2. http:/www.ped.vslovar.ru/574.html
3. vocabulary.ru/diktionary/978
4. www.edutic.ru/psh/1/5/p/10/
5. didacts.ru/diktionary/1010/word/didaktogenija
6. vocabulary.ru/diktionary/25/word/didaktogenija
7. www.encyclopedia.ru/cat/online/detail/38682
8. www.gumer.info/bibliotek_Buks/Psihol/stepan/index.php
9. www.insai.ru/slovar/2418?page=4
10. didacts.ru/diktionary/1010/word/didaktizm
11. tskk.spider.ru/content/section/…/458/
12. technologies.su/istoriya_razvitiya_it
13. e-readinq-lib.orq/…/Mihaiilov_-_Konse…
14. ru.wikipedia.org/wiki/Информационные _технологии
15. cde.osu.ru/demoversion/cource 94/glava_1_3.html

**H.Cəfərov**

**Didaktogeniyanın obyektiv faktorları**

**Xülasə**

Məqalədə təhsilalanların təbii, psixoloji, fizioloji və əqli (intellektual) imkanları nəzərə alınmadan təhsil sistemi və onun məzmununun təkmilləşdirilməsini şərtləndirən obyektiv amillər son nəticədə didaktogeniyaya səbəb olur. Cəmiyyətin müasir tələbatlarından meydana gələn yeni inteqrativ elm sahəsi kimi valeologiyanın yaranması məhz bu amillərlə şərtlənir. Məqalədə, həmçinin belə bir müddəa irəli sürülür ki, elmi informasiyaların iki dəfə artımı müddətinin azalması və təhsilin məzmununun bu obyektiv prosesə müvafiq təkmilləşdirilməsi (dörd, üç, yaxud iki ildən bir) daha çox fundamental elm sahələrinin aparıcı dövlətlərin monopoliyasına çevrilməsinə gətirib çıxaracaq.

**H.Jafarov**

**Pedagogical aspects of didactic genie**

**Summary**

In the article education system, maintenance perfection of education, and learners’ natural, psychological, moral, physical health and intellectual potentials are discussed. It is also noted that a new integrative science vale logy is appeared with this matter. Vale logy, as a new integrative field of study, appearing form modern demands of the society, is defined by these factors. In the article, such a thesis is also made that, decrease in period of twofold increase of scientific information and improvement of the content of education, according to this objective process, (every four, three or two years), will bring the more fundamental fields of science to a monopoly of leading countries.

# TƏHSİL TEXNOLOGİYALARININ MÜXTƏLİF MODİFİKASİYALARI VƏ PEDAQOGİKA KURSUNUN MODERNLƏŞDİRİLMƏSİNDƏ ONLARIN ROLU

**Səbinə Rüstəmova**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin doktorantı***

***Acar sözlər:*** *təhsil texnologiyaları, təlim, interaktiv təlim, kommunikativ təhsil texnologiyaları.*

***Ключевые слова:*** *образовательных технологий, обучение, интерактивное обучение, коммуникационные технологии в образовании.*

***Key words:*** *educational technologies, training, interactive training, communication technologies.*

Pedaqoji texnologiyalar, o cümlədən təhsil texnologiyaları haqqında fikirlər, tədqiqatlar yarım əsrdən də çox bir müddətdə pedaqoji mətbuatda, əsərlərdə özünə vətəndaşlıq hüququ qazanmasına baxmayaraq, onun haqqında bir-biri ilə ziddiyyət təşkil edən, çox vaxt isə bir-birini təkrar edən fikirlər, mülahizələr də az deyildir. Bu isə təhsil texnologiyalarının müxtəlif modifikasiyalarının meydana gəlməsinə səbəb olmuşdur. Əks halda inkişafdan söhbət gedə bilməz. Lakin bir həqiqət də vardır ki, bu sahədə fikirlərin cəmləşməsinə, konkret olaraq, təhsil texnologiyalarının məzmun və mahiyyətinin pedaqoji cəhətdən dəqiqləşdirilməsinə həmişə ehtiyac vardır. Pedaqoji ədəbiyyatlarda verilən izahları, tərifləri nəzərdən keçirsək, bu oxşarlıqları və fərqlilikləri aydın görərik.

Pedaqoji ədəbiyyatda başqa-başqa müəlliflər tərəfindən irəli sürülən fikirlər arasında bir-birindən kəskin surətdə fərqlənən və biri digərini təkzib edən fikirlərə rast gəlinmir. Başlıca fərq fikirlərin ifadə olunmasında və bəzən təlim texnologiyaları ilə pedaqoji texnologiyalar anlayışlarının qarışdırılmasında özünü göstərir. Pedaqoji texnologiyalar dedikdə, yalnız təlim texnologiyaları başa düşülür, bəzən də müəllimin pedaqoji cəhətdən işləyib hazırlamış olduğu metodlar, priyomlar sistemi və tərbiyə texnologiyaları nəzərdə tutulur (6, 11 ).

Pedaqoji texnologiyalara verilən izahatlar, bu anlayışın mahiyyətini izah etməyə yönələn baxışlar və eyni zamanda pedaqoji texnologiyaların özü də çoxdur. Bəzi hesablamalara görə 100-ə qədər yeni pedaqoji texnologiyalar mövcuddur.

Konkret olaraq, təhsil texnologiyaları haqqında da eyni fikirləri söyləmək olar. Məsələn, Q.K.Selevko tərəfindən yazılmış "Müasir təhsil texnologiyaları" adlı tədqiqatda 50 texnologiyanın adı çəkilir və onların xarakteristikası verilir. Bunların içərisindən aşağıdakıları xüsusi qeyd etmək olar:

- pedaqoji prosesdə şəxsi orientasiya əsasında pedaqoji texnologiyalar (şəxsi humanist texnologiya, Ş.A.Amonaşvili və b.);
- şagirdlərin fəaliyyətinin intensivləşdirilməsi və fəallaşdırılması əsasında pedaqoji texnologiyalar (oyun texnologiyası; xaricidilli mədəniyyətin kommunikativ

təlim texnologiyaları, E.İ.Passov);

- alternativ texnologiyalar (azad əmək texnologiyası, Selesten Frene);
- təbii vasitələr texnologiyası (özünüinkişaf texnologiyası, Mariya Montessori);
- inkişafetdirici təlim texnologiyası (özünüinkişafetdirmə təlimi texnologiyası, Q.K.Selevko);
- müəllif məktəbi pedaqoji texnologiyaları ( 7, 23-24).

Q.K.Selevko adı çəkilən əsərində də təhsil praktikasında pedaqoji texnologiya anlayışından istifadənin aşağıdakı üç səviyyəsinin olduğunu göstərir.

1. Ümumpedaqoji (ümumdidaktik) səviyyə. Ümumpedaqoji (ümumdidaktik, ümumtərbiyəvi) texnologiya təhsilin müəyyən səviyyəsində bir regionda, tədris müəssisəsində, təlimin müəyyən mərhələsində təhsil prosesinin tamlığını xarakterizə edir. Burada pedaqoji texnologiya pedaqoji sistemlə sinonimləşir: buna məqsəd, məzmun, təlimin metod və vasitələri, prosesin obyekt və subyektlərinin fəaliyyət alqoritminin birliyi, cəmi daxil olur.

2. Xüsusi metodiki (fənn) səviyyə. Xüsusi fənn pedaqoji texnologiya "xüsusi metodika" kimi bir fənn, sinif, müəllim çərçivəsində təlim və tərbiyənin müəyyənləşmiş məzmununun reallaşması üçün metod və vasitələrin cəmi kimi özünü göstərir.

3. Lokal (modul) səviyyə. Lokal pedaqoji texnologiya təlim – tərbiyə prosesinin ayrıca texnologiyasını özündə əks etdirir, xüsusi didaktik və tərbiyəvi vəzifələri həll edir (7, 13).

Qeyd edək ki, son illər respublikamızda aparılan bəzi tədqiqatlarda və pedaqogika dərsliklərində də belə təsnifatlara rast gəlinir (2, 228).

H.Əhmədovun 2006-cı ildə çap etdirdiyi "Pedaqogika" adlı dərs vəsaiti də bu baxımdan diqqəti cəlb edir. Dərslikdə tətbiq sahəsinə, fəlsəfi əsasa, psixi inkişafa və digər sahələrə görə bir sıra təsnifatlara toxunulur. Ənənəvi sistemin modernləşdirilməsi istiqaməti üzrə aşağıdakı qrup texnologiyalar fərqləndirilir:

- pedaqoji münasibətlərin humanistləşdirilməsi və demokratikləşdirilməsi əsasında aparılan pedaqoji texnologiyalar;
- şagird şəxsiyyətinin formalaşdırılması və intensivləşdirilməsi əsasında pedaqoji texnologiyalar;
- təlim prosesin təşkilinin səmərəliliyi və idarəedilməsi əsasında qurulan pedaqoji texnologiyalar;
- metodik təkmilləşdirmə və didaktik təlim-tədris materialının rekonstruksiya edilməsi əsasındakı pedaqoji texnologiyalar;
- təbiətəuyğunluq, xalq pedaqogikasının metodlarından istifadə edən və uşağın təbii inkişaf prosesinə söykənən təbiətəuyğunluq: təlim, savadlılıq tərbiyəsi və b. texnologiyalar;
- alternativ metodlar;
- müəllif məktəbi (8, 146-147).

Bu təsnifatlarla yanaşı, xüsusən praktik fəaliyyət baxımından daha çox istifadə edilən texnologiyalar vardır ki, hazırda onlardan daha çox istifadə edilir. Bunlar, əsasən, aşağıdakılardan ibarətdir:

- ənənəvi təlim texnologiyası (yeni materialın öyrənilməsi, möhkəmləndirilməsi, nəzarət, qiymətləndirmə);
- inkişafetdirici təlim texnologiyaları (təlimin gücçatan çətinlik səviyyəsində qurulması);
- proqramlaşdırılmış təlim texnologiyaları (tədris materialının kiçik, yüngül qavranılan hissələrə bölünməsi; hər hissənin mənimsənilməsi üçün müəyyən hərəkətlərin yerinə yetirilməsi ardıcıllığına dair göstərişlər sisteminin daxil edilməsi; hər hissənin mənimsənilməsinin yoxlanılması: nəticələrin qeydə alınması);
- problemli təlim texnologiyaları (müəllimin rəhbərliyi altında şagirdlərin

müstəqil axtarış fəaliyyətinin təşkili);

- fəal təlim texnologiyaları (şagirdlərin daxili fəallığına əsasən təfəkkürün işləməsinə nail olunması);

- distant təlim texnologiyaları (tədris müəssisələrinə getmədən (müasir telekommunikasiya sistemləri, elektron poçt, televiziya və internetin köməyi ilə) təhsil xidmətlərindən istifadə) və s.

Pedaqoji ədəbiyyatlarda, həmçinin pedaqoji texnologiyaların strukturunun şaquli və üfüqi formaları fərqləndirilir. Şaquli istiqamətdə bir-biri ilə əlaqəli meta, makro, mezo və mikrotexnologiyalar, üfüqi istiqamətin strukturunda isə elmi-nəzəri, formal-təsviri və prosessual-aktiv texnologiyaların adı çəkilir və onların xarakterik xüsusiyyətləri açıqlanır (5, 11-12).

Lakin bu təsnifat da təhsil texnologiyalarının spesifik xüsusiyyətlərini açmağa və bunlara konkret olaraq nələrin daxil olduğu haqqında biliklər əldə etməyə tədqiqatçılar və praktik müəllimlərə dərindən kömək edə biləcək məlumatlarla zəngin deyildir.

Anlayışa yanaşma tərzinin müxtəlifliyi onu deməyə əsas verir ki, tədqiqatçıların bir çoxu "pedaqoji texnologiyalar" anlayışını hərtərəfli xarakterizə etməyə çalışmış və onun mahiyyətini daha dərindən açmağa müvəffəq olmuşlar. Burada müəlliflər pedaqoji, təlim, təhsil və tərbiyə texnologiyalarının hər birini ayrı-ayrılıqda izah etməyə çalışmışlar ki, bu da onların mahiyyətini daha aydın dərk etməyə imkan verir. Bu baxımdan akademik N.V.Bordovskoyun redaktorluğu ilə nəşr olunan "Müasir təhsil texnologiyaları" adlı dərs vəsaiti (Moskva, 2011) maraq doğurur. Bu vəsaitdə pedaqoji texnologiyaların mahiyyəti, məzmunu və xarakterik xüsusiyyətləri məzmunlu şəkildə araşdırılmaqla yanaşı, təlim texnologiyaları ilə təhsil texnologiyalarının ümumi və fərqli cəhətlərinə aydınlıq gətirilir, təhsil texnologiyalarının məzmunu, aspektləri, istiqamətləri, struktur elementləri, özünəməxsus keyfiyyətləri geniş şəkildə təhlilə cəlb olunur. Vəsaitdə qeyd olunur ki, "pedaqoji texnologiya" və "təlim texnologiyası" anlayışları "təhsil texnologiyası" anlayışına fikrən yaxın olsa da, onlar sinonim anlayışlar deyildir (9, 34). Vəsaitdə yeni təhsil texnologiyaları kimi yalnız 5 texnologiyanın – ənənəvi və innovasiya texnologiyaları, interaktiv texnologiyalar, informasiya texnologiyaları, kommunikativ texnologiyalar və humanitar texnologiyalar, təlim texnologiyalarının isə 6 növünün – modul təlim texnologiyası, problemli təlim texnologiyası, kontekst təlim texnologiyası, əməkdaşlıq texnologiyası, dialoq formasında seminar texnologiyası və debat texnologiyasının adı çəkilir və onların xarakteristikası geniş şəkildə açıqlanır. Burada, həmçinin tədris prosesinin subyektlərinin informasiyalaşdırılması, tədris prosesinin subyektlərinin potensialının fəallaşdırılması və ekspert qiymətləndirmə texnologiyaları da geniş təhlil edilir. Göstərilən hər bir texnologiyaların hamısı ali təhsil müəssisələrində tədris prosesinin yeni texnologiyalarla daha da mükəmməl, hərtərəfli təşkili və aparılması baxımından olduqca məzmunlu və zəruri texnologiyalar kimi diqqəti cəlb edir (9).

Göründüyü kimi, təhsil texnologiyalarına daha geniş aspektdən yanaşılır və təlim texnologiyaları daha konkretlik ifadə edərək birbaşa praktik fəaliyyətlə əlaqələndirilir. Buna görə də, əslində, təlim texnologiyaları kimi təqdim edilən texnologiyalar həm də təhsil texnologiyalarının mahiyyətini özündə açıqlayır. Bunu təhsil texnologiyalarına verilən izahdan da görmək mümkündür.

Bu vəsaitdə təhsil texnologiyalarına verilən tərif də maraq doğurur: "Təhsil texnologiyaları – biliyin müəyyənləşmiş sahəsi üzrə ola bilən, müəyyən fənn şəklində təhsil

prosesinin modelinin təsvir edilmiş variantı, tədris prosesinin təşkil edilmiş strukturu, təhsil proseslərinin subyektlərinin fəaliyyət xarakteristikası və ya onların qarşılıqlı əlaqəsinin səciyyələndirilməsidir. Yəni təhsil texnologiyalarına təhsil praktikasında təhsilləndirici prosesin təşkil edilməsi ilə bu layihənin reallaşdırılmasının əlaqəsində baxılmalıdır" (9, 34). Tərifdən görünür ki, burada təhsil prosesinin subyektləri, yəni təhsilverənlər və təhsilalanların qarşılıqlı əməkdaşlığı, tədris prosesinin təşkil edilmiş, əvvəlcədən layihələşdirilmiş strukturu və müəyyənləşdirilmiş strukturun həyata keçirilməsi – reallaşdırılması təhsil texnologiyalarının ən zəruri əlamətləridir.

Burada göstərilir ki, təhsil texnologiyalarının mənbəyinin və müxtəlifliyinin səbəbləri müxtəlif cür başa düşülür. Bu variantlardan biri təhsil prosesinin texnoloji təminatının müxtəlif istiqamətlərə ayrılmasıdır. Bu istiqamətlər aşağıdakı kimi xarakterizə edilir:

"Təhsil prosesinin texnoloji təminatının birinci istiqaməti tədris prosesində biliyin verilməsi və mənimsəmə ilə əlaqədar fasiləsiz dəyişən təhsilin məzmununun – elmi biliklərin, dünya haqqında biliklərin, fənn haqqında və insan fəaliyyətinin ifadə tərzindən, müəllim və şagirdlərin və ya fənn müəllimi və tələbələrin birgə fəaliyyətlərinin optimallaşdırılması və texnologiyanın təkmilləşdirilməsindən ibarətdir.

Müasir təhsilin texnoloji təminatının ikinci istiqaməti yeni informasiya texnologiyaları və qlobal informasiyalaşdırma imkanlarının gücündən ibarətdir.

Təhsil prosesinin texnoloji təminatının üçüncü istiqaməti təhsilləndirici prosesin iştirakçılarının qarşılıqlı əlaqəsi prosesində tələbələr tərəfindən texnoloji ünsiyyətin mənimsənilməsindən, əməkdaşlıqdan, yaradıcılıqdan, stimullaşdırılmadan, müəllim tərəfindən diaqnozlaşdırmadan, müxtəlif statusa və mədəniyyətə malik adamların ünsiyyət texnikasına yiyələnməsindən, özünüdərk və özünütəhsildən, sosial texnologiyaların tətbiqi ilə əlaqədardır.

Dördüncü istiqamət təhsil prosesinin texnoloji təminatının şagirdlərin və tələbələrin təlimin və ünsiyyətin, idrakın və özünüinkişafın obyekti kimi inkişaflarının təmin olunması ilə şərait və vasitələrin optimal sisteminin axtarışı ilə əlaqəlidir" (9, 35-36).

Göründüyü kimi, istər pedaqoji texnologiyalar, istərsə də onun tərkib hissələri olan təlim və təhsil texnologiyalarının mahiyyəti və məzmunu, həmçinin onların istiqamət və xarakteri haqqında xeyli fikir müxtəliflikləri vardır. Bu müxtəliflik isə məhz hazırkı dövrdə onların modernləşdirilməsini zəruri edir. Çünki bir tərəfdən praktik müəllimlərin əlində əsaslandırılmış və sistemləşdirilmiş texnologiyalara ehtiyac vardır. Digər tərəfdən də pedaqoji nəzəriyyədə bunların dəqiqləşdirilməsi tədqiqatçılar, gələcək magistrantlar və doktorantlar üçün istiqamətverici materiallar kimi vacibdir.

Beləliklə, yeni təhsil texnologiyaları mahiyyət etibarilə təlimin forma, metod və vasitələrini özündə birləşdirən təlim prosesinin reallaşdırılmasına istiqamətlənən tədris fəaliyyətindən ibarətdir. Bu proses ali məktəb müəllimlərinin və tələbələrin birliyi sayəsində məqsədyönlü şəkildə həyata keçirilən tədris fəaliyyətindən ibarətdir.

Q.K.Selevko ayrı-ayrı mütəxəssis-pedaqoqlar tərəfindən irəli sürülən bir sıra mövcud pedaqoji texnologiyaları ümumiləşdirərək qruplaşdırmış, pedaqoji texnologiyaların ənənəvi sisteminin modernləşdirilməsinə çalışmış və bu istiqamətlərin aşağıdakılardan ibarət olduğunu göstərmişdir:

1) pedaqoji münasibətlərin humanistləşdirmə və demokratikləşdirmə əsasında pedaqoji texnologiyalar;

2) pedaqoji münasibətlərin şagirdlərin fəaliyyətinin fəallaşdırılması və eyniləşdiril-

məsi əsasında pedaqoji texnologiyalar;

3) təlim prosesinin səmərəli təşkili və idarə olunması əsasında pedaqoji texnologiyalar;

4) tədris materialının didaktik yenidənqurulması və metodiki təkmilləşdirilməsi əsasında pedaqoji texnologiyalar;

5) təbiətəmüvafiqlik, xalq pedaqogikası metodundan istifadə, uşağın təbii proseslər əsasında inkişafı texnologiyaları;

6) alternativ (valdorf pedaqogikası, azad əmək texnologiyası, mümkünlük (ehtimal) təhsil texnologiyası);

7) kompleks politexnologiyalaşdırma pedaqoji texnologiyası (7, 23-24).

Bu təsnifat təkcə ənənəvi təhsil texnologiyalarının alternativi kimi deyil, həm də yaxın və uzaq xaricdə mövcud olan bir sıra qabaqcıl texnologiyaların kompleksi kimi diqqəti cəlb edir. Burada ən dəyərli cəhət ondan ibarətdir ki, müəllif bu texnologiyaların analizini və təsvirini verməklə onların strukturunu da verir:

1. Sistematikliyin qəbul edilməsinə müvafiq olaraq hazırkı pedaqoji texnologiyanın eyniləşdirilməsi (ixtisaslaşdırılmış sistem).

2. Texnologiyanın adı, əsas keyfiyyətin əksi, prinsipial ideya, təlim-tərbiyə proseslərinin modernləşdirilməsi istiqamətləri əsasında təlimin qəbul edilən sisteminin mahiyyəti.

3. Konseptual hissə (rəhbər ideyanın qısa təsviri, fərziyyə, texnoloji prinsiplər, dərketmə imkanları, onun şərh edilməsi və funksiyaları).

4. Təhsilin məzmununun xüsusiyyətləri.

5. Prosessual xüsusiyyətlər.

6. Proqram-metodik təchizat (7, 24-25).

Təhsil texnologiyaları durmadan inkişaf edir. Bu inkişafın başlıca səbəblərindən biri və birincisi, elmi-texniki inqilab, əmək bazarının artan tələbi və bunlarla əlaqəli olan təhsil sisteminin özünün inkişafı ilə bağlıdır. Təhsil sisteminin özündə baş verən hər bir müsbət dəyişiklik onun texnikasında və texnologiyasında da inkişafa səbəb olur ki, bu da yeni-yeni texnologiyaların meydana gəlməsi deməkdir. İKT sahəsində dünyada baş verən yeniliklər bu texnologiyaların yayılmasında mühüm dəyişikliklərə səbəb olduğundan tez-tez pedaqoji nəzəriyyədə və təcrübədə köhnə, vaxtı keçmiş texnologiyalar öz yerini yeni texnologiyalara verir. Ən yaxşı texnologiyalar isə həm nəzəriyyədə, həm də pedaqoji təcrübədə tez-tez müraciət edilən və müasir tələblərə cavab verən texnologiyalar olduğundan pedaqoji nəzəriyyədə və pedaqoji təcrübədə belə innovasiya texnologiyaları geniş əks-səda doğurmuş və pedaqoji prosesə daxil olmuşdur. Təhsil prosesində iştirakçıların fəallaşdırılması, tədrisin “subyekt-subyekt” münasibətlərində aparılması, təhsildə İKT-dən geniş və əlverişli şəkildə istifadə edilməsi, tədris prosesinə və təhsilalanlara humanist yanaşma kimi problemlərin aktuallaşması bunlara müvafiq yeni təlim texnologiyalarının yaranmasına şərait və zərurət yaratmışdır. Yaranan bu yeni texnologiyalar son illər təhsil prosesinə daxil ola bilmiş və özünün bir sıra üstünlükləri ilə ənənəvi texnologiyalardan daha səmərəli, daha məhsuldar olmasını sübut edə bilmişdir. Bunların içərisində daha əlverişli hesab etdiyimiz innovasion, yəni yenilikçi təhsil texnologiyalarını aşağıdakı kimi təsnif etmək olar:

1. İnteraktiv təhsil texnologiyaları. Bu texnologiyaların əsas mahiyyəti tələbələrin daxili, potensial imkanlarının hesabına fəallıqlarına nail olmaqdır. Ənənəvi təhsil texnologiyalarından fərqli və bir növ ona alternativ olan bu texnologiya təhsilalanların fəallaşmasına yönəldilən təlimə üstünlük verir. Burada interaktiv metodların köməyi ilə tələbələr elə situasiyalarla, problemlərlə

qarşılaşdırılır ki, ali məktəb müəllimi fasilitator – bələdçi rolunda çıxış edir. Problemin həlli tələbələrin fəallaşdırılması və bilavasitə fəallığı zəminində baş verir. Əgər ənənəvi təhsil texnologiyaları zamanı tələbələrin yaddaşı önə keçirdisə, interaktiv təhsil zamanı təfəkkür daha çox fəal fəaliyyətə qoşulur. Tələbələr təhsil prosesində qarşıya qoyulan problemin həllində subyekt kimi axtarışa qoşularaq müəllimlə, mühazirəçi və ya seminar müəllimi ilə pedaqoji prosesin fəal iştirakçısına çevrilirlər.

İnteraktiv təhsil texnologiyaları özlüyündə bir neçə texnologiyalardan ibarət olub, ayrıca bir qrup kimi bir sıra texnologiyalardan ibarətdir. “Bu qrupa oyun, proyekt texnologiyası, “Ustad dərsi” texnologiyası, reflektiv texnologiya, özünüdərk texnologiyası, özünütəqdimetmə texnologiyası və s. daxildir” ( 9, 40).

Araşdırmalarımız göstərir ki, bəzi pedaqoji ədəbiyyatlarda interaktiv texnologiyalara fəal təlim metodları adı ilə bir çox texnologiyalar da məsələn, beyin həmləsi, dəyirmi masa, seminar-dialoq, diskussiya, debat və s. aid edilir. Bunlar gah texnikalar, gah metodlar, gah da texnologiyalar kimi verilir. Məsələn, interaktiv təlim metodları haqqında bir sıra layihələrin və vəsaitlərin müəllifi olan Z.Veysova “Fəal təlim metodlarına giriş kursu” adlı təlimçilər üçün metodik vəsaitdə (10) bunları texnikalar, 2007-ci ildə çap etdirdiyi “Fəal /interaktiv təlim: müəllimlər üçün vəsait”də isə bunları metodlar kimi təqdim etmişdir (11).

2. İnformasiya təhsil texnologiyaları. Bu texnologiyalar bilavasitə İKT-nin təhsil prosesinə gətirilməsi ilə bağlı bir prosesdir. İKT, xüsusən internet artıq bu gün həyat və məişətimizin bir hissəsinə çevrildiyi kimi, təhsilimizi də onsuz təsəvvür etmək mümkün deyildir. Son illər kompyuterlərin təlimə gətirilməsi aparılan təlim prosesinin səmərəsinə müəyyən qədər müsbət təsir göstərdiyindən bu texnologiyanın üstün bir texnologiya kimi tətbiqi daha da genişlənir. 2004-cü ildə qəbul edilən “Azərbaycan Respublikasında ümumtəhsil məktəblərinin informasiya və kommunikasiya texnologiyaları ilə təminat Proqramı (2005–2007-ci illər)” ilə əlaqədar olaraq görülmüş bir sıra işlər təhsil praktikasında mühüm dəyişikliklərin əsasını qoymuşdur.

3. Kommunikativ təhsil texnologiyaları. Bu texnologiya təhsil prosesinin iştirakçılarının – təhsilverənlə təhsilalanların, həmin təhsilalanların bir-birilə qarşılıqlı münasibətlərinin təkmilləşdirilməsi nöqteyi-nəzərindən mühüm əhəmiyyət daşıyır. Burada istər cütlərlə iş, istər qrup işi, istərsə də kollektiv məşğələlər elə təşkil edilir ki, bu zaman iştirakçılar bir-biri ilə yaxından əlaqədə olur, onların arasında səmimi ünsiyyət, əməkdaşlıq və qarşılıqlı fəaliyyət prosesi baş verir. Bu isə öz növbəsində həm şəxsiyyətin sosiallaşmasına, həm əməkdaşlığın möhkəmlənməsinə, həm də qarşılıqlı münasibətlərin möhkəmlənməsinə imkan və şərait yaradır. Kommunikativ təhsil texnologiyası kollektiv münasibətlərlə yanaşı, hər bir şagirdin fərdi potensial imkanlarının inkişafına maneə yaratmır. Əksinə, bu texnologiya fərdi imkanların genişlənməsinə şərait yaradan bir texnologiya kimi də diqqəti cəlb edir.

Kommunikativ təhsil texnologiyaları özünün bir sıra təsir imkanları ilə fərqlənir. Bunlar, əsasən, aşağıdakılardan ibarətdir:

- müəllim-tələbə, tələbə-tələbə münasibətlərinin formalaşmasında elə bir əhəmiyyətli yer tutur ki, bunu ənənəvi təlim texnologiyalarında görmək yalnız ayrı-ayrı novator müəllimlərin şəxsi təcrübəsində mümkün olardı;
- tədris prosesinin məhsuldarlığına, tələbələrin peşə və ixtisas motivlərinin formalaşmasına elə əhəmiyyətli təsir göstərir ki, tələbələr seçdikləri peşə və ixtisas üzrə

daha dərin biliklərə can atırlar;

- tələbələrin azadfikirliyinə, sərbəst düşüncə tərzinə yiyələnmələrinə müsbət təsir göstərir;
- tədrisdə işgüzar münasibətin formalaşmasına səbəb olur və öyrənmə motivlərinin inkişafına şərait yaradır;
- hər bir tələbənin fərdi imkanlarını, bacarıq və qabiliyyətlərini reallaşdıra bilmək imkanlarını genişləndirir;
- pedaqoji prosesdə müəllimlərin məsuliyyətini daha da artırır və s.

4. Humanitar təhsil texnologiyaları. Müasir təhsil texnologiyaları içərisində mühüm yer tutan humanitar təhsil texnologiyaları “Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu”nda qeyd olunduğu kimi, milli və ümumbəşəri dəyərlərin, şəxsiyyətin azad inkişafının, insan hüquqları və azadlıqlarının, sağlamlığın və təhlükəsizliyin, ətraf mühitə və insanlara qayğı və hörmətin, tolerantlıq və dözümlülüyün prioritet kimi qəbul olunması kimi humanitar dəyərlərin həyata keçirilməsinə, reallaşmasına doğru istiqamətlənir. Ali təhsili başa vurduqdan sonra aldığı ixtisasdan, işlədiyi sahədən, tutduğu vəzifədən asılı olmayaraq hər bir mütəxəssisdə zəruri olan milli və bəşəri dəyərlərin formalaşdırılmasını təmin edir. Buna görə də ali məktəblərdə humanitar təhsil texnologiyalarının tətbiq edilməsi təkcə təhsilalanlarda deyil, eyni zamanda təhsilverənlərdə də humanist dünyagörüşün, humanizm keyfiyyətlərinin möhkəmlənməsində və humanist təfəkkürün formalaşmasında mühüm əhəmiyyət kəsb edir.

Təhsil texnologiyalarının müxtəlif modifikasiyalarının təhlili belə bir qənaətə gəlməyə imkan verir ki, yeni texnologiyaların tətbiqi təkcə tədris prosesini deyil, pedaqogika nəzəriyyəsini də modernləşdirməyi tələb edir. Araşdırmalar göstərir ki, bir çox hallarda mühazirə və seminar məşğələlərində, az da olsa, müşahidə edilən yeni texnologiyalardan hələ də pedaqogikadan dərslik və dərs vəsaitlərində yetərincə bəhs olunmur. Düzdür, ayrı-ayrı tədqiqatlarda belə modifikasiyalar vardır, lakin tələbələrin ən çox istifadə etdikləri dərslik və dərs vəsaitlərinin bir çoxunda hələ də ənənəvi texnologiyaların təbliği və təsviri aparıcı yer tutur. Mühazirə və seminar məşğələlərində bir çox müəllim ənənəvi texnologiyalardan kənarlaşa bilmir. Lakin, etiraf etmək lazımdır ki, bunun səbəbi həm subyektiv, həm də obyektiv amillərlə əlaqədardır. Düşünürük ki, problemin həll olunması üçün aşağıdakı qeydlərin nəzərə alınması zəruridir:

1. Yeni təlim texnologiyalarının tətbiqi üçün lazım olan şəraitin yaradılması. Xüsusiləşdirilmiş auditoriyaların tələbata cavab verə biləcək sayda artırılması, işçi vərəqlərinin, digər vəsaitlərin hər məşğələ üçün müəllim tərəfindən hazırlanmasının təşkili.
2. Mühazirə və seminar məşğələsi aparan ali məktəb müəllimlərinin bəzilərinin İKT üzrə bacarıqlarının artırılması.
3. Ali məktəb müəllimlərinin əksəriyyətinin xarici dillər üzrə hazırlıqlarının yüksək səviyyəyə çatdırılması, onların xarici ədəbiyyatlardan istifadə edə bilmələrinə nail olunması.
4. Yeni təhsil texnologiyaları haqqında mühazirəçi və praktik məşğələ müəllimlərinin bilik, bacarıq və vərdişlərinin mövcud tələblər səviyyəsinə qaldırılması.
5. Ali məktəb müəllimlərinin yeni təlim texnologiyaları üzrə monitorinqinin aparılmaması və attestasiyadan keçirilməməsi və s. Yuxarıda göstərdiyimiz obyektiv və subyektiv səbəblərin bir kökünü də, qeyd etdiyimiz kimi, müəllimlərin peşə hazırlığının əsas aparıcı fənni hesab edilən “Pedaqogika” dərsliklərində axtarsaq, bəlkə də, səhv etmərik. Bizcə, bu dərsliklərin yeniləşdirilməsi, yazılacaq dərslik və dərs vəsaitlərinə müasir təhsil texnologiyalarının tətbiqi baxımından yanaşılması, onların daha qa-

barıq şəkildə işıqlandırılması yeni müəllim kadrlarının məhz müasir pedaqoji təfəkkürlü müəllimlər kimi hazırlanmalarına əhəmiyyətli dərəcədə kömək edərdi.

*Rəyçi: dos. K.Məcidov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Kazımov N. Məktəb pedaqogikası. Bakı: Çaşıoğlu, 2002.
2. Paşayev Ə., Rüstəmov F. Pedaqogika (yeni kurs). Bakı: Nurlan, 2007.
3. Həsənov A., Ağayev Ə. Pedaqogika (dərslik). Bakı: Nasir, 2007.
4. Сластенин В. Педагогика. Москва, 2000.
5. Mehrabov A., Abbasov Ə., Zeynalov Z., Həsənov R. Pedaqoji texnologiyalar. Bakı: Mütərcim, 2006.
6. İlyasov M. Pedaqoji texnologiyalar: ənənə və müasirlik /Pedaqoji tədqiqatlar (Elmi məqalələr məcmuəsi). Bakı: ADPU, 2005, №1.
7. Селевко Г. Современные образовательные технологии. М.: Академия, 1998.
8. Əhmədov H. Pedaqogika (dərs vəsaiti). Bakı: ABU, 2006.
9. Современные образовательные технологии учебное пособие /коллектив авторов; под ред. Н.В.Бордовской. 2-е изд., стер. - М.: КНОРУС, 2011.
10. Veysova Z. "Fəal təlim metodlarına giriş kursu" təlimçilər üçün metodik vəsait. Azərbaycan "İnkişaf" mərkəzi. Bakı: Meqa-print, 2004.
11. Veysova Z. Fəal /interaktiv təlim: müəllimlər üçün vəsait. UNİSEF, Azərbaycan nümayəndəliyi, 2007.

**С.Рустамова**

**Различные модификации образовательных технологий и их роль в модернизации педагогики конечно**

**Резюме**

Эта статья анализирует вопросы содержания учебных и образовательных технологий, освещает различные научные взгляды. Существуют различные точки зрения о сущности и содержания педагогических технологий и это неотъемлемой частью профессиональной подготовки и обучения технологиям. Эти подходы определяют необходимость учебного процесса в целом.

**S.Rustamova**

**Various modifications of educational technologies and their role in the modernization of pedagogy course**

**Summary**

In the article different educational and communication technologies are analyzed from different aspects. The author notes different sufficient points of views about the essence and content of pedagogical technologies and regards them as an integral part of training and educational technologies. This diversity is the necessary demand to modernization of education.

***Kurikulum***

# MƏZMUN STANDARTLARI KOMPONENTLƏRİNİN TƏDRİSDƏ NƏZƏRƏ ALINMASI

**Aysəba Məmmədova**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti***

***Açar sözlər:*** *fənn kurikulumu, məzmun standartları, məzmun xətti, təlim məqsədləri, idrak fəallığı, taksonomiya.*

***Ключевые слова:*** *предметные курикулумы, содержательные стандарты, содержательная линия, цели обучения, активность мышления, таксономия.*

***Key words:*** *subject curiculum, content standards, content line, the learning objectives, thinking activity, taxonomy.*

Azərbaycan təhsilində məzmunun yeniləşdirilməsi zərurətindən həyata keçirilən Kurikulum islahatı təhsilalanların həyati bacarıqlara nail olmaları və idraki vərdişlər qazanmalarını tələb edir. Bunun üçün isə onların məntiqi, tənqidi və yaradıcı təfəkkürlərinin inkişaf etdirilməsi təmin edilməlidir.

Bu barədə pedaqoji ədəbiyyatda görkəmli psixoloqların, təhsil mütəxəssislərinin tədqiqat və araşdırmalarına aid yazılara istinadən, konkret olaraq təlim prosesində şagirdlərə verilən biliyin kateqoriyaları, fəaliyyətin istiqamətləri və idraki bacarıqların məqsədli şəkildə qoyulmasına imkan yaradan vasitə hesab olunan taksonomiyaları nəzərdən keçirək.

Yeni fənn kurikulumlarında məzmunun ifadəçisi olan standartlar iki mühüm komponent: məzmun (bilik) və fəaliyyət (bacarıq) şəklində verilir.

Təlim məqsədlərinin müəyyən olunmasında məzmun üzrə biliyin kateqoriyaları, fəaliyyət üzrə isə bacarığın xüsusiyyətləri, yaxud fəaliyyət sistemləri konkretləşdirilir.

Ədəbiyyatda biliyin kateqoriyaları deklorativ, prosedural və kontekstual kimi qruplaşdırılır [5].

• Deklorativ bilik yaddaşa əsaslanmaqla verilən fənn ilə bağlı mühüm informasiyalar kimi nəzərdə tutulur. Bu bilik növü fənnə aid mühüm terminləri, ifadələri, tərifləri əhatə edir ki, şagirdlərin onları bilməsi təlimin sonrakı mərhələsinin təşkili üçün çox vacibdir. Deklorativ bilik Amerika alimi Benjamin Blumun taksonomiyasındakı altı mərhələnin (bilmə, anlama, tətbiqetmə, təhliletmə, sintezetmə, dəyərləndirmə) ən aşağı iki mərhələsi olan bilmə və anlama ilə əlaqələndirilir [2].

• Prosedural bilik hər hansı fənn üzrə mühüm vərdiş və proseslər kimi qəbul edilə bilər. Problemlərin həlli zamanı istifadə edilən biliklər prosedural biliklər hesab edilir və tapşırıqların yerinə yetirilməsi prosesində tətbiq edilir. Prosedural bilik Blumun taksonomiyasında tətbiq mərhələsi ilə əlaqələndirilir.

• Kontekstual bilik hər hansı prosesdə əldə edilən yeni informasiya və ya müəyyən informasiyalara tətbiq edildikdə, yeni məna alan proseslər kimi dəyərləndirilir.

Mütəxəssislər şagirdin fəaliyyətini aşağıdakı kimi müəyyənləşdirirlər [1,3].

• İdrak (koqnitiv) fəaliyyəti. Bu fəaliyyət növü şagirdin intellektual qabiliyyəti və vərdişlərinin inkişaf etdirilməsində əsas rol

oynayır və problemləri həlletmə, mühakimə yürütmə, sübutetmə, əlaqələndirmə kimi sonrakı daha mürəkkəb idraki bacarıqların əsasını təşkil edir. Fənn üzrə məzmun standartlarının fəaliyyət komponentinin tərtibində idraki bacarıqlar sistemli şəkildə işlənir.

İdraki fəaliyyətin mərhələləri Blumun təklif etdiyi: bilmə, anlama, tətbiqetmə, təhliletmə, sintezetmə və dəyərləndirmə taksonomiyasıdır [2].

• Emosional (affektiv) fəaliyyət. Emosional fəaliyyət şagirdlərin hiss, yanaşma, dəyərlərə münasibətinin və emosiyalarının inkişaf etdirilməsində əsas rol oynayır.

Emosional (affektiv) fəaliyyətin beş mərhələsi müəyyən edilmişdir: məqbulsayma, reaksiyavermə, dəyərləndirmə, təşkiletmə, dəyər və ya dəyərlər sistemini xarakterində əksetdirmə [4].

İdraki və emosional fəaliyyətlərə aid olan mərhələlər standartların tərtibi üçün müəyyənləşdirilmişdir [5].

• Hərəki (psixomotor) fəaliyyət. Bu fəaliyyət sahəsi əzələ inkişafını və hərəki fəaliyyəti əhatə edir. Psixomotor bacarıqları üç mərhələyə ayırırlar: təqlid (imitasiya), idarə (manipulyasiya), dəqiq icra.

- Təqlid mərhələsində şagirdlər müəllimin nümayiş etdirdiklərini təqlid edirlər ki, bu da hərəki bacarıqların ilkin mərhələsi kimi dəyərləndirilir.

- İdarə mərhələsində şagirdin hər hansı hərəki bacarığı müstəqil şəkildə, müəllimin yardımı olmadan nümayiş etdirməyə qabil olması nəzərdə tutulur.

- Dəqiq icra psixomotorun ən yüksək mərhələsidir. Bu mərhələdə şagirdlər hərəkətləri bacarıqla və dəqiq icra edirlər.

Kimya fənni kurikulumunda maddə və maddi aləm, kimyəvi hadisələr, eksperiment və modelləşdirmə, kimya və həyat məzmun xətlərində əks olunan biliklərin əldə edilməsində şagirdə praktik imkan yaradan fəaliyyət xətləri aşağıdakılardır:

1. *Maddələrin adlandırılması*
2. *Təyinetmə*
3. *Tərtibetmə*
4. *Xarakterizə etmə*
5. *İzahetmə*
6. *Problemlərin həlli*
7. *Kimyəvi təcrübələrin yerinə yetirilməsi*
8. *Məsələ və çalışma həlli, kimyəvi hesablamalar*
9. *Ünsiyyətqurma və əlaqələndirmə*
10. *Təqdimetmə*

Yuxarıda deyilənlərə bir qədər də aydınlıq gətirmək məqsədi ilə ədəbiyyat materiallarından istifadə etməklə, idrak fəaliyyətinin B.Blumun verdiyi mərhələlərin xüsusiyyətləri, hər mərhələyə uyğun təlim məqsədlərinin ümumi tipləri, şagirdlərin idrak fəallığının yüksəldilməsi üçün kimya fənni üzrə tapşırıq nümunələrini nəzərdən keçirək.

Bilmə - bu mərhələnin əsas xüsusiyyəti şagirdin müəyyən materialla (faktlardan tutmuş nəzəriyyələrə qədər) tanış olması, onu yadda saxlaması, yadda saxladıqlarını xatırlaması və ifadə etməsidir.

Müəllimin tapşırıqlar tərtib etməsi üçün fellər: oxuyun, tanış olun, yadda saxlayın, təkrar edin, yazın, təsvir edin, müəyyən edin, tapın, quraşdırın, yoxlayın, seçin, qruplaşdırın, adlandırın, həll edin, təsnif edin, sıralayın və s.

Tapşırıq nümunələri:

1. *Metalların elektrokimyəvi gərginlik sırası ilə tanış olun.*
2. *Təsirsiz qazların biratomlu olmasını yadda saxlayın.*
3. *Məhlullar mövzusuna aid öyrəndiklərinizi təkrar edin.*
4. *Turşuların kimyəvi xassələrinə aid reaksiya tənliklərini yazın.*
5. *Sulfat turşusunun kontakt üsulu ilə alınması qurğusunu təsvir edin.*
6. *Doymuş karbohidrogenləri beynəlxalq üsulla adlandırın.*

Anlama – Bu mərhələnin əsas xüsusiyyəti şagirdin öyrəndiyi materialı başa düşməsi, onu izah etməsidir. Bu da məsələni

bir ifadə vasitəsindən digərinə çevirmək, materialı izah etmək, qısa şərhini vermək, hadisənin sonrakı gedişatını və nəticələri proqnozlaşdırmaqda istifadə olunur.

Təlim məqsədlərinin tipləri:

• *Şagirdin fakt, qayda və prinsipləri başa düşməsi.*

• *Şagirdin mətn, sxem, qrafik və diaqramları izah etməsi.*

• *Şagirdin sözlə ifadə edilən məzmunu riyazi dilə çevirməsi.*

• *Şagirdin verilən məlumatlara əsaslanaraq gözlənilən nəticəni təxmin etməsi.*

Müəllimin tapşırıqlar tərtib etməsi üçün fellər: *dəyişin, çevirin, başqa şəkildə ifadə edin, təsvir edin, izah edin, şərhini verin, ümumiləşdirin, əlaqələndirin, fərqini izah edin, nəticə çıxarın, isbat edin, aydınlaşdırın, yekunlaşdırın, əsas ideyanı göstərin və s.*

Tapşırıq nümunələri:

1. *Kovalent rabitənin əmələgəlmə mexanizmini izah edin.*

2. *Turş duzların tərifini başqa şəkildə ifadə edin.*

3. *Oksidlərə aid biliklərinizi ümumiləşdirin.*

4. *İon kristal qəfəsli maddələrin xassələrini onlardakı kimyəvi rabitənin təbiəti ilə əlaqələndirin.*

5. *Azotun qrupunun nömrəsinə bərabər maksimum V valentlik göstərə bilməməsini əsaslandırın.*

6. *Turşuların əsas xassələrinin onun tərkibində olan hidrogen atomu ilə əlaqədar olmasını aydınlaşdırın.*

Tətbiqetmə - Bu mərhələnin əsas xüsusiyyəti şagirdin öyrəndiklərini konkret şəraitdə, qarşılaşdığı yeni situasiyalarda tətbiq etməyi bacarmasıdır. Buraya qayda, prosedur, qanun, prinsip və nəzəriyyələrin tətbiqi aiddir. Bu nəticələr materialın anlama səviyyəsindən yüksək səviyyədə mənimsənilməsini tələb edir.

Müəllimin tapşırıqları tərtib etməsi üçün fellər: *tətbiq edin, istifadə edin, işlədin, həll edin, isbat edin, göstərin, nümayiş etdirin, təşkil edin və s.*

Tapşırıq nümunələri:

1. *Kimyəvi reaksiyada başlanğıc maddənin qatılığının zamandan asılılıq qrafikini qurun.*

2. *Buz, su və buxarın eyni maddə olduğunu əsaslandırın.*

3. *Metalların elektrokimyəvi gərginlik sırasından istifadə edərək onların turşulara təsirini izah edin.*

4. *Oksigenin canlıların həyatı üçün əhəmiyyətini əsaslandırın.*

5. *İstənilən duzun laboratoriyada alınması üçün üsul təklif edin.*

Təhliletmə (analiz) – Bu mərhələnin əsas xüsusiyyəti şagirdin öyrəndiyi materialı onun strukturunu aydın şəkildə əks etdirən hissələrə bölə bilməsidir.

Təlim məqsədlərinin tipləri:

• *Şagirdlərin gizli olan və aşkar şəkildə verilməyən fikirləri müəyyən etməsi.*

• *Şagirdin faktları və nəticələri bir-birindən fərqləndirməsi.*

• *Şagirdin verilənləri əhəmiyyətlilik dərəcəsinə görə dəyərləndirməsi.*

• *Şagirdin məntiqi mühakimələrdə səhv və nöqsanları müəyyən etməsi.*

Müəllimin tapşırıqlar tərtib etməsi üçün fellər: *təhlil edin, hissələrə bölün, müqayisə edin, təsnif edin, fərqləndirin, müəyyən edin, tapın, təkzib edin, yoxlayın, təsdiq edin, nəzarət edin, tədqiq edin, nəticə çıxarın, əsaslandırın, sadələşdirin və s.*

Tapşırıq nümunələri:

1. *Bəzi metalların rütubətli havada qaldıqda səthlərində baş verən dəyişiklikləri təhlil edin.*

2. *Kimyəvi reaksiyanın sürətinə təsir edən amilləri səciyyələndirin.*

3. *İnsanın dəm qazından zəhərlənməsinin səbəbini araşdırın.*

4. *Sulfat turşusunun kontakt üsulu ilə istehsalının əsasında duran elmi-texnoloji prinsipləri müəyyən edin.*

5. *Elektrolizin mahiyyətini ifadə etmək üçün ona qədər olan prosesləri hissələrlə*

*təhlil edin.*

6. *Molekulyar quruluşlu maddələrin xassələrini onların quruluşları ilə əlaqəli şəkildə müəyyən edin.*

7. *Valentliyi kimyəvi rabitə nəzəriyyəsi baxımından izah edin.*

Sintezetmə - Bu mərhələnin əsas xüsusiyyəti şagirdin elementlərdən (hissələrdən) kombinə etməklə (birləşdirməklə) yeni bir bütövü formalaşdırmasıdır. Belə fəaliyyətin məhsulu hər hansı bir məlumat (məruzə, çıxış və s.), plan, sxem ola bilər (şifahi, yazılı formada).

Təlim məqsədlərinin tipləri:

• *Şagirdin yaradıcı inşalar yazması.*

• *Şagirdin təcrübə aparılması planını tərtib etməsi.*

• *Şagirdin hər hansı bir problemin həlli planını təklif etməsi.*

Şagirdin fikir, mülahizə və mühakimələri aydın və dəqiq meyarlara əsaslanmalıdır (quruluş, məntiq, məqsədəuyğunluq). Belə təlim nəticələri əvvəlki mərhələlərə uyğun nəticələrə də nail olunduğunu göstərir.

Təlim məqsədlərinin tipləri:

• *Şagirdin mətn şəklində materialın qurulma, tərtibedilmə məntiqini dəyərləndirməsi.*

• *Şagirdin verilənlər və ona əsaslanan qərarın uyğunluğunu qiymətləndirməsi.*

• *Şagirdin hər hansı fəaliyyətin nəticəsini qiymətləndirməsi.*

Təlim prosesində şagird fəaliyyətinin yuxarıda göstərilən sahələri təcrid olunmuş şəkildə deyil, bir-biri ilə əlaqəlidir. Bunlardan daha əhatəli olan idrak fəaliyyətini, onun mərhələlərini, üsul və vasitələrini, hər bir mərhələnin xüsusiyyətlərini kimya müəllimi yaxşı bilməli və həyata keçirdiyi təlim məqsədlərində nəzərə almalıdır.

*Rəyçi: dos. H.Cəfərov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün kimya fənni üzrə təhsil proqramı (kurikulumu) (VII-XI siniflər). Bakı, 2013.

2. Bloom B., Max D.Engelhart, Edvard J.Frust., Walker H.Hill., David R.Krathwol. Taxonomu of educational objectives. The classification of educational goals. Handbook I: Cognitive domain. New York, David McKay 1956.

3. Krathwol David R., Benjamen S.Bloom, Brtarn B.Masia. Taxonomy of educational objectives. The classification of educational goals. Handbook II: Afective domain. New York, David McKay 1964.

4. Gronland N. Vritinq instructional obectives for teaching and assessment. 2004, Pearson Prentice Hall.

5. Süleymanova A. Fənn kurikulumlarında məzmun standartları. Kurikulumların hazırlanması və tətbiqi məsələləri. Bakı: Kövsər, 2008.

**А.Мамедова**

**Компоненты содержания стандартов и их учот на уроках**

**Резюме**

В статье представлены свойства этапов мышления (Таксономии Блума) учащихся, общие типы целей обучения по каждому этапу, образцы заданий по химии для повышения активности учащихся.

**A.Mammadova**

**The use of of content standards components**

**Summary**

The article presents the properties of students' thinking (Bloom's Taxonomy) on different stages, basic types of learning objectives for each stage, samples of jobs in the chemistry to increase the students' activities.

# ŞAGİRDLƏRİN BİLİK, BACARIQ VƏRDİŞLƏRİNİN HESABA ALINMASI ÜSULLARI

**Səhyəddin Məmmədov, Şahismayıl İsmayılov**
***AMİ-nin Mingəçevir filialının baş müəllimləri***

***Açar sözlər:*** *bacarıq, anlayış, stimul, təsəvvür.*
***Ключевые слова:*** *утиные, понятие, стимул, представление.*
***Key words:*** *ability, conception, stimulus, imagination.*

Şagirdlərdə yalnız onların kifayət qədər tam və konkret təsəvvürlərə malik olduqları hadisələr və proseslər haqqında anlayışlar formalaşa bilər. Biz təlim prosesində birinci növbədə anlayışların izahı üçün zəruri olan təsəvvürləri intişar etdiririk. Bu təsəvvürlərdə öz ümumiləşməsini anlayışlarda tapan tarixi hadisələrin mühüm əlamətlərini ayırırıq. Biz təsəvvürləri formalaşdırmaqla anlayışlar üçün özül qoyuruq. Anlayışları formalaşdırmaqla həm də şagirdlərin təsəvvürlərini inkişaf etdiririk, zənginləşdiririk və konkretləşdiririk. Bununla bərabər təsəvvür və anlayışların formalaşdırılması metodikasını işləyib hazırlamaq üçün hansı priyomların təsəvvür və anlayışların formalaşmasına daha səmərəli xidmət etdiyini aydın surətdə müəyyən etmək tələb olunur. Təsəvvürlərin və anlayışların formalaşmasına dair bəzi priyomlar bir-birindən fərqlənir. Digərləri isə o qədər uyğun gəlir ki, təsəvvürlərin formalaşdırılmasına dair işin haradan başlandığını və anlayışların formalaşdırılmasına dair işin harada qurtardığını seçmək çətin olur.

Tarix fənninin tədrisində böyük didaktik əhəmiyyəti olan məsələlərdən biri də tarixi anlayışların öyrənilməsidir. Bu, hər şeydən əvvəl, elmi əsasların şüurlu surətdə mənimsənilməsini tələb edir.

Anlayışların formalaşması zamanı biz şagirdlərin fikri fəaliyyətinin stimullaşdırılmasına və bu fəaliyyətə rəhbərlik edilməsinə yönəldilmiş priyom tətbiq edirik. Məktəblilər müəllimlərin rəhbərliyi altında hadisəni fikrən hissələrə ayırır, hadisələrin mühüm əlamətlərini seçir, onları qeyri-mühüm əlamətlərdən ayırır və eyni cür hadisələrin ən mühüm əlamətlərini ümumiləşdirirlər. Məktəblilərdə tarixi anlayışların formalaşmasına aparıb çıxaran bu məntiqi fəaliyyət tarixin təlimində çox zaman tarixi təsəvvürlərin formalaşmasına xidmət edən yeni materialın qavranılması ilə uzlaşdırılır. Məsələn, dərslikdə tablonu və yaxud rəsmləri təhlil edərkən, onların məzmununu təhlil və sintez edərkən müəllim şagirdlərdə öyrənilən hadisələrin mühüm əlamətlərini əks etdirən zaman bu əlamətləri ümumiləşdirən anlayışların formalaşmasına dair iş aparır. Tarixin təlimində anlayışların formalaşmasına dair aparılan işin yolları və priyomları müxtəlifdir. Birinci növbədə formalaşdırılan anlayışların məzmun və mürəkkəbliyindən asılıdır. Əgər bəzi maddi əşyalar (karpun, kotan, gəmi) haqqındakı anlayışlar bir-iki təsvirin, əşyanın təhlili əsasında, yəni bilavasitə təsəvvürlərin zəminində kifayət qədər dolğun şəkildə formalaşdırıla bilərsə, ictimai hadisələr və səbəb-nəticə əlaqələri haqqındakı mürəkkəb anlayışların formalaşdırılması bütün tədris ili boyunca davam edir.

Şagirdlərin anlayışlarının dərinliyi və möhkəmliyi, əsas etibarilə müəllimin şagirdlərdə fikri fəaliyyəti necə oyada bilməsindən və ona necə rəhbərlik edə bilməsindən asılıdır. Məktəblərimizdəki mövcud təlim şəraiti imkan verir ki, şagirdlər ümumi tarixi hadisələri yerli şəraitlə yaradıcı şəkildə əlaqələndirərək ümumiləşdirmələr aparmaqla öyrənsinlər. Bəzən elə hallar olur ki, şagirdlərə nə qədər deyilsə də, onlar tarixi materialı mənimsəyərkən və onu şərh edərkən əsas məsələlərdən yan keçir və onu bilməyin əhəmiyyətini lazımi dərəcədə dərk etmirlər. Bəzən də elə olur ki, müəllim dərsə lap yaxşı hazırlaşan şagirdlərin şərhini kəsir və təhlili məntiqi suallara istiqamətləndirir. Bu isə şagirdlərin tarixi bilikləri, anlayışları və s. müstəqil şəkildə mənimsəmək və tarixi hadisələrdən müstəqil surətdə baş çıxarmaq bacarığının yaradılması işinin pozulmuş olduğunu göstərir. Bəs bu cür vəziyyətdən hansı yolla çıxmaq olar? Şagirdləri hansı vasitələrlə bu cəhətlərə ciddi fikir verməyə vadar etmək mümkündür?

Söz yox ki, həmin vəziyyət bir çox səbəblərdən irəli gəlir. Bu səbəbləri harada axtarmaq məsələsinə gəldikdə isə müəllim və şagirdlərin qarşılıqlı fəaliyyətinə, öyrədilən materialın özünə bir daha ciddi nəzər salmaq lazım gəlir. Ona görə də tarixi anlayışların mənimsənilməsi prosesində müəllim tərəfindən şagirdlərin bilik sahəsindəki müvəffəqiyyətlərinə yekun vurmağa, hiss olunan çatışmazlığı vaxtında aradan qaldırmağa imkan verən qiymətləndirmə işinə bu cəhətdən yaradıcı şəkildə yanaşmaq böyük əhəmiyyət kəsb edir. Anlayışların formalaşdırılmasına dair işdə evrestik müsahibə böyük yer tutur. Bu müsahibədə müəllim öz sualları ilə şagirdlərin fikrini addımbaaddım, pillə-pillə tarixi hadisələrin mahiyyətinə nüfuz etmək yolu ilə aparır. Müəllim tarixi anlayışları mühüm əlamətlərinə ayırmaq və ümumiləşdirmək üçün şagirdlərə mətnlə, əyani vasitələrlə, tarixi sənədlərlə bağlı tapşırıqlar verir. Tematik cədvəllər, çertyojlar tərtibini şagirdlərin özlərinə tapşırır. Bu prosesin həyata keçirilməsi qruplarla iş zamanı şagirdlərin məntiqi təfəkkürünü, tədqiqat işini inkişaf etdirir.

Yeni materialın öyrənilməsi zamanı artıq tanış anlayışdan istifadə edilməsi, ona yeni faktlar əlavə edilməsi şagirdlərin şüurunda anlayışın dərinləşməsinə, zənginləşməsinə, konkretləşdirilməsinə aparıb çıxarır.

Təlimdə mühüm yer tutan anlayışların növündən biri tarixi proseslər haqqında anlayışlardan ibarətdir.

Tarixi proseslər haqqında anlayışların formalaşmasında, həmçinin tarixi hadisələrin ardıcıllığını və qarşılıqlı əlaqəsini göstərən sxematik əyani vasitələr, tabaşirlə çəkilən sxemlər və rəsmlər, cədvəllər, aplikasiyalar böyük rol oynayır.

Şagirdlərdə tarixi proseslər haqqında anlayışların formalaşmasına dair işdə müəllim səbəb-nəticə əlaqələrinin sabitliyini və zəruriliyini göstərmək yolu ilə cəmiyyətin inkişafının bəzi qanunauyğunluqlarını başa düşməyə aparıb çıxarmağa çalışır. Beləliklə, cəmiyyətin inkişafının elmi surətdə başa düşülməsinin ilkin əsaslarını qoyur.

Tarixi təsəvvürlərin formalaşdırılması zamanı müəllim şagirdlərin iş fəaliyyətinin əsas cəhətinə (obrazların qavranılması, onların yaddaş və təxəyyül vasitəsi ilə yenidən canlandırılması), tarixi anlayışların formalaşdırılması işində isə şagirdlərin analitik – sintetik fikri fəaliyyətinə istinad edir. Bu fəaliyyətin həyata keçirilməsində rollu oyunlar və digər təlim üsullarının tətbiqi xüsusi əhəmiyyət kəsb edir (hadisələrin hissələrə ayrılması, onların müqayisə edilməsi, ümumi və fərqli cəhətlə ayrılması, ümumiləşdirmə və s.). Təsəvvür və anlayışların formalaşdırılmasına dair iş üsullarındakı əsas fərq bundan ibarət-

dir. Ümumi cəhət odur ki, təsəvvürlərin formalaşdırılmasına dair işdə şagirdlərin analitik – sintetik fikri fəaliyyətini təmin etmədən (mühüm cəhətin seçilməsi, ayrılması, qavrayışların dərk edilməsi), anlayışların formalaşdırılması zamanı isə hissi obrazlara istinad etmədən keçinə bilmərik.

Təbiidir ki, yeni tarixi hadisələr və yaxud onların əlamətləri haqqında materialı ilk dəfə verərkən şagirdlərdə parlaq konkret təsəvvürlərin formalaşdırılmasına yönəldilən priyomlar əsas rol oynayır. Hadisələrin mahiyyətinə daha dərindən nüfuz etdikcə anlayışların formalaşdırılmasına yönəldilmiş priyomların rolu yaranır. Daha ümumi anlayışların, məsələn, "mədəniyyət" anlayışının formalaşdırılması zamanı müəllim bilavasitə konkret təsəvvürlərə deyil, əvvəllər formalaşmış daha xüsusi anlayışlara, bu halda "elm", "yazı", "incəsənət" kimi anlayışlara istinad edir. Bu tarixi prosesin dövriləşdirilməsi və qanunauyğunluqları haqqında anlayışların formalaşdırılmasına daha artıq dərəcədə aiddir.

Şagirdlərin biliklərinin yoxlanılması və uçotu tarixin tədrisi metodikasının ən mürəkkəb məsələlərinə aid olub, dəfələrlə metodik ədəbiyyatda müzakirə edilmişdir.

Bu işdə bir də belə bir cəhət diqqəti cəlb edir ki, "qiymətləndirmədə nəzərəçarpan hər hansı bir haqsızlıq şagirdlərin təlimdən soyuması, əsl bilik və bacarıq uğrunda mübarizə etməkdən çəkinməsi ilə nəticələnə bilər" [2, səh 203].

Buna görə də şagirdlərin rəsmiləşmiş biliklərinin aşkar olunmasına yönəldilmiş yoxlama testləri ilə bərabər, tarix fənnini tədris edən müəllimin arsenalında sərbəst forma və həcmli "açıq" cavabı olan tapşırıqlar da olmalıdır. Subyektləşdirilmiş biliklərin yoxlanılması və qiymətləndirilməsi üzrə bəzi meyarlar təklif olunur: şagirdlərin tapşırıqda verilən və ya müstəqil tapılan səmərəli iş üsulundan istifadə bacarığı; mənbədən (və ya mənbələrdən) ən əsas, əhəmiyyətli nəticənin sübutu və ya öz variantının əsaslandırılması, keçmişin faktlarının qiymətləndirilməsi üçün zəruri olanları seçmək bacarığı; müvafiq anlayışlardan istifadə bacarığı; öz cavabını məntiqi ardıcıllıqla düzmək bacarığı; onu lazımi formaya salmaq bacarığı və s. Qeyd olunan meyarlar əsasında müəllim şagirdlərin yoxlama tapşırıqlarını necə yerinə yetirdiyini yoxlaya və onları qiymətləndirə bilər.

Diskussiya bacarıqlarının qiymətləndirilməsi: Burada əsasən dəlillərin əsaslandırılması, diskussiya iştirakçılarının polemika aparmaq bacarıqları götürülür. Müəllim aşağıdakıları qiymətləndirə bilər: faktlara (mənbələrdən, xəritələrdən, illüstrasiyalardan, statistik məlumatlardan və s. götürülmüş) əsaslanmış məlumatın şərhini və ya ona əlavələri; oxşarlığın müəyyənləşdirilməsini; səhvlərə diqqət yetirilməsini.

Debatların qiymətləndirilməsi: Debatın nəticələrinin yekunlaşdırılmasının ən yaxşı forması hər iki tərəfə müraciət olunmuş - "Rəqibin ən yaxşı dəlilləri hansılar idi?" – sualından istifadədir. Müəllim işi fərdi və ya cütlərlə qiymətləndirə bilər.

Yaradıcı tapşırıqların qiymətləndirilməsi zamanı əsas diqqəti şagirdin nəyi mənimsədiyinə və cavablarında nəyi çatdırdığına, tapşırığı nə dərəcədə müstəqil yerinə yetirdiyinə, təlim işinin hansı üsul və bacarıqlarından istifadə etdiyinə yönəltmək lazımdır.

Essenin qiymətləndirilməsi zamanı isə essenin qiymətləndirilməsi meyarları:

– essenin məzmununun anlaşılması və tam açılması;

– öz fikrinin faktlarla, mənbə məlumatları ilə, nəzəri dəlil və mülahizələrlə inandırıcı şəkildə əsaslandırılması;

– terminlərdən, tarixi faktlardan və

digər tarixi məlumatlardan düzgün istifadə;

– düşüncələrin məntiqli və aydın olması;

– emosional – dəyər münasibətlərinin ifadəsi;

– esse stilinin həmahəngliliyi və ifadəliliyi məqsədəuyğundur.

Qruplarda işləmək bacarığı

Qrupun işi verilərkən onun meyar cədvəli də hazır olmalıdır. Şagirdlərə xatırladılmalıdır ki, hər bir kəsin işi qrupun işinə xidmət edir və qrupun qiymətinə təsir edir. Bu zaman iş vərəqindəki tapşırıqların yükü bərabər verilməli, verilən vaxt cədvəlini əhatə etməlidir. Qrupların işi təqdim olunarkən bir qrup digər qrupun işinə münasibət bildirməli, əlavə fikirlər olarsa söyləməlidir. Nəticələrin çıxarılmasında bütün kollektivin iştirakı təmin edilməlidir.

Ay, rüb və yaxud yarımillik üzrə ümumi qiymət orta bal hesab edilə bilər. Şagirdlərin öz işlərini və qrupun fəaliyyətində iştirakını qiymətləndirməyin (özünüqiymətləndirmə yolu ilə) nəzərə alınması çox faydalıdır. Bu zaman qiymətləndirmə meyarları ilə şagirdləri əvvəlcədən tanış etmək çox vacibdir. Müəllim yuxarıda qeyd olunan meyarlara öz qərarı ilə digər parametrləri də əlavə edə bilər.

*Rəyçi: dos. İ.Cavadov*

**İstifadə edilmiş ədəbiyyat**


1. Tarixin tədrisində müasir üsullar (Şərhlər, tövsiyələr, nümunələr). Bakı, 2000.
2. Veysova Z. Fəal dərsin aparılması üzrə tövsiyələr. Bakı, 2004.
3. Veysova Z. Fəal/İnteraktiv təlim: müəllimlər üçün vəsait. Bakı, 2003.


**С.Мамедов,**
**Ш.Исмайлов**

**Методы принятия в счет знаний, навыков и умений учащихся**

**Резюме**

Формирование исторических понятий и представлений, показ концептуальных знаний и их методика органически связаны друг с другом. У учащихся могут сформироваться представления о конкретно известных им случаях и процессах. Для этого истолковываются необходимые компоненты объяснения этих понятий.

**S.Mammadov,**
**Sh.Ismayilov**

**Evaluation of students’ knowledge, abilities and skills**

**Summary**

The article is dedicated to the formation of historical conseptions and imaginations. It is noted that demonstration of conceptual knowledge and its methods are organically connected with each other. Students’ mentality is formed by some imaginations about the concrete accidents and process. That is why it is necessary to form important imaginations to understand the conception.

# ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNDƏ AZƏRBAYCAN DİLİ FƏNNİ ÜZRƏ YENİ MƏZMUNUN XÜSUSİYYƏTLƏRİ

**Günay Mirzəzadə**
***Azərbaycan Respublikası Təhsil Problemləri İnstitutunun elmi işçisi***

***Açar sözlər:*** *Azərbaycan dili, məzmun, xüsusiyyətlər, dinləmə, oxu, yazı, dil qaydası.*
***Ключевые слова:*** *Азербайджанский язык, содержание, особенности, аудирование, чтение, письмо, правила языка.*
***Key words:*** *Azerbaijan language, content, features, listening, reading, writing, grammar.*

Ümumtəhsil məktəblərinin V-XI siniflərini əhatə edən əsas təhsil pilləsi şagirdin həyatında istər özünü dərk etməsi, istərsə də ibtidai təhsil pilləsində qazanılmış bilik və bacarıqların inkişaf etdirilməsində böyük əhəmiyyət kəsb edir. Həmin mərhələ onun cəmiyyətə gərəkli şəxsiyyət kimi formalaşması üçün uzun bir zaman kəsiyini özündə birləşdirir. Bu işdə ən vacib amil şagirdə Azərbaycan dilinin - ana dilinin incəlikləri, gözəlliklərinin çatdırılmasından ibarətdir. Çünki yalnız ana dilini bilən, ən əsası isə bu dili hiss edərək ona məxsus bacarıqları özündə ehtiva etdirən şəxs milli-mənəvi dəyərlərə malik şəxsiyyət ola bilər. Təsadüfi deyil ki, son illərdə dövlətimizin bu sahəyə qayğısı daha da artmışdır. Ümummilli liderimiz Heydər Əliyev dil məsələsinə dövlət siyasətinin tərkib hissəsi kimi yanaşırdı. Ulu öndər qeyd edirdi ki, xalqın, insanın öz ana dilindən əziz bir şeyi ola bilməz. Bu mənada, Azərbaycan dilinin orta məktəblərdə xüsusi həssaslıqla tədris olunması olduqca vacibdir. Təhsil haqqında Azərbaycan Respublikasının Qanununa (2009) əsasən “Ümumi təhsil pilləsinin dövlət standartları və proqramları (kurikulumları)” (2010) adlı sənəd hazırlanmışdır. Bu sənədə əsaslanaraq böyük bir işçi qrupunun iştirakı ilə “Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün Azərbaycan dili üzrə təhsil proqramı (kurikulumu)” işlənib hazırlanmışdır. Sənəddə fonetik, leksik, qrammatik səviyyədə dil xüsusiyyətlərinin, yazılı və şifahi nitq, dinləyib-anlama bacarıqlarının, Azərbaycan dilinə ana dili və dövlət dili kimi hörmət və sevginin daha da artması, ana dilini şüurlu olaraq dərk etməsi və s. kimi məsələlər öz əksini tapmışdır.

Azərbaycan dili məktəbdə, ictimai həyatda və milli səviyyədə zəruri ünsiyyət vasitəsidir. Azərbaycan dili fənnini öyrənərkən şagirdlər danışma, dinləmə, ədəbi dil normalarına əsaslı oxuma və yazma ilə bağlı bacarıqları inkişaf etdirirlər. Bu imkan verir ki, şagirdlər özlərini yaradıcı və bədii şəkildə ifadə etsin və digərləri ilə ünsiyyət imkanlarını artırsınlar. Fənn kurikulumunda müəyyən olunmuş ümumi təlim nəticələrini reallaşdırmaq, şagirdlərin əldə edəcəyi bilik və bacarıqları daha aydın təsvir etmək və istiqamətləndirmək üçün Azərbaycan dili təliminin məqsəd və vəzifələrinə əsasən təhsilin bütün pillələri üzrə dörd məzmun xətti müəyyən edilmişdir: dinləyib – anlama və danışma, oxu, yazı, dil qaydaları.

Dinləyib-anlama və danışma məzmun xəttinə əsasən şagirddə ibtidai sinifdə qaza-

* 5

nılmış bilik, bacarıq və vərdişlər daha da inkişaf etdirilir. Şagirdin həm dərs prosesində müəllim və yoldaşlarının, həm də məktəbdən kənarda, həmçinin radio və televiziya vasitəsilə qəbul etdiyi informasiyaları dinləyib-anlama vərdişlərinin inkişaf etdirilməsi məqsədi qoyur. "Şagird istənilən mətni dinləyir, fakt və hadisələri əsaslandırmaqla ona münasibət bildirir, düzgün nitq qurur; nitqində məqsədyönlü olaraq dil vahidlərindən istifadə edir, uyğun səs tonu, intonasiya, ritm, jest və mimikalar istifadə edir, müxtəliftipli və formalı mətnlər qurur, dinləyici auditoriyasına uyğun üslub seçir, müzakirə etmə bacarığını inkişaf etdirir". Bu bacarıqları şagirdlərdə formalaşdımaq müəllimin qarşısına qoyduğu əsas məqsədə çevrilir. Ona görə də bu məzmun xətti birinci yerdə vurğulanır.

Oxu məzmun xəttində oxu bacarıqlarına dair standartlar öz əksini tapır. Şagirddə dil duyumunun və oxu vərdişlərinin yaradılması, inkişaf etdirilməsi, ədəbi dil normalarına əməl etməklə müstəqil, düzgün və ifadəli oxuma, verilmiş mətn üzərində işləmə, mətnin məzmunu və sözün mətndaxili mənasının müəyyənləşdirilməsi, mətnin hissələrinin, abzaslarının, cümlələr, söz birləşmələri və onlar arasındakı tabelilik və tabesizlik əlaqələrinin tapılması kimi bacarıqlar inkişaf edir.

Yazı məzmun xətti şagirddə orfoqrafiya qaydalarına əməl edilməsi, yazılı nitqin inkişaf etdirilməsi - müxtəlif tipli (nəqli, təsviri, mühakimə) və formalı (inşa, hekayə, esse) rabitəli mətnlər qurma, əməli yazılar (ərizə, tərcümeyi-hal, elan, məktub, teleqram, izahat, arayış, protokol, hesabat, akt) yazma kimi bacarıqlarının formalaşdırılması və inkişaf etdirilməsində əsas rol oynayır.

Dil qaydaları məzmun xətti şagirdin ibtidai sinifdə tanış olduqları fonetik, leksik, qrammatik anlayışların inkişaf etməsi, orfoqrafiya qaydalarına riayət olunması, durğu işarələrindən yerli-yerində istifadəetmə bacarıqlarının mənimsədilməsi üçün gərəkdir. Ən əsası isə şagirdi mürəkkəb dilçilik terminləri ilə yükləmədən onlarda bu bacarıqların praktiki olaraq formalaşdırılması təmin edilir.

Ana dilinin öyrənilməsi yeni kurikulumda xüsusi yer tutur. Çünki Azərbaycan dilinin öyrənilməsi şagirdlərdə ünsiyyət bacarığının təməlini təşkil edir, düşünmə, öyrənmə və danışma bacarıqlarını formalaşdırır. Təsadüfi deyil ki, ana dili düşünmə, öyrənmə, danışma vasitəsinə çevrilir.

Tədris prosesində metodikanın düzgün müəyyənləşdirilməsi, bu zaman məzmun xətlərininin mahiyyətinə diqqət yetirilməsi olduqca mühüm əhəmiyyət kəsb edir.

Azərbaycan dili fənni üzrə müəyyən olunmuş məzmun xətləri - dinləyib-anlama və danışma, oxu, yazı və dil qaydaları birbiri ilə əlaqəlidir. Bu səbəbdəndir ki, onlara aid olan məzmun standartlarının verilməsində də inteqrativlik nəzərə alınmışdır.

Tədris prosesində ən vacib amillərdən biri də təlim materiallarının planlaşdırılmasıdır. Planlaşdırma dərsin özəyini təşkil edir. Ona görə də planlaşdırmanın yaradılması "müəllimlərin qarşısında duran ən mühüm vəzifədir". Məlum olduğu kimi, planlaşdırmanın cari və perspektiv (illik) olmaqla iki növü müəyyənləşdirilmişdir. İllik planlaşdırma apararkən müəllim, ilk növbədə, məzmun standartlarına diqqət yetirməlidir. Məzmun standartları məzmun xətlərində ehtiva olunur. Müəllim il ərzində qarşıya qoyulmuş məqsədə çatmaq, yəni təlim nəticələrindəki bacarıqları şagirdlərdə formalaşdırmaq üçün planlaşdırma apararkən seçəcəyi alt standartların müəyyənləşdirilməsində onların aid olduğu məzmun xətlərinin hər birini özünəməxsus dərəcədə nəzərə alması mühüm əhəmiyyət kəsb edir. Çünki təlim nəticəsindəki bacarıqlar bütün məzmun xətlərinə aiddir və onların kompetensiya şəklində for-

malaşdırılması məqsədəuyğun hesab olunur. Düşünmək olar ki, hər hansı bir mövzunu keçərkən bir deyil, bir neçə standartı reallaşdırmaq mümkündür. Məsələn, mətn üzərində iş apararkən həm məzmun və ideyanın müəyyənləşdirilməsi, həm müəyyən dil qaydalarına aid tapşırıqların yerinə yetirilməsi mümkündür. Təbii ki, nəzərdə tutulmuş üç, dörd və ya beş standartın bir dərsdə reallaşdırılması mümkün olmaya bilər. Ancaq nəzərə almaq lazımdır ki, həmin standartları bir neçə saatda da reallaşdırmaq olar. Onu da nəzərə almaq lazımdır ki, kurikulumlarda təlim forması və üsullarına təlim strategiyasının mühüm tərkib hissəsi kimi yanaşılmalıdır. Onların mahiyyəti və əsas xüsusiyyətləri yeni tələblər əsasında şərh edilməlidir. Unudulmamalıdır ki, bu gün kurikuluma əsasən tədris olunan dərslər şagirdləri şəxsiyyət kimi yetişdirmək məqsədini güdür. Beləliklə, Azərbaycan dili fənni üzrə müəyyənləşdirilmiş məzmun xətləri bir-biri ilə sıx əlaqədə olub dil üzrə ümumi bacarıqları ehtiva etdiyi üçün təlim materiallarınının planlaşdırılmasında məzmun və alt standartlar da mütəmadi olaraq əlaqəli şəkildə əks olunmalıdır.

Unutmaq olmaz ki, ana dilimiz zəngindir. Ona görə də istər yazılı, istər şifahi nitqdə sözü düzgün və yerində ifadə etmək, nitqdə məntiqi ardıcıllığı gözləmək, şagirdin qarşısında qoyulan əsas tələblərdən biri olmalıdır. Bu, şagirdin bir şəxsiyyət kimi yetişməsində başlıca rol oynayır. Ulu öndər həmişə dili ədəbiyyatla, mədəniyyətlə, mənəviyyatla, vətənpərvərliklə bağlayırdı. O, Azərbaycan dilini millətin milliliyini saxlayan ən böyük vasitə sayırdı.

*Rəyçi: dos. N.Nəcəfov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasının Ümumtəhsil məktəbləri üçün Azərbaycan dili üzrə təhsil proqramı (kurikulumu). Bakı: 2012.

2. Ağayev Ə. Təlim prosesi: ənənə və müasirlik. Bakı: Adiloğlu, 2006.

3. Əlizadə Ə. Yeni pedaqoji təfəkkür. "Azərbaycan məktəbi", 2013, № 5.

**Г.Мирзазаде**

**Особенности нового содержания по предмету Азербайджанский язык**

**Резюме**

Эта статья о основных особенностях нового содержания азербайджанского языка. Здесь была описана содержание сюжетной линии и определенный навыки.

**G.Mirzazadeh**

**Main features of new content on Azerbaijan language in secondary schools**

**Summary**

The article is about the main features of new content of Azerbaijan language. All different ways of developing language skills have been discussed in this article.

***Təhsil islahatı fəaliyyətdədir***

# SİNİFDƏNKƏNAR MƏŞĞƏLƏLƏRDƏ FƏAL TƏLİM METODLARININ TƏTBİQİ

**Əli Hüseynov**
***Azərbaycan Dövlət Pedaqoji Universitetin kafedra müdiri, pedaqoji elmlər doktoru, professor, əməkdar müəllim***

**Aynur Mirzəyeva**
***həmin universitetin dissertantı***

***Açar sözlər:*** *sinifdənkənar, dərnək, epizodik və kütləvi məşğələlər, interaktiv təlim metodları, layihələrin hazırlanması, layihələrin növləri, vitaminlər, ekoloji böhran, atmosfer, hidrosfer.*

***Ключевые слова:*** *внекласснаяработа, кружок, эпизодические и массовые занятия, интерактивные методы обучения, подготовка проектов, виды проектов, витамины, экологическая катастрофа, атмосфера, гидросфера.*

***Key words:*** *out of class, circle, episodic and mass studies, interactive teaching methods, preparation of projects, kinds of projects, vitamins, ecological catastrophe, atmospher, hidrosphere.*

Müasir təlim prosesi şagirdlərin daha geniş bilik əldə etmələri üçün real imkanlar yaradır. Bu baxımdan fənlərin tədrisi prosesində məktəblərdə sinifdənkənar məşğələlərin təşkili və keçirilməsi çox vacibdir.

Adətən, sinifdənkənar məşğələlər bütün şagirdlər üçün məcburi olmayıb, fənnə marağı olan şagirdləri əhatə edir. Sinifdənkənar məşğələlərin məzmunu tədris proqramı ilə deyil, şagirdlərin maraq dairəsi ilə müəyyən olunur. Yaxşı təşkil olunmuş sinifdənkənar məşğələlər mühüm təlim-tərbiyə əhəmiyyəti daşıyır. Aparılan belə işlər şagirdlərin dərs zamanı əldə etdikləri biliklərin dərk edilməsinə, dərinləşdirilməsinə və genişlənməsinə imkan verir. Bu, əsasən, onunla əlaqədardır ki, sinifdənkənar işlər zamanı, şagirdlərin müstəqil fəaliyyətinə və qabiliyyətlərinin inkişafına imkan yaranır [1,2]. Sinifdənkənar məşğələlərin aparılması zamanı şagirdlərin hərtərəfli maraqları nəzərə alınmalı, bu maraqlar dərinləşdirilməli və lazımi istiqamətdə inkişaf etdirilməlidir. Belə işlərin təşkilində sərgilərin təşkili, divar qəzetlərinin, əyani vasitələrin hazırlanması mühüm əhəmiyyət daşıyır. Bu işlər zamanı təbiətin qorunması ilə bağlı ictimai faydalı əməkdən istifadə edilə bilər. Bütün bu məşğələlər zamanı şagirdlər müxtəlif elmi-populyar və elmi-bioloji ədəbiyyatdan istifadə etməyi öyrənirlər. Sinifdənkənar məşğələlərdə şagirdlər boş vaxt keçirməkdən uzaqlaşırlar, boş vaxtlarını maraqlı obyektləri müşahidə etməyə, elmi-kütləvi ədəbiyyatları oxumağa sərf edirlər.

Beləliklə, biologiyadan sinifdənkənar

işlərin aparılması məktəb biologiya kursu üzrə təlim-tərbiyə məsələlərinin, həmçinin bütövlükdə ümumtəhsil məktəblərinin qarşısında duran bir çox ümumi pedaqoji məsələlərin həllində böyük əhəmiyyət daşıyır. Məktəbdə biologiyadan sinifdənkənar məşğələlərin aşağıdakı formalarını müəyyən etmək olar:

1. Fərdi məşğələlər; 2. Epizodik qrup məşğələləri; 3. Dərnək məşğələləri; 4. Kütləvi təbiət tədbirləri.

Bununla bərabər, təbiətdə müşahidələr və təcrübələrin aparılması, divar qəzetlərinin, bitkilərin və digər əyani vasitələrin, bülletenlərin və s. hazırlanması sinifdənkənar tədbirlərin bütün formalarına aid edilə bilər. Ümumi biologiya kursu üzrə sinifdənkənar işlər, biologiya fənninin digər kurslarında olduğu kimi, tədris materialının genişləndirilməsini və dərinləşməsini, dərslərdə əldə edilən biliklərin dərk olunmasını və ümumiləşdirilməsini, elmin müəyyən sahələrinə olan maraqların formalaşmasını, peşə yönümünün istiqamətləndirilməsini nəzərdə tutur. Bütün bu məsələlər X-XI sinif şagirdləri ilə işlərdə xüsusi əhəmiyyət daşıyır. Gənc qız və oğlanların yaş xüsusiyyətləri belədir ki, onlarda əvvəllər və yeni əldə etdikləri faktik materialların məntiqi təhlili yüksək olur. İlk baxışdan yuxarı sinifdə aparılan sinifdənkənar işlər aşağı siniflərdəkindən çox az fərqlənir. Bu işlərə fərdi epizodik məşğələlərin aparılması, şagirdlərin evdə və ya məktəbdə təcrübə qoyub, müşahidə aparmaları, mövcud mövzu ilə bağlı ədəbiyyatla tanış olmaları, lazımi məlumat toplamaları aid edilə bilər. Buraya, həmçinin dərnək məşğələləri, gecələrin, konfransların, “şən və hazırcavablar klubu”nun təşkili, sinifdənkənar qiraət və s. aiddir. Lakin bununla bərabər, yuxarı siniflərdə yeni spesifik formalar da yaranır ki, buna misal olaraq şagird elmi cəmiyyətlərini, məktəb mühazirələrini, biologiya həftəsi və ya aylıqlarını göstərə bilərik. Şagirdlərin fəaliyyəti mürəkkəb xüsusiyyətlər qazanır və yeni nəzəri səviyyəyə keçir. Belə ki, təcrübə, müşahidə, kütləvi sinifdənkənar tədbirlərə tələbat artır. Lakin bu məşğələlər elmin inkişafının müasir səviyyəsinə uyğun olmalı, toplanmış məlumatların təhlilini və ümumiləşdirilməsini özündə daşımalı, şagirdləri elmi tədqiqat metodları ilə tanış etməli, eksperimentlərin nəticələri elmi cəhətdən əsaslandırılmalıdır və s.

Ancaq böyükhəcmli sinifdənkənar işlərin aparılmasında şagirdlərə və biologiya müəlliminə məktəb müdiriyyəti, kitabxana, sinif rəhbəri, valideynlər kömək etməlidirlər.

Fərdi və epizodik qrup halında aparılan sinifdənkənar işlər mövcud məşğələ formaları içərisində xüsusi önəm daşıyır. Belə işlər evdə, canlı guşədə, tədris-təcrübə sahəsində, şagird meşəçilik sahəsində, təbiətdə və ya tədqiqat müəssisələrinin laboratoriyalarında aparıla bilər. Şagirdlərə verilən tapşırıqlar mövzu, mürəkkəblik, yerinə yetirilmə səviyyəsinə görə müxtəlif ola bilər. Bunlara misal olaraq, orqanizmlərin dəyişkənliyi və sistematikası üzrə herbari və kolleksiyaların hazırlanması, heyvan və bitki genetikası üzrə təcrübələr, bitki və heyvan orqanizmlərinə mühitin müxtəlif amillərinin (işıq, rütubət, temperatur, torpaq və s.) təsiri, cücülər üzərində müşahidələr, suda-quruda yaşayanlar və sürünənlərin regenerasiya qabiliyyətlərinin müşahidəsi, sitoloji tədqiqatların aparılması, ətraf mühitin çirklənmə səviyyəsinin analizi və s. göstərmək olar. Ancaq eksperimentlərin qoyuluşu problem xarakter daşımalıdır.

Sinifdənkənar işlərin aparılmasına aşağıdakı interaktiv təlim metodlarını misal göstərmək olar:

Rollu oyunlar (Modelləşmə, səhnələşdirmə); Cütlər və qruplar; Əqli hücum; Konfranslar; Layihələrin hazırlanması; Ümumi diskussiya; Şəkillər; Fotoşəkillər;

Rəsm çəkmə; Qəzetlər, bukletlərin hazırlanması; Problemli təlim; Kollektiv təlim; Şagird tədqiqatları (eksperiment, laboratoriya işlər); Referatların hazırlanması; Disbutların keçirilməsi; Debatlar; Klassik dialoq (Sokrat dialoqu); Esselər müsabiqəsi; Konkret hadisənin araşdırılması (situativ praktikum); Sorğu vərəqləri və müsahibə; "İdeyalar xalısı" və s. metodlardan geniş istifadə oluna bilər.

Təcrübələr göstərir ki, sinifdənkənar məşğələlərdə şagird elmi-tədqiqatlarının aparılması, layihələrin hazırlanması, konfrans və diskussiya, disputların aparılması xüsusi əhəmiyyətə malikdir.

"Layihələrin hazırlanması" metodu bir neçə mərhələdən ibarətdir:

1. Hazırlıq mərhələsi-müəllim tərəfindən layihə mövzuları təqdim edilməli, şagirdlər onları müzakirə edib, birini seçirlər. Yaradıcı qrup yaradılır, tədqiqatın materialları seçilir.

2. Planlaşdırma-elmi mənbələr və onların toplanması yolu ilə müəyyən edilir. Müəllim şagirdlərə ədəbiyyat verir və ya tövsiyə edir.

3. Layihənin işlənməsi-eksperiment, ekspertiza aparılır və nəticələr əldə edilir. Müəllim məsləhət verir və işə nəzarət edir.

4. Nəticələrin hazırlanması-nəticələr çıxarılır, onlar şifahi hesabat, demonstrativ hesabat, yazılı hesabat şəklində təqdim olunur. Müəllim şagirdlərin fəaliyyətini koordinasiya edir, məsləhət verir.

5. Layihənin prezentasiyası-nəticələrin bir və ya qrup şəklində təqdimatı aparılır. Müəllim işin ekspertizasını təşkil edir, müəllimləri, digər şagirdləri prosesə cəlb edir.

6. Qiymətləndirmə. Müəyyən edilmiş meyarlar əsasında tədqiqat qiymətləndirilir. Müəllim şagird ekspert qrupu ilə birlikdə nəticələri qiymətləndirir, istifadə edilməyən imkanları, hesabatın keyfiyyətini qeyd edir.

Şagirdlərin layihə üzərində işləri zamanı müəllim fəaliyyəti aşağıdakılardan ibarət olmalıdır:

- Müəllim şagirdlərə lazımi məlumatın axtarılmasında kömək etməlidir.
- Özü informasiya mənbəyi ola bilər.
- Bütün prosesi koordinasiya etməlidir. Əks əlaqəni təmin etməlidir.

(Şagird ⇄ müəllim)

Layihə metodu fəaliyyət mexanizminə görə informasiya-axtarış layihə metodu, tədqiqat layihə metodu, məhsuldar layihə metodu, oyun (dramatik, rollu) layihə metodu, təcrübi istiqamətləndirici layihə metodu kimi sahələrə bölünür.

İnformasiya-axtarış layihə metodu müəyyən obyekt və ya hadisə barədə məlumat toplamağa yönəlmişdir. Şagirdlər məlumat toplayır, onu təhlil edir, faktları ümumiləşdirir, nəticələrlə auditoriyanı tanış edir. Bu tədqiqatın nəticəsi məruzə, referatlardır.

Məsələn, "Sağlamlığın təbii mənbələri" kimi mövzu üçün

Vitaminlər və onların insan orqanizmində rolu.

Vitaminlərin təsnifatının, tərkibinin, quruluşlarının və onların insan orqanizminə fizioloji təsirinin nəzərdən keçirilməsi.

Müxtəlif qida məhsullarında vitaminlərin kəmiyyət və keyfiyyət tərkibinin müəyyən edilməsi.

İnsanın vitaminlərə olan sutkalıq miqdarının hesablanması kimi tapşırıqlar verilir.

Məhsuldar layihələr-hər hansı məhsul: qəzet, plakat, buklet və s. kollaj, videofilmlər, kompyuter təqdimatlarının və s. hazırlanmasını nəzərdə tutur. Belə məhsuldar layihələrin hazırlanması şagirdlərin yaradıcı təxəyyülünün və təfəkkürlərinin inkişafına şərait yaradır.

Yuxarı siniflərdə şagirdlər məhsuldar layihələr üzərində işləyərkən layihələrin kompyuter təqdimatı hazırlanır. Bu təqdimatlar öz tərkibinə görə adi kitablara çox oxşayır. Kitab səhifələrdən, təqdimat isə

elektron səhifələrdən (slaydlardan) ibarətdir. Lakin kompyuter prezentasiyalarında olan məlumatın təqdimat formaları kitablarda olan formalardan daha rəngarəngdir. Əgər kitabın səhifələrində yalnız mətn və şəkillər yerləşdirilə bilərsə, təqdim olunan slaydlarda müxtəlif multimedia obyektləri (mətn, vektor təsvirlər, səs və animasiya) yerləşdirilə bilər. Bundan əlavə, slaydların təqdimatı və kitab səhifələrinin oxunma ardıcıllığı da nəzərəçarpacaq dərəcədə fərqlənir. Belə ki, kitab səhifələri ardıcıllıqla oxunduğu halda, təqdimat interaktiv ola bilər, yəni istifadəçi kompyuter təqdimatının nümayişi prosesində slaydların təqdimat ardıcıllığını dəyişə bilər.

Məlumatın kitab və prezentasiya köməyi ilə nümayiş imkanları bir-birlərindən fərqlənir. Kitabı, adətən, yaxın məsafədən oxuyur, təqdimatlar ekranda böyük auditoriya üçün konfranslarda çıxışlar zamanı, dərnəklərdə yeni materialların izahı zamanı və s. istifadə olunur.

Məhsuldar layihənin bir növü kimi videolayihələr xüsusilə əhəmiyyətlidir. Bu layihə növü bir neçə mərhələdən ibarətdir:

1. Videolayihələr üçün materialların vəziyyətinin müəyyən edilməsi (kitablar, məqalələr, dərs vəsaitləri və referatlar).

2. Gələcək layihənin modelləşdirilməsi (ssenarinin yazılması).

3. Texnoloji kartların tərtib edilməsi (çəkilişlərin yeri, müəllimlər və sinif şagirdlərinin əməkdaşlığı, lazımi material və avadanlıqlar).

4. Videoçəkiliş.

5. İşin qurulması (videomontaj).

6. Layihənin təqdimatı (referatın müdafiəsi).

7. Yerinə yetirilmiş işin təhlili, qiymətləndirmə.

Əgər iş şagird qrupu tərəfindən aparılmışdırsa, o zaman işin təqdimatında şagirdlərin fəaliyyəti qeyd olunmalıdır (“İdeya mənbəyi”, “təşkilatçı”, “icraçı” və s.). Şagirdlər öz videolayihələrinə təkcə müəllif videoçəkilişlərini deyil, həmçinin tədris televiziya verilişlərini, filmlərdən fraqmentləri və s. əlavə edə bilərlər.

IV oyun (dramatikləşmiş, rollu) layihələr.

Belə layihələrin quruluşu layihə sonuna qədər açıq qalır. Şagirdlər öz üzərinə düşən layihənin məzmunu və xüsusiyyətlərini şərtləndirdiyi, müəyyən etdikləri rolları götürürlər. Bunlar situasiyanın inkişafı prosesində işgüzar və ya sosial münasibətləri əks etdirən rollar, xəyali personajlar və ya bədii personajlar ola bilər. Belə layihələrin nəticələri layihənin başlanğıcında öz əksini tapır, sonra isə konkretləşir.

Biz oyun (dramatikləşmiş, rollu) layihələrinə misal olaraq “İnsan fəaliyyətinin biosferin vəziyyətinə təsiri” mövzusunda rollu oyun layihəsinə bir nümunə göstəririk:

Musiqi səslənir:

Müəllim: Həyat öz yolu ilə inkişaf etmişdir. Nəhayət, təbiətin önündə bir canlı dayanır-Homosapiens. Bu, şüurlu insandır. O, təbiətdən asılı olmaq istəmədi, əksinə, təbiətin bütün sərvətlərini mənimsəmək istədi. O, əsrlik meşələri kəsdi, şəffaf su mənbələrini çirkləndirdi, gur çayları qurutdu.

Müsahibə:

- “Ekoloji böhran” nə deməkdir?
- Onların səbəbləri nədir?
- Onların qarşısını almaq olarmı?

Siz ekoloji böhrandan qurtulmağın hansı yollarını təqdim edə bilərsiniz?

Mövzunun adının, məqsədinin, dərsin əsas suallarının elan edilməsi.

Oyunun gedişi: Sinif “mütəxəssislər” qrupuna bölünür və hər qrup öz tapşırığını alır:

“Mütəxəssislər” qrupu: meteoroloqlar, hidrobioloqlar, aqronomlar, bioloqlar, həkimlər, hüquqşünaslar.

Layihənin əvvəlində şagirdlərə verilir

və onu tamamlayırlar.

İnsan kütləvi miqdarda kömür, neft, qaz yandırmaqla, atom stansiyalarını işlətməklə atmosferin temperaturunu artırır. Nəticədə, havada karbon qazının miqdarı artır. Karbon qazı istixana effekti yaradır. Yəni günəş şüalarını yer səthinə buraxır, istiliyin kosmosa getməsinə imkan verir. Atmosferə azon qatını parçalayan məhsullar düşür, havada zərərli qazların buludları yaranır, kükürd və azot qazı avtomobillərin istilik elektrik stansiyalarının fəaliyyəti nəticəsində atmosferə keçib, su ilə birləşib azot və kükürd turşularına çevrilir və turş yağışlar şəklində yerə düşür.

Hidrobioloqlar:

Hidrosfer -yerin su qatıdır. Su həyatın əsas tərkib hissəsidir. Suyun köməyi ilə maddələr və istilik mübadiləsi baş verir. Dünya okeanı suları əsas iqlim yaradıcı faktordur, çoxsaylı canlılar üçün yaşayış mühitidir.

İnsanın qida məhsullarının əsas təbii mənbəyidir. Suların əsas çirklənmə yolu bunlardır:

1) Fiziki-suda qum və gilin miqdarının artması (torpağın yuyulması nəticəsində).

2) Kimyəvi-suya müxtəlifzərərli, xəstəliktörədici üzvi və qeyri-üzvi maddələrin qarışması.

Bu izahatdan sonra məşğələ yekunlaşdırılır. Şagirdlərin fəaliyyəti qiymətləndirilir.

*Rəyçi: dos. H.Hacıyeva*

**İstifadə edilmiş ədəbiyyat**

1. Hüseynov Ə. Orta məktəbdə biologiyadan sinifdənkənar məşğələlərin təşkili və aparılması. Bakı, 2008.

2. Hüseynov Ə. Biologiyadan dərnək məşğələlərinin təşkili və keçirilməsi. // Kimya və biologiya tədrisi, № 2, 1982.

3. Mikayılov T., Seyidli Y., Quliyev Q., Mahmudov Ş. Ümumi Biologiya. X sinif. Bakı, 2005.

4. Babayev M., Hüseynov Ə. Общая Биология. X класс. Əlfərül, 2005.

5. Mikayılov T., Seyidli Y., Quliyev Q., Mahmudov Ş. Ümumi Biologiya. XI sinif. Bakı, 2005.

6. Babayev M., Hüseynov Ə., Mustafayev Q. Общая Биология. XI sinif. Əlfərül, 2005.

**А.Гусейнов,**
**А.Мирзоева**

**Применение интерактивных методов обучения при проведении внеклассных занятий**

**Резюме**

В статье показана методика применения интерактивных методов преподавания во внеклассных занятиях, методика их организации и проведения, а также приводятся конкретные примеры применения таких методов.

**A.Husseinov,**
**A.Mirzayeva**

**Using interactive methods in out of class activities**

**Summary**

The article is dedicated to the interactive teaching methods in out of class activities on biology lessons. Some concrete examples on the organization and conducting methods are also shown as an example.

# TƏDRİSDƏ ŞƏXSİYYƏTYÖNLÜ TƏLİM TEXNOLOGİYALARINDAN İSTİFADƏ

**Vaqif Süleymanov**
***Bakı şəhəri, 135 nömrəli tam orta məktəbin müəllimi***

***Açar sözlər:*** *şəxsiyyətyönümlü təlim, interaktiv təlim, təlim texnologiyası, müasir dərs.*

***Ключевые слова:*** *личностно-ориентированное обучение, интерактивное обучение, технология обучения, современный урок.*

***Key words:*** *personality oriented education, interactive teaching, teaching technologies, modern lessons.*

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 24 oktyabr 2013-cü il tarixli sərəncamı ilə qəbul olunmuş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda səriştəyə əsaslanan şəxsiyyətyönümlü təhsilin yaradılması ön plana çəkilir.

Şəxsiyyətyönümlü təlim müəllimin və bütövlükdə məktəbin şagirddə şəxsi keyfiyyətlərin maksimal dərəcədə üzə çıxarılması və inkişaf etdirilməsinə yönəlmiş iş sistemidir. Şəxsiyyətyönümlü təlim texnologiyasına görə şagirdlərin hərtərəfli, sərbəst və yaradıcı inkişafı əsas məqsəd kimi qarşıya qoyulur, müəllimin şagirdlərə müəyyən biliklər verməsi ilə bərabər həm də onlara öyrənməyi öyrətmək, əldə etdiyi informasiyalardan praktikada istifadə etmək bacarığı aşılamaq önəmli hesab edilir. Bu təlimdə qəbul edilir ki, müəllim və şagird təlim prosesinin bərabərhüquqlu üzvüdürlər və müəllim fasilitator funksiyası ilə şagirdlərdən fərqlənir. Sinifdə hər bir şagird özünü bərabərhüquqlu şəxsiyyət kimi dərk edir, yoldaşlarını da bir şəxsiyyət olaraq görməyi və hörmət etməyi öyrənir.

Şəxsiyyətyönümlü təlimdə müəllimin rolu çox böyükdür. O, diskussiyanı idarə edir, köməkçi suallar verir, şagirdlərdə tənqidi fikir, öz-özünə nəzarət, özünüqiymətləndirmə və s. keyfiyyətlərin inkişafına diqqət edir.

Strategiyada şəxsiyyətyönümlü təlimin səriştəyə əsaslanması xüsusi vurğulanır. Sənəddə qeyd olunur ki, səriştə, hər şeydən əvvəl, əldə olunmuş bilik və bacarıqları praktiki fəaliyyətdə effektiv və səmərəli tətbiq etmək qabiliyyətidir və o əldə olunmuş bilik və bacarıqların təkrarlanması ilə formalaşır.

Qeyd edək ki, şəxsiyyətyönümlü təlimi həyata keçirmək üçün artıq geniş tətbiqini tapmış fəal-interaktiv təlim üsullarının çox böyük əhəmiyyəti vardır.

Bir dərs nümunəsində bu fikirlərə aydınlıq gətirək.

Sinif: VI

Mövzu: Çevrənin uzunluğu

Standart: 3.1.4. çevrə və dairənin elementlərini (vətər, seqment, sektor, mərkəzi bucaq) bilir, onların xassələrini tətbiq edir.

3.1.2. tərəfinə və ona bitişik bucaqlarına görə üçbucağı və radiusuna görə çevrəni qurur.

İş forması: Qrupla iş.

İş üsulu: Beyin həmləsi, müzakirə.

Resurs: Dərslik, iş vərəqləri, xətkeş, pərgar, ip.

**Dərsin gedişi**
**I mərhələ: Motivasiya.**
**Problemin qoyulması.**

Proyektor vasitəsi ilə lövhəyə sərhədi çevrə olan müxtəlif fiqurlar (stəkan, vedrə, boşqab, vaza və s.) verilir və söylənilir ki, bu fiqurların ön hissəsinin kənarı çevrə əyrisidir. Həmçinin ekrana dairəvi hovuz, böyük neft çənləri və vaqonları verilir. Şagirdlərə məlumat verilir ki, göstərilən qabların və hovuzun kənarı, neft çənləri və neft vaqonlarının en kəsiyinin kənarları çevrə əyrisidir. Bu cür çevrə əyrilərinin uzunluğunun tapılması çox əhəmiyyətlidir.

Tədqiqat sualı: Çevrənin uzunluğunu necə tapmaq olar?

**II mərhələ: Tədqiqatın aparılması.**

Tədqiqatı aparmaq üçün sinif dörd qrupa bölünür və qruplara iş vərəqləri paylanılır.

İş vərəqi 1.

Diametri 4 sm olan çevrə çəkin və onun əyrisinin üzərinə ip yerləşdirdikdən sonra onun uzunluğunu ölçün, alınmış ədədi çevrənin diametrini göstərən ədədə bölüb təqribi cavabı tapın.

İş vərəqi 2.

Diametri 6 sm olan çevrə çəkin və onun əyrisinin üzərinə ip yerləşdirdikdən sonra onun uzunluğunu ölçün, alınmış ədədi çevrənin diametrini göstərən ədədə bölüb təqribi cavabı tapın.

İş vərəqi 3.

Diametri 8 sm olan çevrə çəkin və onun əyrisinin üzərinə ip qoymaqla onun uzunluğunu ölçün, alınmış ədədi çevrənin diametrini göstərən ədədə bölüb təqribi cavabı tapın.

İş vərəqi 4.

Diametri 10 sm olan çevrə çəkin və onun əyrisinin üzərinə ip qoymaqla onun uzunluğunu ölçün, alınmış ədədi çevrənin diametrini göstərən ədədə bölüb təqribi cavabı tapın.

**III mərhələ: İnformasiyanın mübadiləsi.**

Qruplar onlara verilən tapşırığı yerinə yetirdikdən sonra fikirlərini mübadilə etmək məqsədi ilə təqdimat edirlər və qrupların işi lövhədən asılır. Təqdimatdan aydın olur ki, çevrə uzunluğunun diametrə nisbətinin nəticələri bütün qruplarda 3-ə yaxın ədəd olmuşdur. Yəni çevrə uzunluğunun ədədi qiymətinin çevrənin diametrinin uzunluğunun ədədi qiymətinə nisbəti qruplarda uyğun olaraq təxminən 3.13; 3.14; 3.14; 3.15 kimi olmuşdur.

**IV mərhələ: İnformasiyanın müzakirəsi.**

Qrupların təqdimatları dinlənildikdən sonra informasiyanın müzakirəsi başlayır. Məlum olur ki, dəqiqliyə daha yaxın ədəd 3.14-dür. Müəllim əlavə edir ki, riyaziyyatda bu ədədi yunan hərfi $\pi$ (oxunuşu pi) ilə işarə etmək qəbul olunmuşdur. Çevrənin uzunluğu C hərfi ilə işarə olunur. Əgər çevrənin diametrini d hərfi ilə işarə etsək, nəticəni necə yazmaq olar sualına qruplar $C:d=\pi$, buradan $C=\pi d$ yazmaqla cavab verirlər. Qruplar bu düsturu sözlə necə ifadə etmək olar sualını da cavablandırırlar. Həmçinin qruplar çevrənin uzunluğu düsturunu radiusla necə ifadə etmək olar sualına da düzgün cavab verirlər: $d=2r$ olduğundan $C=2\pi r$ olar.

**V mərhələ: Nəticə və ümumiləşdirmə.**

Şagirdlərin diqqətini tədqiqat sualına yönəldərək çevrənin uzunluğunu hesablamaq üçün iki düsturun çıxarıldığı söylənilir və şagirdlərin diqqətinə çatdırılır ki, məsələlərin həllindən və şərtindən asılı olaraq bu düsturlardan biri seçilir.

**VI mərhələ: Yaradıcı tətbiqetmə və ev tapşırığı.**

Əvvəlcə şagirdlərə tapşırıq verilir ki, öz dəftərində radiusun və diametrin qeyd olunmuş hər hansı qiymətinə görə çevrənin uzunluğunu tapsınlar. Sonra şagirdlərin səriştəliliyini yoxlamaq məqsədi ilə onlar məktəbin qarşısındakı meydançaya dəvət olunurlar. Qruplara təklif olunur ki, meydançadakı kiçik daş kərpiclərdən düzənlənmiş

dairəvi fiqurun çevrəsinin uzunluğunu tapsınlar. Qruplar çox maraqla göstərilən fiqurun diametrini ölçür və əyri xəttin uzunluğunu tapırlar.

Ev tapşırığı: hər bir şagirdə: 1) evdə olan dairəvi stəkanın çevrəsinin uzunluğunu ip vasitəsi ilə ölçmək və nəticəni diametri ölçməklə düstur vasitəsi ilə alınan nəticə ilə müqayisə etmək; 2) çevrənin və dairənin uzunluğu verildikdə onun radiusunu tapmağa dair məsələ tərtib edərək həll etmək; 3) dərslikdən çalışma №6-nı həll etmək tapşırılır.

**VII mərhələ: Qiymətləndirmə və refleksiya.**

Meyar cədvəlinə əsasən dərsin bütün mərhələləri qrup və fərdi şəkildə qiymətləndirilir və refleksiya aparıldıqdan sonra dərs yekunlaşdırılır.

Şəxsiyyətyönümlü təlim texnologiyaları əsasında apardığım bir dərs nümunəsi ilə ənənəvi təlim əsasında tədris etdiyim dərs nümunəsinin müqayisəsi əhəmiyyətli nəticələr çıxarmağa imkan verir. Müasir dövrdə apardığım dərsdə mən “fasilitator” olaraq ehtiyac olduqda danışıram və əsasən, şagirdlərin fəallığına çalışır, onların suallarına özlərinin cavablandırmasına, qarşılıqlı dialoqların qurulmasına üstünlük verirəm. Şagirdlərin tədqiqat aparması müasir dərsin ən böyük üstünlüklərindən biri olaraq, onların axtarıcılıq və tədqiqatçılıq bacarıqlarını inkişaf etdirir, təfəkkür fəaliyyətini və müstəqilliyini artırır, eyni zamanda fərqli fikirlərin müzakirəsi şagirdlərdə müzakirə etmək və düzgün nəticə çıxarmaq qabiliyyətini formalaşdırır. Dərslər “səni öyrədirəm” prinsipi ilə yox, “biz birlikdə öyrənirik” prinsipi ilə müəllim və şagirdlər arasında tərəfdaş münasibətləri qurmaqla aparılır.

Çoxillik iş təcrübəmə əsaslanaraq deyə bilərəm ki, riyaziyyat dərslərində şəxsiyyətyönümlü təlim texnologiyalarından istifadə edilməsi şagirdlərin idrak, yaradıcılıq, tədqiqatçılıq qabiliyyətlərini və fənnə marağını artırır. Nəticədə təlim-tərbiyə prosesi intensivləşir, şagirdlərin fəallığı yüksəlir, onların psixoloji gərginliyi azalır və təlim-tərbiyə prosesində uğurlu nəticələr qazanılır.

*Rəyçi: pedaqogika üzrə fəlsəfə doktoru E.Məmmədova*

**İstifadə edilmiş ədəbiyyat**

1. Ümumtəhsil pilləsinin dövlət standartları (kurikulumları). Azərbaycan məktəbi, № 6, 2011.
2. Ümumi təhsilin fənn standartları (I-XI siniflər). Bakı: Mütərcim, 2012.
3. Veysova Z. Fəal (interaktiv) təlim. Bakı, 2008.

**В.Сулейманов**

**Использование личностно-ориентированных технологий в образовании на уроках математики**

**Резюме**

В этой статье говорится об использовании личностно-ориентированных технологий при обучении математики и дается один примерный урок.

**V.Suleymanov**

**Using personality oriented technologies in teaching**

**Summary**

In the article it is spoken about personality oriented learning on mathematics and a lesson sample is shown as an example.

# ŞAGİRDLƏRİN İDRAK FƏALLIĞININ VƏ MƏNTİQİ TƏFƏKKÜRÜNÜN İNKİŞAF ETDİRİLMƏSİ

**Əminə Niftiyeva**
***Azərbaycan Respublikası Təhsil Problemləri İnstitutunun böyük elmi işçisi***

***Açar sözlər:*** *şagird, müəllim, fəal təlim, idrak fəallığı, məntiqi təfəkkür, pedaqoji texnologiyalar.*

***Ключевые слова:*** *ученик, учитель, активное обучение, познавательная активность, логическое мышление, педагогические технологии.*

***Key words:*** *student, teacher, interactive training, cognitive activity, logical thinking, pedagogical technologies.*

Ümumtəhsil məktəblərində tədris olunan hər bir fənnin özünəməxsus xüsusiyyətləri vardır və ayrı-ayrı fənlərin tədrisi prosesində bu xüsusiyyətlərin nəzərə alınması isə zəruridir. Bütün digər fənlər kimi tarix fənninin tədrisində də müasir dərsin imkanları çox genişdir. Məktəblərdə bu fənnin tədrisi şagirdlərdə məntiqi təfəkkürün inkişafına, onlarda hadisə və təzahürlər arasında səbəb-nəticə əlaqələrini təhlil etmək bacarıqlarının yaradılmasına geniş imkanlar açır. Müasir tarix dərsinin əsas vəzifəsi təfəkkür prosesini sürətləndirmək və şagirdlərin idrak fəallığını artırmaq, müəllimlərin əsas vəzifəsi isə dərsdə şagirdlərə düzgün istiqamət verərək tarixi biliklərə yiyələnmələrini təmin etməkdən ibarətdir. Burada əsas məsələ şagirdlərin yaddaşını sadəcə nəzəri məlumatlarla doldurmaq deyil, eyni zamanda praktik çalışmaların istifadəsini artırmaqla onların təfəkkür və yaradıcılıq qabiliyyətinin inkişaf etdirilməsindən ibarət olmalıdır. Müəllim tədris prosesində ilk öncə motivasiyanı təmin etməli, şagirdlərdə dərsə maraq yaratmalı, onların fəallığını təmin etməli, müəyyən olunmuş standartlar həcmində bacarıq və dəyərlər verməklə yanaşı, onlarda təşəbbüskarlıq və axtarıcılıq vərdişlərinin formalaşdırılmasına nail olmalıdır. Tarix dərslərində fəal təlimin müxtəlif üsullarından istifadə etməklə şagirdləri məntiqi düşünməyə yönəltmək, axtarışlar aparmağa hə-vəsləndirmək, onların idrak fəallığını gücləndirmək mümkündür. Dərsdə hər bir şagirdin fərdi xüsusiyyətləri və maraqları, eləcə də cəmiyyətin sifarişi nəzərə alınmalıdır. Dərsin maraqlılığını təmin etmək üçün bütün tədris və təlim işi şagirdlərin maraq və tələbatlarının ödənilməsinə, onların istedad və qabiliyyətlərinin, potensial imkanlarının inkişafına yönəldilməlidir. Bu da təlim tapşırıqlarının verilməsində, resursların, eləcə də təlimin forma və üsullarının seçilməsində nəzərə alınmalıdır. Resursların rəngarəngliyi və təlimin məzmununa uyğun seçilməsi dərsin maraqlı keçməsinə, qarşıya qoyulan məqsədə nail olmağa imkan yaradır.

"Strategiya"da nəzərdə tutulmuş strateji istiqamətlərdə qeyd edildiyi kimi tədris prosesində innovativ təlim metodlarını tətbiq edən, təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edə bilən səriştəli təhsilverənin formalaşdırılması, onların peşəkarlığının yüksəldilməsi, təhsilalanların istedadının aşkar olunması və inkişafı təmin edilməlidir.

Dərsdə, həmçinin texniki təminatın (kompyuter, proyektor və s.) olması da onun

maraqlılığını və səmərəliliyini yüksəldir. Təcrübə göstərir ki, tarix dərslərində multimedia texnologiyalarının tətbiqi qarşıya qoyulan məqsədə çatmaq üçün istifadə olunan təlim üsullarının təsir gücünü daha da artırmağa imkan verir və şagirdlər tərəfindən materialın daha dərindən mənimsənilməsinə şərait yaradır. Dərsin multimedia texnologiyalarından istifadə etməklə keçirilməsi şagirdlərin idrak fəallığını artırır. İdrak fəallığı, ilk növbədə, təfəkkürün fəallaşdırılması əsasında yaranır. Buna nail olmaq üçün, birinci növbədə, təlim prosesində idrak fəallığını stimullaşdıran problemli situasiyalar yaradılmalıdır.

Respublikanın ümumtəhsil məktəblərində tədqiqatlar aparılmış, Azərbaycan tarixi fənn kurikulumunun tətbiqi nəticələri təhlil edilmiş və keyfiyyət göstəriciləri qiymətləndirilmişdir. Belə ki, Bakı şəhərinin 6, Masallı rayonunun 7 məktəbində Azərbaycan tarixi fənn kurikulumunun tətbiqi nəticələri öyrənilmişdir.

TPİ-nin tədqiqatına əsasən Azərbaycan tarixi üzrə məktəbdaxili qiymətləndirmənin apardığı nəticələri respublikanın 11 şəhər məktəbində 53%, 18 rayon mərkəzində yerləşən məktəbində 54%, 15 kənd məktəbində 48% təşkil etmişdir.

Tarixi biliklərin düzgün istiqamətdə qazanılması şagirdin dünyagörüşünə, məntiqinə, zəkasına, çevikliyinə və ələlxüsus da həyati bacarıqlara sahib olmasına zəmin yaradır. Belə olan halda şagirdlərin inkişafını təmin etmək məqsədi ilə fənnin tədrisi zamanı dərs məzmun tələblərinə uyğun qurulmalıdır. Bununla yanaşı, beyniyüklü şagirdin zehni fəaliyyətini gücləndirməklə, onu düşündürməklə tarix dərsini səmərəli təşkil etmək olar. Müasir didaktikada, şübhəsiz elə bir vahid metod yoxdur ki, onu həmişə və hər yerdə tətbiq etmək mümkün olsun. Buna görə də müxtəlif dərs formaları və üsullarının seçilməsi müəllimin təcrübəsi və arzusundan asılı olaraq məhz onun ixtiyarına buraxılır. Bunun üçün müəllim yeni texnologiyalar hazırlamalı, yaxud mövcud olanların içərisindən ən münasiblərini seçməlidir. Bu texnologiyaların müəyyən olunmasında müəllim və şagird şəxsiyyəti təlimin aparıcı subyekti kimi çıxış edir. Bu zaman şagirdlər öz təfəkkürünün, düşüncəsinin, müəllimlər isə şagirdin inkişafı üçün şəraitin təşkilatçısı kimi çıxış edir. Belə halda müəllimlərin rəhbərlik funksiyası dəyişir. O, daha çox sinif şəraitində təlim fəaliyyətini əlaqələndirən, istiqamətləndirən məsləhətçi kimi şagirdlərin müstəqil idrak fəaliyyətini, fəal yaradıcılığını təşkil edən subyektə çevrilir. Təlimin səmərəli təşkilinə yalnız o zaman nail olmaq mümkündür ki, müəllim şagirdlərə yaxın olsun. Onunla şagird arasında qarşılıqlı anlaşma olsun, dərs dediyi şagirdlərin fərdi və psixoloji xüsusiyyətlərini öyrənsin, təlim prosesində onları nəzərə alsın.

Dərsin əsas məqsədi tapşırıqların uşaqlar tərəfindən yerinə yetirilməsində bütün şagirdlərin iştirak etməsini təmin etməkdir. Təlim prosesində şagirdlərin fərdi yaradıcılıq qabiliyyətlərinin inkişafına geniş yer verilməlidir. Şagirdlərin dərketmə imkanları bir tərəfdən məktəblinin yaş dövründən asılıdırsa, digər tərəfdən şagirdlərdə tarixi biliklərin, tarixi təfəkkürün, öyrənmə üsullarının və tarixi biliklərlə əməliyyat aparmaq bacarığının inkişaf səviyyəsi ilə müəyyən olunur. Şagirdlərin dərketmə imkanları nə qədər yüksəkdirsə, təlim bir o qədər səmərəli olur. Təlimin təşkili formaları, müəllimin öyrətmə, şagirdlərin isə öyrənmə üsul və vasitələri təlimin məqsədinə, məzmununa və şagirdlərin dərketmə imkanlarına uyğun olaraq seçilir. Bu uyğunluq nə qədər çox olarsa, təlimin nəticəsi də bir o qədər uğurlu olar. Təlimin nəticəsi dərsin reallaşdırılmış məqsədləri kimi başa düşülür. O, dərsin sonunda şagirdlərin bilik, bacarıq və

vərdişlərə yiyələnmək sahəsində müəllimin nailiyyətlərini göstərir.

"Strategiyada" qeyd edildiyi kimi, təhsilin inkişafında mühüm irəliləyişlərə nail olmuş ölkələrin təcrübəsi göstərir ki, yaradıcı düşüncəni inkişaf etdirən və təhsilalanın fərdi xüsusiyyətlərini nəzərə alan müasir, fəal interaktiv təlim metodları daha yüksək nəticələr verir.

İdraki fəaliyyətin stimulyatoru olan tədqiqat metodundan istifadə biliklərin yaradıcı mənimsənilməsini nəzərdə tutur. Bu prosesdə müəllimin pedaqoji ustalığı ondan ibarətdir ki, şagirdlərin müstəqil mühakimə aparıb öz mülahizələrini söyləmələrinə imkan yaratsın. Onların fikrini lazımi istiqamətə yönəldə bilsin. Belə ki, düzgün olmayan cavabı rədd etməklə yox, şagirdləri düşünməyə vadar edən situasiya yaratmaqla və səhv cavabı inandırıcı-əsaslandırıcı surətdə təkzib etməklə şagirdi doğru nəticə çıxarmağa sövq edə bilsin.

Tarix fənninin tədrisində şagirdlərə cəmiyyətin inkişafı, xalqların tarixi haqqında bol-bol informasiya verməkdən daha çox onlarda həmin informasiyalardan baş açmaq, zehni fəaliyyətlərini məntiqi əsaslarla izah etmək, cəmiyyətdə öz yerini tutmaq bacarığı formalaşdırılmalıdır. Tədris prosesində şagirdlər cəmiyyətin həyatında və ölkənin idarə olunmasında fəal iştirak etməyə hazırlanmalıdırlar. Hər bir dərsdə şagirdlər bu fənnə aid olan biliklər sisteminin müəyyən elementlərini qavrayır, başa düşür, yadda saxlayır və ya tətbiq edirlər, nəzərə almaq lazımdır ki, bu fənnin təliminin əsasında faktlar durur. Tarixi faktları öyrətmədən şagirdlərin təsəvvüründə keçmişin canlı mənzərəsini yaratmaq, keçmişin və ya müasir dövrün ictimai həyat hadisələrinin elmi izahını vermək mümkün deyil. Tarixin elmi izahını verə bilmək üçün isə şagirdlər faktları, onların əlaqə və münasibətlərini təhlil etməli, ümumiləşdirməli, tarixi anlayışlar sistemi, ictimai inkişafın qanunları və dünyagörüşü ideyaları haqqında biliklərə malik olmalıdırlar.

Tədris prosesində şagirdlərdə öyrədilən hadisə və təzahürlərə müəyyən münasibətlər formalaşır, mənimsənilmiş biliklər vasitəsilə gerçək aləmi qiymətləndirmək bacarığı yaranır, elmi dünyagörüşünün əsasında duran yanaşmalar, fərdi baxışlar sistemi əmələ gəlir. Şagird tədris tapşırığını əməli şəkildə və ya fikrən yerinə yetirərkən istər-istəməz psixoloji  fəaliyyətdə olur.

Şagird öyrənmə prosesində təkcə bilik və bacarıq əldə etmir, o, həm də psixi səy göstərir, düşünür, onda öyrənmək, başa düşmək, dərk etmək bacarıqları formalaşır. Başqa sözlə, təlim zamanı şagirdlər bilik əldə etməklə yanaşı, bu biliklər üzərində düşünür, axtarır, tapır. Deməli, öyrənmənin, bilik əldə etmənin əsasında bir sıra idrak prosesi durur.

Şagirdlərin qabiliyyətlərini səciyyələndirən cəhətlərdən biri də onların müstəqilliyidir. Təcrübəli müəllim şagirdlərin təlimə həvəsini inkişaf etdirir, onlarda müşahidəçilik qabiliyyətinin formalaşmasına şərait yaradır.

Azərbaycan tarixinin tədrisi zamanı əsas anlayışların, məqamların şagirdlər tərəfindən öyrənilməsinə, mənimsənilməsinə nail olmaq lazımdır. Azərbaycan ərazisində mövcud olan dövlətlərin yaranmasında və inkişafında əhəmiyyətli rol oynayan hökmdarların, elm və mədəniyyət xadimlərimizin, işğal olunmuş ərazilərimizin, milli qəhrəmanlarımızın, dövlət atributlarımızın adlarının hər bir sinifdə, hər bir dərsdə şagirdlər tərəfindən öyrənilməsi zəruridir. Tədris zamanı bu cür ardıcıllığın gözlənilməsi şagirdlərin yaddaşını möhkəmləndirir, tariximizin əsas məqamlarının unudulmamasını təmin edir. Məsələn, VIII sinifdə "Azərbaycanda Səfəvilər dövlətinin yaranması" mövzusunun tədrisi zamanı bu dövlətin yaranmasına qədər Azərbaycan ərazisində mövcud olmuş

dövlətləri yada salmaq üçün şagirdlərin qruplara bölünərək sorğu vərəqləri ilə işləmələrini təşkil etmək lazımdır. Məsələn, I qrup dövlətlərin mövcud olduğu tarixləri, II qrup dövlətlərin ərazilərini, III qrup paytaxt şəhərləri, IV qrup hökmdarlar haqqında məlumat yazmalıdır. Fənnin tədrisi zamanı çox vaxt cütlərlə iş formasına üstünlük vermək məqsədəuyğun sayılır. Belə iş formasında "öyrənməyi öyrətmək" prinsipini rəhbər tutaraq şagirdlərə dərslikdən istifadə etməyə, düşünməyə imkan vermək lazımdır. Əsas məqsəd şagirdlərin mövzusunun əsas hissəsini dərslikdən və əlavə materiallardan hansı şəkildə tapmasını, öyrənməsini müşahidə etməkdir. Əslində cütlərlə iş zamanı verilən suallar da, alınan cavablar da konkret olmalıdır.

Hər bir dərs yeni, maraqlı cəhəti ilə fərqlənməlidir. Şagirdlər aldıqları məlumatları özləri araşdırmalı, onlara əlavələr etməlidirlər. Hər hansı bir məsələ, fakt və hadisə haqqında bir-biri ilə mübahisə etməli, öz fikir və mülahizələrini bildirməli, öz fikirlərini əsaslandırmalı, yoldaşlarının da fikirlərini dinləməli və ona hörmətlə yanaşmalıdır.

*Rəyçilər: dos.E. Bəylərov*
*dos. İ. Cavadov*

**İstifadə edilmiş ədəbiyyat**


1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. Azərbaycan məktəbi, 2013, № 5.
2. Tarixin tədrisində müasir üsullar (şərhlər, tövsiyələr, nümunələr). Bakı, 2000.
3. Mehrabov A., Abbasov Ə., Zeynalov Z., Həsənov R. Pedaqoji texnologiyalar. Bakı, 2006.
4. Veysova Z. Fəal (interaktiv) təlim. Müəllimlər üçün vəsait. UNİSEF, 2007.
5. Kərimov F. və b. İnteqrativ kurikulum: mahiyyət və nümunələr. Bakı, 2005.


**А.Нифтиева**

**Развитие логического мышления и познавательной деятельности в процессе обучения**

**Резюме**


В этой статье говорится о том, что преподавание Истории в общеобразовательных школах имеет свои особенности. Улучшение процесса преподавания предмета История помогает развитию логики учеников и открывает для них новые возможности.

Особо подчеркнуто то, что во время обучения открываются возможности для творчества учеников.


**A.Niftiyeva**

**Developing students logical thinking and cognitive activity**

**Summary**


In the article it is spoken about the history subject taught in secondary schools which has its own features. The author emphasises developing students' logical thinking, cognitive activity, and creativity through teaching history.

***Tərbiyə məsələləri***

# ƏXLAQİ-DİDAKTİK ƏSƏRLƏRİMİZ MƏNƏVİ SƏRVƏTİMİZDİR

**Yaqub Babayev**
***filologiya elmləri doktoru***

***Açar sözlər:*** *klassik irs, əxlaqi-didaktik fikirlər, təlim prosesi, mənəvi dəyərlər.*
***Ключевые слова:*** *классическое наследие, морально-дидактические мысли, учебный процесс, духовные ценности.*
***Key words:*** *classical heritage, moral didactic thoughts, training process, moral values.*

Azərbaycanda gənc nəslin tərbiyəsində ən önəmli yerlərdən biri klassiklərimizin bizə irs qoyub getdiyi əxlaqi-didaktik əsərlərin öyrənilməsi və onların gələcək nəsillərə ötürülməsidir. Nizaminin, Füzulinin, Vaqifin, Zakirin, S.Ə.Şirvaninin, Sabirin, S.Vurğunun, R.Rzanın əsərlərindəki tərbiyəvi fikirlər müəllimlərimizin köməyinə gələn ən nadir sənət nümunələridir. Belə əsərlərdən biri də orta əsr ədəbiyyatımızın incilərindən olan Marağayi Əvhədinin "Cami-cəm" adlı əxlaqi-didaktik poemasıdır.

XIII-XIV əsrlər fars dilli Azərbaycan ədəbiyyatının görkəmli nümayəndələrindən biri olan Əvhədəddin Əvhədi Marağayi qələmini həm lirik, həm də epik ədəbi növdə sınamışdır. Onun lirik şeirlər divanı və iki poeması "Dəhnamə" ("Məntiqül-üşşaq"), "Cami-cəm" ("Cəmşidin camı") gəlib bizə çatmışdır.

Mənbələr şairin divanının 15 min beyt həcmində olduğunu bildirir. Divana daxil olan lirik şeirlər janrca müxtəlifdir: qəsidə, qəzəl, tərkibbənd, tərcibənd, rübai və s.

Əvhədi epik poeziyamıza da layiqli töhfələr vermişdir. Dediyimiz kimi onun iki poeması vardır: "Dəhnamə" və "Cami-cəm". Hər iki poema məsnəvi formasındadır və əxlaqi-didaktik mahiyyət daşıyır.

Şair ilk epik əsəri olan "Dəhnamə"nin sonunda onun adını "Kəlamların yaxşısı olduğuna görə" "Məntiqül-üşşaq" ("Aşiqlərin söhbəti") qoyduğunu söyləyir. Məsnəvinin sonunda sənətkar onun yazıldığı tarixi də əbcəd hesabilə qeyd edir. Bu hicri tarixlə 706-cı ilə, miladi ilə 1306-cı ilə bərabərdir. Əsər məşhur alim Nəsirəddin Tusinin nəvəsi Xacə Ziyaəddin Yusif ibn Xacə Əsiləddinin xahişi ilə yazılmış və ona həsr edilmişdir. Əlbəttə, bu qaydalar o dövrün bütün böyük ədəbi əsərlərinə xas olan cəhətlərdən biri sayılır.

Məsnəvi kompozisiya baxımından bu əsər XIII-XVI əsrlərdə qələmə alınmış bəzi məhəbbət poemalarını xatırladır. Rəsmi-ənənəvi girişlə, yəni minacat, nət və əsərin ithaf olunduğu şəxsin tərifi ilə başlayır. Sonra əhvalat verilir. Poema on məktub üzərində qurulmuş əhvalatdan ibarət olsa da bitkin əsərdir. Süjetin daxilində qəhrəmanların, əsasən, aşiqin əhvali-ruhiyyəsini, daxili hislərini ifadə edən qəzəllər də özünə yer tapır. Əsər kiçik xitabə ilə yekunlaşır. Burada müəllif öz fikirlərinə yekun vurur, əsərin yazıldığı tari-

xi və onun adını nəzərə çatdırır.

Əvhədinin bu poeması şərq ədəbiyyatında nisbətən gəzəri xarakter daşıyan bir süjet üzərində qurulmuşdur. Süjet bir şaxəli, bir planlıdır. Obrazların sayı da çox deyil. Mövzu məhəbbətlə bağlıdır. Məzmun konkret olaraq bir hadisə ətrafında cəmlənir. Məhəbbətdən xəbərsiz bir gənc oğlan gözəl bir qıza vurulur. Bütün səbri və ixtiyarı əldən gedir. İztiraba düçar olur. Yalnız sevdiyi cananın xəyalı və dərdi ilə yaşayır. Nəhayət, səbri tükənir və qıza məktub göndərir. Burada qasid rolunu novruz bayramında əsən bahar nəsimi oynayır. Məşuqə məktubu alıb məsələdən hali olur. O, daxilən bu işə etiraz etməsə də, zahirən özünü narazı və qəzəbli kimi göstərir. Etiraz dolu, acıqlı cavab verir. Ancaq aşiq eşq əzabı içərisində zillətə düçar olsa və məşuqun qəzəbli cavabını eşitsə də, inadkarlıq göstərir. Öz yolundan dönmür. Qıza bir-birinin ardınca sevgi dolu məktublar göndərir. Poemadakı məktubların sayı ondur. Nəhayət, öz sevgilisinin fədakarlığını və dönməzliyini görən gözəl ona razılığını bildirir, onun sevgisini qəbul edib onunla ailə həyatı qurmağa razılaşır.

Poemada hər iki obraz müsbət səciyyə daşıyır. Aşiq həqiqi eşq yolçusu, öz məhəbbətində sabitqədəm və iradəlidir. O, eşqindəki səbat və dəyanətini sübut edir və buna görə də arzusuna çatır.

Məşuq isə ağıllı, düşüncəli və tədbirli bir gözəldir. O, oğlana tələsik, düşünüb-daşınmadan razılıq vermir. Daxilən əvvəldən bu sevgidən razı qalsa da, oğlanı yoxlamaq, onun xarakterini öyrənmək, kimliyini bilmək, eşqindəki qərarını imtahan etmək qərarına gəlir. Onu tam sınaqdan çıxardıqdan və məhəbbət yolundakı əzmkarlığına inandıqdan sonra razılığını bildirir.

Əsərin başlıca ideyası eşq uğrunda fədakarlıq, səbirli və tədbirli hərəkət etmək, tədbir və iradə ilə məqsədə çatmaqdır.

Poema uzun müddət, xüsusilə orta əsr qaynaqlarında diqqətdən kənarda qalmış, bir növ unudulmuşdur. Qazi Nurullah "Məcalisül-möminin" əsərində bunun səbəbini "Dəhnamə"nin Xacə Nəsirəddin Tusinin nəvəsinə həsr edilməsi ilə əlaqələndirir. Q.Nurullaha görə, N.Tusi Hülakü xanı Bağdada hücuma və sonuncu xəlifə Mötəsimbillahı qətlə təhrik etdiyi üçün nüfuzdan düşmüşdü. Əlbəttə, bu fikir inandırıcı görünmür və şəxsi mülahizə səciyyəsi daşıyır.

M.Əvhədidən sonra İbn İmad Təqih Kirmani (? - 1373) və Ş.İ.Xətai də "Dəhnamə" mövzusunda əsər yazmışlar. Xətainin əsərinin əvvəlki poemalardan bəzi fərqli cəhətləri ilə yanaşı, ən çox diqqəti cəlb edən və bizim üçün əhəmiyyətli cəhəti odur ki, o, öz ədəbi abidəsini Azərbaycan dilində – ana dilində ərsəyə gətirmişdi.

Həm Azərbaycan epik şeiri tarixində, həm də Əvhədinin yaradıcılığında "Cami-cəm" poemasının xüsusi mövqeyi vardır. Şairi daha çox məşhurlaşdıran həmin məsnəvidir. Əvhədidən danışan müəlliflər bir qayda olaraq, ilk növbədə, diqqəti bu əsərə yönəltmişlər. D.Səmərqəndi "Cami-cəm"i nəzərdə tutaraq öz təzkirəsində yazır ki: "Elə ki əsər hazır oldu, o qədər bəyənildi ki, bir ayda 400 nüsxədən ibarət üzü köçürüldü".

"Cami-cəm" əxlaqi-didaktik poemadır. Klassik şərq ədəbiyyatında moralist poeziyanın ən qiymətli nümunələrindən sayıla bilər. Müəllif əsəri yazarkən görkəmli təriqət şairi Sənai Qəznəvinin "Hədiqət-ül həqayiq", N.Gəncəvinin "Sirlər xəzinəsi", Sədinin "Bustan" və "Gülüstan" əsərlərindən faydalanmışdır. Klassik Şərq ədəbiyyatının qabaqcıl ənənələrinə sadiq qalan bu istedadlı şair xəlqiliyi və humanizmi ilə Nizami irsinə daha yaxındır. Ancaq poemada bu və buna bənzər əsərlərin təsiri nə qədər hiss olunsa da, o, tam orijinal səciyyə daşıyır, yüksək ideya-məzmun və sənətkarlıq xüsusiyyətləri ilə diqqəti cəlb edir.

"Cami-cəm" həcmcə 9142 misradan

ibarətdir. Əruz vəzninin xəfif bəhrindədir. Hicri tarixlə 732, miladi ilə 1333-cü ildə qələmə alınmışdır. Əsərin sonuna yaxın müəllif hicri ilə əsərin yazıldığı tarixi qeyd edir:

*Mən buna tarixdən fal açanda bil,*
*Yeddi yüz otuzdu, bir də iki il.*

“Cami-cəm” süjetsiz poemadır və lirik səciyyə daşıyır. Burada əhvalat yox (əsərin içərisindəki beş-altı kiçik hekayət istisna olunmaqla), şairin kainat, həyat, insan, zaman və bunlarla əlaqəli məsələlər barədə fəlsəfi, ictimai və dini düşüncələri, fəlsəfi-poetik şərhləri öz əksini tapır. Poema həm də fəlsəfi poeziyamızın sanballı örnəklərindən sayıla bilər.

Əsər giriş, üç fəsil və sonluqdan ibarətdir. Bu mənada məsnəvi özünəməxsus kompozisiyaya malikdir.

Giriş xeyli genişdir və bir neçə yarım sərlövhəyə ayrılır. Bunların hər birində müxtəlif məsələlərdən danışılır. Əvvəlcə ənənəvi qaydada tövhid, minacat və nət verilir. Sultan Əbu Səid Bahadır mədh edilir. Sonra vəzir Xacə Qiyasəddin Məhəmməd ibn Rəşid vəsf edilir. Onu da deyək ki, poema elə məhz bu görkəmli və maarifpərvər vəzirə ithaf edilmişdir. Müəllif onu ağıllı, elmin və sənətin qədrini bilən, insanpərvər, ədalətli bir şəxsiyyət kimi tərifləyir, əsəri ona ithaf etdiyini xüsusi olaraq nəzərə çatdırır. Əvhədi girişdə öz vəziyyəti, xarakteri, güzəranının ağırlığı, möhtac içində yaşaması, ehtiyac ucundan vətəni tərk etməli olduğu, bəzi insaflı adamların ona qayğısı barədə də məlumat verir. “Kainatın həqiqəti haqqında sual” başlığı altında çoxlu sayda fəlsəfi suallar qoyulur. Suallar silsilə şəklindədir. Əvvəlcə yaradılış, onun sirri, dünya, fələklər və bunlarla bağlı proses və hadisələr barədə suallar yer alır:

*Bu yer ki üstündə salmısan məskən*
*Nədir, heç özünə demisənmi sən?!*
*Əsli haradandır, nədir bu qayda?*
*Var idi, ya yoxdan o, oldu peyda?*
*Heçlikdən vücuda ilkin nə gəldi?*
*Kim bu xəzinənin açarı oldu?*
*Nədən hərəkətdən qalmayır fələk?*
*Yer niyə hərəkət etmir de görək?*

Bu tipli sorğular uzanır və nəhayət, insanın üzərinə gəlib çıxır:

*Bəs sən özün kimsən, nəçisən, nəsən?*
*Kimi tanıyırsan onu bilməsən?*
*Bu ruhla bu ağıl, de nədir görək?*
*Nəfsin adı nədir? Bəs nədir ürək?*
*Bu qərib şəhərə sən niyə gəldin?*
*Burda işin nədir, ya nəyə gəldin?*

Sonra suallar axirət həyatına doğru yönəlir.

Əlbəttə, belə suallar mövcudat nizamında ilkin yaradılış məqamını və səbəbini anlamaq istəyindən başlayıb, insana onun xəlq olunma səbəbinə, insana xas çeşidli xislət və keyfiyyətlərin şərəfli bir varlıq kimi ona təlqin olunma sirrinə, nəhayət, axirət həyatına qədər uzanır. “Cami-cəm”də müəllif axtardığı və bəşər övladından ötrü maraqlı olan bu çoxsaylı sorğulara orta əsrlərin elmi-fəlsəfi, dini-təriqət baxışları, öz biliyi və dünyagörüşü səviyyəsində cavab verməyə çalışır. Poemanın ümumi məzmunu və ideyası əslində burada qoyulan suallara verilən poetik-fəlsəfi şərh və bəyanlardan ibarətdir.

Əsərin adının “Cami-cəm” qoyulması da belə bir əhatəli problemlərlə əlaqəlidir. Belə ki, rəvayətə görə əfsanəvi İran hökmdarı Cəmşidin elə bir camı var idi ki, dünyadakı hər şeyi onda görmək mümkün idi. M.Əvhədi də əsərinə belə bir ad qoymaqla demək istəyir ki:

*Adını “Cəmşidin camı” qoydum mən,*
*Varlığın əksini onda görərsən.*
*Hər kəs istəyirsə dünyanı görmək,*
*Könlü istəyəni burda görəcək.*

Şair girişdə vaxtilə Təbrizdə elm, təhsil və mədəniyyət mərkəzi rolunu oynamış, “Rəbi-Rəşid” adlanan akademiya şəhərciyini, oradakı məscid, mədrəsə, xanəgah və s.

saray kompleksini də geniş şəkildə, həm də məhəbbətlə təsvir edir.

“Cami-cəm”in I fəsli yaradılışın başlanğıcından insanın doğulmasına qədərki mövcudat hadisə və proseslərini əhatə edir. Varlığın yaradılış nizamında və ardıcıllığında Əvhədi sufizmin inanc sisteminə və təsəvvürlərinə əsaslanır. Sənətkara görə, kosmoqonik düzən belə bir nizam və ardıcıllıqla baş vermişdir: Əvvəli və sonu olmayan Xaliq özünü aşkar etmək və qüdrətini göstərmək üçün varlığı yaratmağa qərar verdi. Xilqət nizamında Tanrının ilk baxışından əvvəlcə əqli-küll, sonra isə nəfsi-küll yarandı. Üçüncü həmlədə nəfs şəhpər açdı. İki fərd üçüncü cövhərlə birləşdi. Həmin üçdən üç ölçü aşkara çıxdı. Nəfs Tanrının və özünün kim olduğunu bilməkdən ötrü özünə nəzər saldı. Sonra ağıl, ardınca fələk xəlq olundu. Çərx eşitmək və danışmaq öyrəndi. Nəhayət, səkkiz cənnət, yeddi cəhənnəm və on iki bürc qərarlaşdı. Çərx yaradılışın hikmətinə heyran olub dövr etməyə başladı, yer işıqlandı və zaman əmələ gəldi. Aləm dörd fəslə bölündü, yeddi iqlim, ardınca isə cəhətlər yarandı. Maddi dünyanın əsasını təşkil edən dörd ünsür (torpaq, od, su, hava) zühur etdi. Həyat və ölümün səbəbi olan həmin dörd ünsür üç mövludu (mədənat, nəbatat, heyvanat) əmələ gətirdi. Yaradılmış bütün bu şeylər bir-biri ilə sıx əlaqəli və vəhdətdədir. Bunlar səbəb və nəticə əlaqəsi ilə bir-birinə bağlanmışlar. Yaradılış nizamı insanla yekunlaşdı. Yəni insan sonuncu məxluqdur.

Əvhədiyə görə, insan başqa yaranmışların hamısından üstün və şərəflidir. Allahın yer üzündəki xəlifəsidir. Bəşər övladı öz kimliyini sadəcə olaraq dərk edə bilmir:

*Heyif öz qədrini bilmirsən ancaq!*
*Yoxsa sən möhtəşəm kəssən, yaxşı bax!*
*Adın xələf, özün xəlifə nəsəb,*
*Bu ad verilməyib sənə bisəbəb*
*Sənsən haqq zatının adı, ünvanı.*
*Qüdsün tilsimisən, özünü tanı.*

Şairin fikrincə insan vücudu elə yaradılmışdır ki, dünyanın sirləri onda pünhandır. O, həm qeybi, həm də maddi aləmi özündə birləşdirir. Məskəni uca asimandır. İnsan bədəni libasa bürünmüş ilahi bir qübbədir. Xaliq bir nəqqaş kimi qələm çalanda, insanda ən gözəl xətləri nəqş etmişdir. Ümumiyyətlə, sənətkar dini hədislərdə deyilən belə bir fikirlə tam şəkildə razılaşır ki, Allah gizli bir xəzinə ikən özünü aşkara çıxarmaq və tanıtmaq üçün insanı yaratmaq qərarına gəlir. Lakin onu xəlq etməzdən öncə bütün qeyri mövcudatı yaradır. Deməli, varlıq və ondakı hər şeyin səbəbi insandır. Sonuncu yarananın – insanın xatirinə külli-aləm qərarlaşmışdır. Xilqətin əvvəli də, sonu da insana bağlıdır.

*Sənlə yaradılış sona yetişdi,*
*Sənlə yer ucalıb göyləri keçdi.*
*Varlıq həlqəsinin iki ucunu*
*Sən oldun bağlayan, bil doğrusunu.*

Sənətkar belə hesab edir ki, insan varlığı səma cisimlərinin ciddi təsiri altındadır. İnsan ana bətninə düşdüyü andan Zühəl, Müştəri, Bəhram, Günəş, Ütarid, Zöhrə, Ay kimi səma cismləri ona təsir edir. Körpə vücudu formalaşma prosesində həm əqli-mənəvi və ruhi, həm də cismani-zahiri cəhətdən həmin kosmik cisimlərin himayəsində olur. Doqquz ay müddətində hər ay onların biri ana bətnindəki körpə vücuduna himayədarlıq edir.

Əvhədi I fəsildə təmiz nəfsin xassələri, bədən üzvlərinin hərəkət əlamətləri, bəzi eyhamlı sirlər barədə də öz dini-fəlsəfi düşüncələrini verir.

“Cami-cəm”in II fəsli həcmcə daha böyükdür və bütövlükdə əsərin yarıdan çoxunu təşkil edir. II fəsil özü iki babdan (yarımfəsil) ibarətdir. II fəsil insanın anadan olmasından ölənə qədərki həyatının təsviri ilə bağlıdır. Müəllifin fəsli bablara ayırması məqsədli və nizamlı xarakter dayışır. Belə

ki, birinci babda insanın maddi yaşayış qaydalarından, dünyəvi işlərindən, ikinci babda isə bəşəri xilqətin mənəvi-əxlaqi yaşayış normalarından və axirətə hazırlıq məsələlərindən söhbət gedir.

Birinci bab dünya əhlinin yaşayışı və onun səciyyəsi barədə mülahizələrlə başlayır. Bu babda insanın maddi güzəranını, məişət həyatını necə təmin etməli, cəmiyyətdə, ailədə və fərdi şəkildə maddi yaşayış yolunda hansı mövqedən çıxış etməli olduğu haqda baxışlar sistemi öz əksini tapır. Həmin sistem padşahlara ədalət haqqında nəsihətdən, zülmün zülməti ilə əlaqəli düşüncələrdən başlayıb fərdin cəmiyyətdə, ailədə və şəxsi həyatdakı roluna qədər rəngarəng cəmiyyət hadisələrini, insana məxsus əməli işləri, fəaliyyət normalarını əhatə edir. Şaha yaxın olmaq və ona qulluq etməyin şərtləri, evin və ev əşyalarının nizama salınması, ev tikməyin qaydaları, evlənmək, övlad qazanmaq və onu tərbiyə etməyin şərtləri, tərbiyənin təsiri və özbaşına boy atmanın mənfi nəticələri və s. həmin əməli işlər və fəaliyyət normaları sırasındadır. Sənətkar bir sıra naqis və qeyri-insani keyfiyyətləri pisləyir, əksinə müsbət insani əməlləri və xarakteri isə alqışlayır. Məğrurluq, yüngüllük, lovğalıq, israfçılıq, sərxoşluq, şəraba və bəngə aludəçilik, saxta comərdlik, şəhvət arxasınca getmək, paxıllıq və s. pislənilir, pis qadınların əməlləri tənqid olunur, dostluqda sədaqət, vəfa, comərdlik, kişilik, insanlıq, düzlük, gözütoxluq, nəfsi cilovlamaq bacarığı və s. kimi nurlu insani keyfiyyətlər tərif və təlqin edilir. Ailə məsələləri, övladı necə tərbiyə edib böyütmək və həyata yönəltmək, onu natəmizlərin şərindən necə qorumaq müəllifin diqqət mərkəzində dayanır. O göstərir ki, insanın həyatda çox vacib olan altı borcu vardır:

*Altı borc vacibdir hər bir insana*
*Əvvəlcə borcludur o, yaradana.*
*Sonra da borcludur ata, anaya*
*Şaha, müəllimə, həm ənbiyaya.*
*Əgər bu borcları ödəsən, inan*
*Sən gedib Allaha yaxın olarsan.*

Sənətkar lazımlı, düz-əməlli peşə və sənət öyrənməyi həm insanın özünə, həm də cəmiyyətə gərək olan bir vasitə kimi tərifləyir. Elm öyrənməyin fəzilətindən, elm sahiblərinin və alimlərin şərəfindən danışır. Həqiqi alimləri və fəzilət sahiblərini cəmiyyətin yüksək, lazımlı zümrəsi hesab edir. Hakimlərin və məhkəmələrin vəziyyətinə, cəmiyyətdəki mövqeyinə də diqqət yetirir. Alçaq, riyakar və tamahkar məhkəmələri, fəqihləri tənqid edir. Şair bu babda səfər etməyin fayda və qayda-qanunlarından, öz dövründə şeir bazarının rövnəqsizliyindən və kasadlığından da söhbət açır.

Poemanın II fəslinin ikinci babında dediyimiz kimi, əsas poetik-fəlsəfi şərh hədəfi insanın mənəvi-əxlaqi kamilləşmə prosesi və axirətə hazırlığının nəzəri və əməli yoludur. Daha doğrusu, bəşər övladının ruhi cəhətdən paklaşması, mənəvi cəhətdən təmizlənməsi, əxlaqi cəhətdən saflaşması və kamil insan səviyyəsinə qalxması, mülk aləmindən axirət dünyasına cəhalətdən tam qurtulmuş bir xilqət olaraq getməsidir. Çünki maddi aləm vəfasız və müvəqqətidir. Ona görə də fani olandan əbədi olana, məna aləminə, daimi olan axirət həyatına üz tutmaq lazımdır:

*Bu fani dünyadan çevir üzünü,*
*Məna aləminə döndər gözünü.*

Bir məsələyə diqqət yetirmək lazım gəlir. M.Əvhədi insanın kamilləşmə prosesində getməli olduğu yolu - həqiqət yolunu yalnız islami yol, müsəlmançılığa və şəriət qaydalarına əməl etmək yolu kimi dərk və qəbul etmir. Bu yönümdə daha çox bir təsəvvüf ideoloqu, təriqətçi kimi çıxış edir. Bəşəri fərdlərin cəhalətdən xilas və kamilləşmə yolunun təriqət yolçuluğundan, müridlik, saliklik meydanından keçdiyini qəbul edir. Məsələlərə də məhz bu mövqedən ya-

naşır. Təlqin, təbliğat və şərhlərini də sufi baxışlarının prinsiplərinə uyğunlaşdırır.

Sənətkara görə, kamala çatmağın yolu mürşid, rəhbər axtarışından başlayır. İnsan həqiqət yoluna qədəm qoymaq üçün, ilk növbədə, özünə kamil, inanılmış, pak əmələ və xislətə malik mürşid, şeyx tapmalı və ona müridlik etməlidir. Belə bir mürşidin rəhbərliyi ilə ilk növbədə pis əməllərdən, şər işlərdən tövbə etməlidir. Çünki canda, bədəndə olan zülməti ancaq tövbə suyu ilə yumaq mümkündür:

*Tövbəylə günahdan sən olsan kənar,*
*Zahirin, batinin nura boyanar.*

Müridliyin ən vacib şərtlərindən biri nəfsi ram etməkdir. Çünki nəfs bəndəni maddi dünyaya bağlayan, onu şərə, bədxahlığa, zahiri və aldadıcı təmtərağa, gözəlliyə bağlayan iblisdir. Dünya məhbəsindən qurtuluşun yolu nəfsin zindanından azad olmaqdan keçir:

*Boğmasa nəfsini mürid olan kəs,*
*Dirilik suyuna yol tapa bilməz.*
*O zaman kişinin başı ucalar,*
*Ki nəfsinin başı aşağı olar.*

Haqqa doğru yol gedən müsafir – mürid bu yolda çətinliklərdən və sınaqlardan keçməlidir. Özünü bütünlüklə mürşidə təslim etmiş, onun buyruqlarına danışıqsız əməl etməli olan mürid lazımi mərhələdə mürşidin məsləhəti ilə xəlvətə çəkilməlidir. Aclıq, yuxusuzluq, sükut və üzlət (guşənişinlik) kamal yolunda salikə rəhbərdir. Belə ki, bu dörd komponent insanın iradəsini möhkəmləndirir, nəfslə mücadilədə ona kömək edir, Haqqı və həqiqətləri dərk etməkdə yardımçı rolunu oynayır. Xəlvətdə müridin icra etməli olduğu vacib əməllərdən biri də çillə keçirməkdir. Qırx gün çillə keçirdən həqiqi salik təkəbbür, mənəmlik, qafillik, hiylə, qəzəb, şəkk, paxıllıq, kələk, kin, tamah, yalançılıq, saxtakarlıq, şəhvət, nankorluq, böhtançılıq, fitnəkarlıq, riyakarlıq və s. kimi qeyri-insani xislətlərdən təmizlənir.

Haqqa xidmət, yəni müridlik riya və hiyləyə deyil, ixlasa əsaslanmalıdır. İxlas sədaqət nurunu tapmaq, yaradanı görmək deməkdir. Sənətkar əsərdə Haqqa ibadət və xidmət adı ilə ikiüzlülük və saxtakarlıq edənləri uzun-uzadı məzəmmət edib pisləyir.

M.Əvhədi müridliyin şərtlərindən olan tərk və təcrid, zöhd, təvəkkül, səbr və təslim, şükr və s. barədə də geniş söhbət açır. Bunların mahiyyət və mənasını anlatmağa çalışır. Ağılın, canın, elmin və ürəyin mənasını sufi təlimin baxışları mövqeyindən izah edir və göstərir ki:

*Elm oyaqlıqdır, ağıl isə şam,*
*Nəfs, yuxu, ehtiras zülmətdir tamam.*

Şairin fikrincə, ağıl insanı idarə edən və onu pis əməllərdən çəkindirən, həqiqət yoluna döndərən cövhər, doğru yolun pasibanıdır. İnsani vücudda ürəyin mənası və rolu isə xüsusi dəyər kəsb edir. Ürək təhqiq yolunun rəhbəri, iman nurunun məskənidir. O, canla ağılın vəhdətindən doğulmuşdur. Bütün bədən üzvlərinin hər birinin üzü müxtəlif səmtədirsə, ürəyin üzü Allaha doğrudur:

*Bədəndə hər qapı bir bazaradır*
*Ürəyin üzüsə ancaq yaradır.*

Təsəvvüf təlimində ən mühüm mənəvi-hissi kateqoriyalardan biri, ilahi varlığı tanıma yolunda birinci vasitə eşqdir. Ağıl nə qədər dəyərli olsa da, ilahi hikmət və həqiqətlərin dərki üçün kafi deyil. Bundan ötrü eşq lazımdır.

*Ağılla işləsən işdən qalarsan,*
*Eşq ardınca getsən kişi olarsan.*
*...Eşq səni fənaya, məhvə səsləyir,*
*Ağılsa məntiqə, nəhvə səsləyir.*

Məntiqə söykənən ağıl yalnız cismani aləmin dərki üçün bəs edir, mütləq və əbədi olanın dərki, keçici olandan, cismani gerçəklikdən, nəfsin çirkabından, riya xərmənindən qurtuluşun, mənanı tapmağın yolu isə həqiqi məhəbbətdir.

Əvhədi də sələfləri və müasirləri kimi var-dövlət xatirinə insan şəxsiyyətinin alçaldılmasını rədd edir. O, sərvət və mənsəb üçün riyakarlıq, ikiüzlülük, paxıllıq, yaltaqlıq, böhtançılıq edən insanları pisləyir, tüfeyliləri, ziyankarları, ədalətsizləri, xalqın qanını soranları, mənasız işlərə uyuşanları tənqid edir.

Lakin qadına münasibətdə Əvhədi öz böyük sələfi Nizami ilə ayaqlaşa bilir. Sağlam ailə qurmaq, qadına hörmət və ehtiram göstərmək haqqında düzgün və maraqlı fikirlər yürüdür.

II fəsil boyunca bir neçə kiçik hekayət də verilmişdir. Həmin hekayələr irəli sürülən mülahizələri həyati əhvalatla isbata yetirmək məqsədi güdən təmsil-dəlil rolunu oynayır.

"Cami-cəm"in III fəsli insanın cismani ölümdən sonrakı axirət həyatına həsr olunmuşdur. Bunun üçün müəllif əvvəlcə məxluqun vədə günü, axirət əhvalatı və təbii ruh haqqında məlumat verir. Məad (axirətə qayıdış) gününün həqiqət olduğunu söyləyir, onun xassələri barədə danışır. Təbii ki, bütün bu bilgilər dini təsəvvürlərə, orta əsr elmlərinin və təriqət görüşlərinin diktə etdiyi məlumatlara söykənir. Sənətkarın fikrincə, insan bir məxluq kimi vücud, can və təbii ruh olmaqla üç ünsürdən ibarətdir. İnsan ölərkən ilahi cövhər olan ruh bədəni tərk edir, əsl aləmə yüksəlir, əbədiyyət qazanır. Pak vücud, yaxşı əməl, kamil mənəviyyat və əxlaq sahiblərinin ruhu cənnətə, kafirlərin, imansızların ruhu isə cəhənnəmə qovuşur.

Şair bu fəsildə nəfsə yoldaş olan elmlər, cənnətin sifəti və onun mərtəbələri barədə də öz dini-fəlsəfi düşüncələrini ifadə edir.

"Cami-cəm" poeması Xacə Qiyasəddin Məhəmməd ibn Rəşidə xitab, kitabın yazılma tarixi, öz etiqadı haqqında düşüncələr və kiçik sonluqla yekunlaşır.

M.Əvhədinin bu poeması bu gün də epik poeziyamızın nadir incilərindən biri kimi öz dəyərini itirməmişdir.

Ümumiyyətlə, klassiklərimizin əsərlərində tərbiyəvi mövzuda çoxlu nümunələr vardır ki, yeri gəldikcə onların mənası açılıb, gənc nəslə çatdırılmalıdır. Bu yolla həm də gənc nəsil xalqımızın milli dəyərlərinə dair klassiklərimizin əsərlərində öz yerini tapmış adət-ənənələrimizə də dərindən bələd ola bilərlər. Bir sıra dəyərli bədii nümunələr dərsliklərdə öz yerini tutmasa da, onlar haqqında şagirdlərdə müəyyən təsəvvür yaradılmalıdır.

*Rəyçi: prof. M.Allahmanlı*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan ədəbiyyatı tarixi. Altı cilddə. Bakı: Elm, 2007.
2. Səfərli Ə., Yusifli X. Azərbaycan ədəbiyyatı tarixi. Bakı, 2008.
3. Arif M. Azərbaycan xalqının ədəbiyyatı. Bakı, 1958.
4. Mir Cəlal. Klassiklər və müasirlər. Bakı, 1973.

**Я.Бабаев**

**Морально-дидактические произведения наше духовное богатство**

**Резюме**

В статье говорится о морально-дидактических мыслях в одном образце классической литературы средних веков – "Джами Джем".

**Y.Babayev**

**Moral didactic works are our moral values**

**Summary**

The article is dedicated to the moral-didactic thoughts expressed in the work "Jami –jam" ("Jamshidin Jami"), the example of our classical heritage in the Middle Ages.

# TƏLİMƏ MARAĞIN ARTIRILMASINDA MÜƏLLİM AMİLİ

**Nəsrəddin Musayev**
***“Azərbaycan məktəbi” jurnalının baş redaktor müavini, qabaqcıl təhsil işçisi, Azərbaycan Jurnalistlər Birliyinin üzvü***

***Açar sözlər:*** *müəllim, şagird, təlim prosesi, dərsin didaktik məqsədi, pedaqoji və psixoloji qabiliyyət, pedaqoji təsir vasitələri.*

***Ключевые слова:*** *учитель, ученик, учебный процесс, дидактическая цель урока, педагогическая и психологическая способность, педагогические средства вмияния.*

***Key words:*** *teacher, student, teaching process, didactic aim of the lesson, pedagogical and psychological ability, means of pedagogical influence.*

Ölkəmizdə tədris prosesinin təşkilinin yeni, daha səmərəli formalarının tətbiq edilməsi yüksək intellektual hazırlığa malik olan, qazandığı biliklərdən istifadə etməyi bacaran hərtərəfli dünyagörüşə malik, milli-mənəvi və ümumbəşəri keyfiyyətlərə yiyələnmiş şəxsiyyətin, əsl vətəndaşın yetişdirilməsinə xidmət edir. “Azərbaycan Respublikasında Təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda deyilir: “Müəllim amili təhsilalanın öyrənməsi və inkişafı, nailiyyətlərin monitorinqi prosesində həlledici rol oynayır”. Təhsilin keyfiyyətini yüksəltmək və onun dinamik inkişafını təmin etmək üçün yeni pedaqoji texnologiyalardan, yeni təlim metodlarından istifadəyə üstünlük verilir. Təlimdə tətbiq edilən metodlar şagirdlərə proqram dairəsində biliklərin verilməsi ilə bərabər, həm də onların hərtərəfli inkişaf etmiş şəxsiyyət kimi formalaşmasına istiqamətləndirilir. Burada təhsilverənlərin üzərinə çox böyük vəzifələr düşür. Çünki məktəb təcrübəsində yeni təlim metodlarının tətbiqində uğurlarla yanaşı, nöqsanların da olmasında təlim metodlarının təsadüfi seçilməsi və ya yanlış tətbiqinin, dərsdə reproduktiv (məlumatverici) metodlara üstünlük verilməsinin rolu az deyildir. Burada təhsilalanların yaradıcılıq qabiliyyətlərini inkişaf etdirə biləcək metodların tələb olunan səviyyədə tətbiq edilməməsinin, yeniliyi tətbiq edərkən dərsin didaktik məqsədinin və fənnin xüsusiyyətlərinin nəzərə alınmamasının da böyük təsiri vardır. Deməli, müəllimlərin bir çoxu hələ də ya yeni təlim metodlarının tətbiqinə yaradıcı yanaşmağa lazımi cəhətdən yiyələnməmiş, ya bu sahədə nəzəri bilikləri qənaətbəxş deyil, ya da onların mahiyyətini olduğu kimi dərk edə bilməmişdir.

Pedaqoji ədəbiyyatlarda təlim metodlarının mahiyyəti üzrə müxtəlif fikirlər mövcuddur. Bəzi pedaqoqlar təlim metodlarını tədris prosesində istifadə olunan yollar və vasitələr, digərləri iş sistemi, müəllimlərlə şagirdlərin qarşılıqlı fəaliyyət qaydaları kimi xarakterizə edirlər. Göründüyü kimi, təlim metodları öyrətmək və öyrənmək məsələlərini və bu zaman istifadə olunan didaktik vasitələri özündə ehtifa edir. Fikrimizcə, yeni metodların tətbiqi zamanı müəllim hər bir metodla, nəinki necə öyrətmək, həm də şagirdlərin öyrənmə fəaliyyətini necə təşkil etmək məsələlərini vəhdətdə götürməlidir.

Dünya təcrübəsindən də məlumdur ki,

güclü təhsilə malik ölkələrdə hər bir dərsə sözün əsl mənasında, təfəkkür və intellekt məkanı kimi baxılır. Bu məqsədlə müasir təlim metodlarının, interaktiv təlim texnologiyalarının düzgün və məqsədyönlü tətbiqi başlıca şərt hesab edilir, üstünlük şagirdlərlə işə verilir. Dərsboyu şagirdlər daim axtarışda olur, fikirlərini aydın şəkildə ifadə etməyə, əldə etdikləri bilik və bacarıqların düzgün tətbiqinə çalışırlar. Fəal-interaktiv təlim metodu keyfiyyətin artırılmasına güclü təsir göstərir, şagirdlərin təfəkkürünü inkişaf etdirir, onları düşündürür, axtarışlar aparmağa, bir fərd, bir şəxsiyyət kimi formalaşdırmağa geniş imkanlar yaradır. Bu metodların tətbiqi zamanı şagirdlərin psixi xüsusiyyətləri - qavrayışı, qabiliyyəti, xarakteri, duyğusu, meyil və maraqları inkişaf edir. Z.Veysovanın qeyd etdiyi kimi, interaktiv təlim metodları üçün şagirdin aktiv fəaliyyəti, müəllimin şagirdlə və şagirdin bir-biri ilə əməkdaşlığı, didaktik, rollu oyunlardan istifadə səciyyəvidir. Buraya şagirdlərin işgüzar fəaliyyəti üçün sinifdə sosial bərabərliyin və psixoloji mühitin yaradılması, müəllimin bilik xəzinəsi rolunu deyil, biliklərin axtarılması və tədqiqatın aparıcısı rolunu ifa etməsi kimi keyfiyyətlər də daxil edilir.

Yeni təlim metodlarının tədris prosesinə daxil edilməsi məzmunun öyrənilməsində səmərəliliyin artırılmasına, şagirdlərin dərketmə fəaliyyətinə, onlarda yaradıcılıq qabiliyyətinin formalaşdırılmasına geniş imkanlar açır. Bu metodlardan məqsədyönlü şəkildə istifadə etməklə bütün pedaqoji texnologiyaların əsasında dayanan demokratikləşdirmə, humanistləşdirmə, diferensiallaşdırma, fərdiləşdirmə, inteqrasiya və humanitarlaşdırma prinsiplərini arzu olunan səviyyədə həyata keçirmək mümkündür. Təcrübə göstərir ki, fəal təlim zamanı şagirdlərin özünəinamı artır, şəxsiyyətlərarası münasibətlər yaxşılaşır, məktəbə və oxumağa meyil çoxalır. Fəal təlim şagirdlərdə sürətli şəkildə yeniləşən şəraitə uyğunlaşma qabiliyyətlərinin formalaşdırılması zəruri etmişdir. Bunu da nəzərdən qaçırmaq olmaz ki, bu metodu konkret olaraq gündəlik fəaliyyətində tətbiq edən müəllimin özü də yeniliyə hazır olmalı, dünyada və ölkəmizdə gedən inkişaf tendensiyalarını izləməli, yenilikçi olmalı, öyrətməyi öyrənməlidir. Belə olarsa, o, fəal dərsin nə zaman, hansı məqsədlərə görə istifadəsini, necə qurulmasını, şagirdlərin səviyyəsinə uyğunlaşdırılmasını, ayrı-ayrı metod və texnologiyaların seçilməsi prinsiplərini və fəal dərsin nəticələrinin necə qiymətləndirilməsini düzgün müəyyənləşdirə bilər.

İnteraktiv təlim metodları yalnız yüksək səviyyədə əməkdaşlıq şəraitində qurulduğu halda səmərə verə bilər. Əməkdaşlıq isə o vaxt mümkündür ki, tərəflər arasında (müəllim-şagird, şagird-şagird ) səmimiyyət, hörmət, ən başlıcası isə inam olsun. Humanistləşdirmə prosesinin komponentləri olan bu keyfiyyətlər olmadan interaktiv təlimdə əməkdaşlıqdan söhbət belə gedə bilməz.

Tədris prosesində şagirdlərin aktiv fəaliyyətini təmin etmək, fəallığına və müstəqilliyinə maksimum üstünlük vermək interaktivliyin əsas məqsədlərindən sayılır. Elə məqam yetişməli, güclü ehtiyac duyulmalıdır ki, ciddi fəaliyyətə başlamaq üçün hazır olasan. Sinifdə şagirdlərin aktiv fəaliyyəti onların zehni imkanlarının, buna qədər əldə etdikləri bilik və bacarıqların, dolğun elmi məlumatların zəminində, normal sosial-psixoloji iqlim şəraitində baş verir. Beləliklə, şagird o vaxt canlı fəaliyyətə qoşulur ki, özünün öyrəndiyi, qazandığı elmi anlayışların düzgünlüyünə inansın və bunun tətbiqi prosesində öz cəsarətinə güvənsin. Buna nail olmaq üçün müasir dərsdə şagirdin şəxsiyyət olduğu nəzərə alınmalı, o, təlim-tərbiyə prosesinin bərabərhüquqlu subyekti kimi qəbul edilməlidir. Digər tərəfdən, şagirdlərə münasibətdə ayrı-seçkiliyə son qoy-

maq, onların öz düşüncələrini sərbəst və azad ifadə etməyə imkan yaratmaq, onları təhsili və inkişafı üçün təhlükə törədə biləcək fəaliyyətdən qorumaq müəllimlərin ümdə vəzifəsidir. Bütün bunlar müasir dərsə verilən tələbləri də zəruri edir. Çünki şagird milli və ümumbəşəri səciyyəli bilikləri, bacarıq və vərdişləri, mənəvi keyfiyyətləri məktəbdə müəllimin köməyi ilə mənimsəyir. Ona görə də müasir təlim metodları ilə işləyən müəllim yaşca böyük olsa da, şagirdləri ilə həm dost, həm tərbiyəçi, həm də əlaqələndirici, istiqamətverici rolunda çıxış etməlidir.

Yeni metodların ən təqdirolunası cəhətlərindən biri də təlimdə şagird fəallığının maksimum artırılmasıdır. Dərs prosesində şagird nə isə yeni bir şey öyrənibsə, müəyyən bilik və bacarığa yiyələnibsə, yoldaşları və müəllimləri ilə faydalı ünsiyyətə girə bilibsə, bir şəxsiyyət kimi qəbul edildiyini görübsə, deməli, həmin dərs səmərəli olmuşdur. Bu, hər bir müəllimin pedaqoji fəaliyyətinin ölçü vahidi kimi qəbul edilməlidir.

Müşahidələr bunu deməyə əsas verir ki, tədris prosesində müəllimlərin qarşıya qoyduğu məqsədin aydın və sadə, şagirdlərin başa düşəcəkləri səviyyədə olması vacib şərtdir. Təcrübə göstərir ki, tələbyönümlülük, şəxsiyyətyönümlülük və nəticəyönümlülük prinsipləri əsasında qurulan dərslər daha çox səmərə verir. Şagirdlərin maraqları əsasında qurulan bu cür dərslər onlara yeni-yeni biliklər qazanmaqda, qarşıya qoyulmuş problemin həllini axtarıb tapmaqda, uğurlu nəticələr əldə etməkdə yardımçı olur. Belə dərslər uzun müddət şagirdlərin hafizəsindən silinmir. Tədrisin bu cür təşkili isə müəllimdən, ilk növbədə, pedaqoji ustalıq tələb edir. Çünki gələcəyimiz olan gəncləri milli adət - ənənələr ruhunda tərbiyə etmək, onları müasir elmi-pedaqoji biliklərlə silahlandırmaq üçün müəllimin özü də nümunə göstərməli, dünyada gedən prosesləri izləməli, innovativ yeniliklərin mahiyyətini düzgün dərk etməli, sistemli elmi axtarışlar aparmaqla daim öz üzərində çalışmalıdır. Ona görə ki, müəllim təlim-tərbiyə prosesində əsas simadır. O, tədris etdiyi fəndən asılı olmayaraq uşaq və gənclərə fəal təsir göstərə bilir, onların həyata baxışlarını, münasibətlərini formalaşdırır. Hər dövr müəllimin qarşısında yeni tələblər qoyur, ondan zamanın tələblərinə uyğun olaraq davranmağı, yüksək keyfiyyətlərə malik olmağı tələb edir. Nəzərdən qaçırmaq olmaz ki, hazırkı şagirdlər informasiya-kommunikasiya texnologiyalarının ən müasir yeniliklərindən xəbərdardır. Deməli, onlara dərs deyən müəllim də müasirləşməli, öz işini dövrün tələbləri səviyyəsində qurmağı bacarmalıdır.

Pedaqoji ədəbiyyatlarda müəllimlik şərəfli, məsuliyyətli, yaradıcı, çətin və mürəkkəb iş kimi səciyyələndirilir. Onun simasında yüksək əqidə, məslək, mədəniyyət və mənəviyyat, dərin bilik, erudisiya, öz fənnini, peşəsini və uşaqları sevmək, yüksək nüfuz sahibi və gənclərə nümunə olmaq və s. keyfiyyətlər cəmləşməlidir. Deməli, XXI əsrin müəllimi tədris etdiyi fənnin nəzəri əsaslarını dərindən bilməklə yanaşı, dünyada gedən prosesləri düzgün qiymətləndirməyi bacarmalı, elmi-texniki və ictimai-sosial tərəqqi ilə ayaqlaşmalı, uşaq və gənclərin psixologiyasına yaxşı bələd olmalı, öz fəaliyyətinə yaradıcı yanaşmalıdır. O, şagirdlərin müstəqil, yaradıcı təfəkkürünün, idrak qabiliyyətinin inkişafına ardıcıl səy göstərməlidir. Müstəqil mühakimə yürütmək, elmi mübahisə aparmaq prosesində əsas ünsür dialoq olarsa, nəticə də uğurlu olar.

İndiki dövrdə gənc nəslin elmi dünyagörüşü onun hərtərəfli hazırlığı, məntiqi savadı ilə bərabər emosional təsir gücü ilə də səciyyələnir. Gənc nəslin həyata, cəmiyyətə, informasiyaların qavranılmasına yanaşma tərzi yeni çalarlar kəsb edir. Nəzərə almaq lazımdır ki, elmi-texniki inkişafın, qloballaş-

ma prosesinin sürətləndiyi bir vaxtda köhnə metodlarla işləmək yolverilməzdir. Deməli, müəllimin özünün yeni yanaşmalarla və ideyalarla işləməyə hazır olması zamanın tələbidir. Əgər müəllim həm öyrətmək, həm də öyrənmək səriştəliliyinə malik olarsa, qarşıya qoyulan məqsədə çatmaq da asan olar. Pedaqoji ədəbiyyatlardan da məlum olduğu kimi, müəllim təqlid və ya nümunə modelidir, gənc nəslin öz gələcəyinə baxdığı pəncərədir. Bu səbəbdəndir ki, şagirdlər müəllimin yeniliyə, öyrənməyə və öyrətməyə nə dərəcədə həvəsli olduğunu görərək öz fəaliyyətlərində də bunu tətbiq etməyə çalışırlar.

Tədris prosesində şagirdləri motivləşdirmək indi daha çox aktuallıq kəsb edir. Mütəxəssislərin fikrincə, motiv və ya niyyət insanı müəyyən hərəkətə yönəldən qüvvədir, öyrənmək arzusunu həyata keçirən enerjidir. Yüksək nəticə əldə etməkdən ötrü bu enerjini hərəkətə gətirmək vacibdir. Fənnə maraq oyatmaq, şagirdlərin mövzuya bələdləşməsini həyata keçirmək müəllim üçün çox önəmlidir. Motivasiya insan fəaliyyətinə istiqamət verən ən mühüm amillərdən biridir. Bu da sübut olunmuşdur ki, potensialını gerçəkləşdirməyə şərait yaratmaqla, istedadlarını, qabiliyyətlərini aşkar etməyə kömək göstərməklə məktəblilərin həyatını dəyişmək, onlarda özünəinam hissini gücləndirmək olar. Belə olduğu təqdirdə onlar öz qabiliyyətlərini asanlıqla üzə çıxara bilərlər. Şagirdlərin emosiyalarını duymaq, onları başa düşmək çox önəmlidir. Çətin situasiyalarda da müəllimin üzündə təbəssüm olmalıdır. O, hər bir arzuolunmaz vəziyyətdə müsbət cəhətləri görməlidir. Nəzərə almaq lazımdır ki, şagirdlərin bəzilərində müşahidə olunan aqressiya və neqativ münasibətlərin kökləri var. Müəllim bunu diqqət mərkəzində saxlamaqla hər bir vəziyyətdə sakitliyi və özünənəzarəti təmin edə bilər. Cəza üsulu çıxış yolu deyil, əksinə, təmkinli olmaq daha güclü tərbiyəvi təsir göstərir. Əgər müəllim uşaq qəlbinə humanizmi ilə nüfuz etməyi bacarırsa, deməli, öz şərəfli vəzifəsini yerinə yetirmiş olur.

Qarşıya çıxan çətinliklərin düzgün diaqnozu müəllimin pedaqoji ustalığından çox asılıdır. Şagirdlərin fikirlərinə hörmətlə yanaşmaq, onlara düzgün istiqamət vermək hər bir müəllimin peşə borcudur. Təşkilatçılıq bacarığı vaxtdan səmərəli surətdə istifadədə və planlı şəkildə hərəkət etməkdə önəmli yer tutur. Əksər uşaqlara görə, əsl müəllim dərs prosesində müasir təlim metodlarından, informasiya-kommunikasiya texnologiyalarından düzgün və səmərəli istifadə edən müəllimdir. Bu, həqiqətən, belədir. Ona görə ki, İKT-nin tədris prosesinə tətbiqi bu gün informasiyalı cəmiyyətin, qloballaşan dünyanın zəruri tələblərindən və ehtiyaclarından irəli gəlir. Müasir texnologiyalardan istifadə yeni ünsiyyət formalarını meydana çıxarır, “müəllim-şagird”, “şagird-şagird” əməkdaşlığının tənzimlənməsi üçün əlverişli şərait yaranır.

Bəzən müəllimlər şagirdlərin dərslərdə sakitliyə riayət etməmələrindən şikayətlənir, şagirdlər isə bunu fənnə qarşı marağın olmaması, dərsin cansıxıcı olması ilə izah edirlər. Əslində, bunun əsas səbəbi kimi müəllimlərin tədris prosesində ənənəvi metodlardan istifadəyə üstünlük verməməri ilə izah etmək olar. Çünki müasir müəllim şagirdlərin yaradıcılıq qabiliyyətlərinin inkişafı üçün şərait yaratmalı, onlara müstəqil düşünməyi öyrətməli, “öyrənməyi öyrətmək” qabiliyyətini formalaşdırmalıdır.

İndiki şəraitdə müəllimin vəzifəsini lazımi tələblər səviyyəsində yerinə yetirməsi onun nəzəri hazırlığından, yetkinliyindən, yenilikləri qəbul etmək səriştəliliyindən asılıdır. Çünki qloballaşmanın geniş vüsət aldığı bir dövrdə ictimai-sosial tərəqqini dərk edən, bu tərəqqidə tədris etdiyi fənnin rolunu qiymətləndirməyi bacaran, öyrətdikləri uşaqların psixologiyasına yaxşı bələd olan,

fəaliyyətinə yaradıcı yanaşan müəllimin işi səmərəli ola bilər. Dərsin təşkili zamanı elə metodları seçib tətbiq etmək lazımdır ki, öyrənənlərin müstəqil təfəkkürünün inkişafına şərait yaratmaq, idrak qabiliyyətini inkişaf etdirmək mümkün olsun. Ona görə də müəllimlər daim yeni yollar, ideyalar, sistemlər və yanaşmalar axtarışında olmalıdır. İnteraktiv metodları öyrənib təlim prosesində düzgün tətbiq etməyi bacarmalıdır. Yalnız fəal təlim metodlarından istifadəyə xüsusi diqqət yetirən, qabaqcıl ölkələrin təhsil sistemindəki mütərəqqi üsul və metodlardan xəbərdar olan və qazandıqları nəzəri bilikləri praktik fəaliyyətə çevirə bilən müəllim yenilikçi müəllim kimi yetirmələrinin sevimlisi ola bilər. Yaradıcı olmaq müəllim üçün önəmli xüsusiyyətdir. Yalnız bu yolla məktəbliləri yaradıcı və ruhlandırıcı metodlardan istifadə etməklə yüksək bilik qazanmağa həvəsləndirmək mümkündür.

*Rəyçi: prof. İ.Cəbrayılov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Əlizadə Ə. İdrak prosesləri və hislər. Psixopedaqoji məsələlər. Bakı, 2006.
2. Rzayev O. və b. Təhsilin idarə olunmasının əsasları. Bakı: Mütərcim, 2010.
3. Məmmədov T. İnformasiya cəmiyyəti və təhsil. // Azərbaycan məktəbi, 2012, №2.
4. Veysova Z. Fəal/interaktiv təlim. Bakı, 2007.
5. Kərimov Y. Təlim metodları. Bakı, 2010.
6. Ağayev Ə. Ənənə və müasirlik. Bakı: Adiloğlu, 2006.
7. Mehrabov A. Müasir dərs: onun təşkilinə və gedişinə qoyulan tələblər. // Kurikulum, 2013, №3.

**Н.Мусаев**

**Учительский фактор в повышении интереса к учебе**

**Резюме**

В статье говорится о важности педагогического мастерства в вопросах учебы и воспитания. Также показывается роль научно-педагогической подготовки, личных качеств учителя в этом деле. Отмечается, что учитель, работающий по новым технологиям получает высокие результаты.

**N.Musayev**

**The role of teache's in increasing students' enthusiasm**

**Summary**

In the article it is spoken about the influence of teacher's pedagogical mastery on enhancing the quality of education. It is noted that the teachers who work with new teaching technology achieve more results. The author recommends teachers to meet the demands of the new reform. Because main goal is to form personality, and it depends on the pedagogical mastery and creativity of teachers.

***28 May - Respublika Günü***

# AZƏRBAYCAN XALQ CÜMHURİYYƏTİNİN GƏNCƏ DÖVRÜNDƏ QƏBUL ETDİYİ HÜQUQİ AKTLAR

**İlham Abbasov**
***Azərbaycan Respublikası Ədliyyə Nazirliyi Ədliyyə Akademiyasının baş müəllimi, hüquq üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *Azərbaycan Xalq Cümhuriyyəti, Gəncə dövrü, dövlət dili, dövlət bayrağı, Nazirlər Şurası, hüquqi aktlar.*

***Ключевые слова:*** *Азербайджанская Народная Республика, Гяджинский период, государственный язык, государственный флаг, Совет министров, правовые акты.*

***Key words:*** *Azerbaijan National Republic, Ganja period, state language, national flag, Council of Ministers, legal acts.*

Azərbaycan Milli İslam Şurasının 28 may 1918-ci il tarixli qərarı ilə yaradılmış Azərbaycan Xalq Cümhuriyyətinin müvəqqəti hökuməti Tiflisdə cəmi 18 gün mövcud olmuşdur. Həmin dövrdə isə bu dövlət cəmi 2 qanunvericilik aktı qəbul etmişdir. Belə ki, Azərbaycan Milli İslam Şurası "İstiqlal bəyannaməsi" qəbul etməklə, Azərbaycanın dövlət müstəqilliyini elan etmiş və eyni tarixli 2-ci qərarla Fətəli Xan Xoyski başda olmaqla, Şərqdə ilk demokratik respublika olan Azərbaycan Xalq Cümhuriyyətinin birinci müvəqqəti hökumətinin – Nazirlər Şurasının tərkibini təsdiq etmişdir.

Bu hökumət mühacirətdə əslində, heç bir fəaliyyət göstərə bilmir, ona görə də öz təsir dairəsini bütün Azərbaycana yaymaq məqsədilə 16 iyun 1918-ci ildə Gəncəyə köçür, Gəncə şəhəri paytaxt elan olunur.

Bu vaxt Gəncə Türkiyənin Qafqaz İslam Ordusunun baş komandanı Nuru paşanın əlində olduğundan Nuru paşa ilə Gəncəyə gəlmiş Azərbaycan Milli İslam Şurası və müvəqqəti hökumət danışıqlara başlayır və qarşılıqlı güzəştlər əsasında ümumi razılığa gəlmək mümkün olur. Bu təklifə görə Milli İslam Şurası buraxılmalı və bütün hakimiyyət yeni yaradılacaq hökumətə həvalə olunmalı idi. Həmin məsələlərin müzakirəsi üçün 1918-ci il iyunun 17-də Gəncə şəhər idarəsinin binasında M.Ə.Rəsulzadənin sədrliyi ilə Milli İslam Şurasının növbəti yeddinci iclası keçirilir. Həmin iclasda Azərbaycan Milli İslam Şurasının buraxılması, bütün qanunverici və icraedici hakimiyyətin Azərbaycanın müvəqqəti hökumətinə verilməsi haqqında iki mühüm qətnamə qəbul edilir [3, səh. 8-9].

Gəncədə fəaliyyət göstərdiyi 3 ay ərzində (16 iyun - 15 sentyabr 1918-ci il) müvəqqəti hökumət bir çox hüquqi aktlar qəbul edir. Belə ki, Azərbaycan Milli İslam Şurasının 17 iyun 1918-ci il tarixli qərarı ilə Fətəli Xan Xoyskinin sədrliyi ilə müvəqqəti hökumətin ikinci tərkibi təsdiq edilir. Müvəqqəti hökumətin tərkibinə 11 nazir daxil edilir. Bundan əvvəl isə Azərbaycan Xalq Cümhuriyyətinin müvəqqəti hökumətinin ilk tərkibinin istefası qəbul edilir [4, səh. 11-12].

Elə həmin tarixdə Azərbaycan Milli İslam Şurasının buraxılması haqqında qərar

qəbul edilir [4, səh. 12].

Müvəqqəti hökumətin 19 iyun 1918-ci il tarixli qərarı ilə hökumət üzvləri arasında müvəqqəti vəzifə bölgüsü aparılmış, həmçinin hökumətin eyni tarixli daha bir qərarı ilə Azərbaycan ərazisində fövqəladə vəziyyət rejimi elan edilmişdir [4, səh. 186-187].

Hökumətin 19 iyun 1918-ci il tarixli daha bir qərarı ilə quberniya əhəmiyyətli ayrı-ayrı məmurların (keçmiş 4-cü sinif məmurlar daxil olmaqla) vəzifələrə təyin edilməsinin Hökumətdən asılı olması, digər bütün məmurların isə öz idarələri üzrə müvafiq nazirliklər tərəfindən vəzifəyə təyin edilməsi nəzərdə tutulurdu.

Nazirlər Şurası əhalinin, həmçinin Milli Ordunun ərzaqla təminatı məsələsini müntəzəm olaraq diqqət mərkəzində saxlamış, bu məqsədlə 21 iyun 1918-ci ildə bütün hərbi hissələrin və Gəncədə yerləşən türk ordusunun zəruri ərzaqla təmin edilməsi üçün qərar qəbul etmişdir.

Azərbaycan Xalq Cümhuriyyəti hökuməti ərzaq məhsullarının qanunsuz xarici ölkələrə daşınmasının qarşısını almaq məqsədilə 22 iyun 1918-ci il tarixli qərarla Daxili İşlər Nazirliyinə Poylu dəmir yolu stansiyasında sərhəd postunun açılması barədə təklif vermişdir [4, səh.189].

Müvəqqəti hökumətin fəaliyyəti dövründə dövlət bayrağı haqqında iki dəfə qərar qəbul edilmişdir. 21 iyun 1918-ci ildə qəbul edilən qərara əsasən Azərbaycanın dövlət bayrağı qırmızı rəngli materialdan hazırlanmaqla, üzərində ağ rəngli aypara və səkkizguşəli ulduzun olması nəzərdə tutulurdu [4, səh.188].

Lakin az sonra müstəqil Azərbaycanın ilk dövlət bayrağının təsvirinin Türkiyənin dövlət bayrağı ilə eyni olmasını nəzərə alaraq, Nazirlər Şurası 9 noyabr 1918-ci il tarixli qərarı ilə Azərbaycan Xalq Cümhuriyyətinin yaşıl, qırmızı və mavi rənglərdən, ağ aypara və səkkizguşəli ulduzdan ibarət olan Milli bayrağını təsdiq etmişdir [5, səh. 94].

Azərbaycan Xalq Cümhuriyyətinin Nazirlər Şurası yerli özünüidarəetmə orqanlarının işinin bərpa edilməsi məsələsini də həmişə diqqət mərkəzində saxlamışdır. Təsadüfi deyildi ki, Nazirlər Şurası Yelizavetpol şəhər (indiki Gəncə şəhəri-İ.A.) ictimai özünüidarə orqanının bərpası haqda qərar qəbul etmiş və onlara təcili fəaliyyətə başlamağı təklif etmişdir [4, səh.190]. Müvəqqəti hökumət, həmçinin hökumət qulluqçuları arasında sabotajlığın və qulluq vəzifələrini yerinə yetirməkdən imtina etmə hallarının aradan qaldırılması məqsədilə 24 iyun 1918-ci ildə “1 iyul 1918-ci il tarixədək vəzifələrin icrasına başlamayan hökumət idarələrindəki qulluqçuların vəzifələrindən azad edilməsi barədə” xüsusi qərar qəbul edir. Qərarda bütün nazirliklərə tapşırılır ki, idarələrdəki hökumət qulluqçuları iyulun 1-nə kimi işə gəlməlidirlər, əks halda onlar dərhal vəzifələrindən azad ediləcəklər [4, səh.194].

Müvəqqəti hökumət 26 iyun 1918-ci ildə Yelizavetpol şəhərində dislokasiya edilmiş Müsəlman korpusunun adının dəyişdirilərək “Əlahiddə Azərbaycan korpusu” adlandırılması barədə qərar qəbul etmişdir. İndi həmin tarix Azərbaycan Milli Ordusunun yaradılması tarixi hesab olunur və dövlət bayramı kimi qeyd edilir. Azərbaycan Xalq Cümhuriyyətinin müvəqqəti hökuməti ölkə ərazisində poçt və teleqraf köçürmələri işini yaxşılaşdırmaq məqsədi ilə Yelizavetpol şəhər (Gəncə şəhəri-İ.A) poçt-teleqraf kontoruna 100 min rubl ayrılması barədə qərar da qəbul etmişdir [4, səh.197]. Nazirlər Şurası ölkədə əhalisini ilk zəruri ərzaq və gündəlik tələbat malları ilə təmin etmək məqsədi ilə Yelizavetpol milli komitəsinin sərəncamında olan bütün ərzaq və gündəlik tələbat mallarının Ərzaq Nazirliyinin sərəncamına verilməsi barədə 27 iyun 1918-ci ildə xüsusi qərar da qəbul etmişdir [4, səh.199].

Azərbaycan Xalq Cümhuriyyətinin

hökumət üzvləri dövlət dilinin bütün dövlət idarələrində tətbiq edilməsi məsələsinə də xüsusi diqqət yetirmişdir. Təsadüfi deyildir ki, Nazirlər Şurasının 27 iyun 1918-ci ildə dövlət dili haqqında xüsusi qərar qəbul etməsi də bu zərurətdən yaranmışdır. Qərarda göstərilirdi ki, dövləti-lisan türk dili qəbul edilərək, iləridə bütün məhkəmə, idarəyi-daxiliyyə və s. dəvair vəzifələri başında duranlar bu lisanı bilənlər olana qədər hökuməti müəssisələrdə rus dili istemalına da müsaidə edilsin [5, səh. 93].

Həmin qərarda Azərbaycanda dövlət dilinin lisani türk, yəni türk dili olmasının göstərilməsi təbiidir. Belə ki, həmin dövrdə ədəbi dildə işlədilən dil sırf Azərbaycan dili deyildi, ədəbi dildə türk, ərəb və fars sözlərindən geniş istifadə edilirdi. Bu ondan irəli gəlirdi ki, Azərbaycan ziyalılarının müəyyən hissəsi Türkiyədə, bir hissəsi Rusiyada və Qərbi Avropada, bir sözlə, xarici ölkələrdə təhsil almışdılar.

Nazirlər Şurası dövlət idarəçilik aparatının işinin yaxşılaşdırılması və daha da təkmilləşdirilməsi məqsədilə 30 iyun 1918-ci ildə bütün nazirliklərdə dəftərxanaların təşkili haqqında xüsusi qərar qəbul etmişdir.

Azərbaycan Xalq Cümhuriyyətinin hökuməti dövlət qulluqçularının maddi təminatının yaxşılaşdırılması məqsədilə 12 iyul 1918-ci il tarixli qərarla hərbi, həmçinin mülki idarələrdə xüsusi xidmətlərinə görə fərqlənən vəzifəli şəxslərə verilən vəsaitin məbləğinin artırılmasını, hər bir halda fərdi müzakirə olunmasını tələb etmişdir.

Ölkədə hərbi əməliyyatlar getdiyi bir vaxtda Nazirlər Şurası 22 iyul 1918-ci ildə "Türkiyədən dərsliklərin gətirilməsi və müəllimlərin dəvət edilməsi barədə" qərar qəbul etmişdir [4, səh. 215].

Azərbaycan Xalq Cümhuriyyəti hökumətinin 30 iyul 1918-ci il tarixli qərarı ilə Yelizavetpol şəhərinin qədim adı – Gəncə özünə qaytarılmış, həmin qərarla Qaryagin qəzası Cəbrayıl qəzası adlandırılmışdır [4, səh. 219].

Hökumətin qəbul etdiyi qərarların Azərbaycan Respublikasında yaşayan bütün xarici təbəələrə şamil edilməsi barədə 3 avqust 1918-ci ildə qərar qəbul edilmişdir. Qərara əsasən Azərbaycan hökumətinin məcbur icrası olan qərarlarının Azərbaycan ərazisi hüdudlarında yaşayan bütün xarici dövlətlərin təbəələrinə şamil edilməsi üçün həmin qərarların bütün Azərbaycan ərasizində yayılması zəruri hesab edilmişdir [4, səh. 219].

Nazirlər Şurası 14 avqust 1918-ci il tarixli qərarı ilə Azərbaycan tərkibinə daxil olan keçmiş Yerevan qəzasında inzibati hakimiyyətin təşkili haqqında xüsusi qərar qəbul etmişdir. Qərarda Daxili İşlər Nazirliyinə tapşırılmışdır ki, Yerevan quberniyasının Azərbaycanın tərkibində olan hissəsində inzibati hakimiyyəti bərpa etsinlər.

Nazirlər Şurası, eyni zamanda əlahiddə, müstəqil və səlahiyyətli fəaliyyət göstərən Azərbaycan dəmir yolunun müstəqilliyinin, faktiki olaraq, 1 iyun 1918-ci il tarixdən hesab edilməsi haqda 17 avqust 1918-ci il tarixdə qərar qəbul etmişdir.

Hökumət əmtəə mübadiləsi işinin qaydaya salınmasına da biganə qalmamış, bu haqda da müvafiq qərar qəbul etmişdir. Belə ki, Nazirlər Şurası əmtəə mübadiləsi haqqında vəsatətlərə baxılması barədə 20 avqust 1918-ci ildə qərar qəbul edərək, həmin qərarla Ərzaq Nazirliyinə tapşırmışdır ki, maliyyə və hərbi nazirlərlə razılaşdırmaqla, əmtəə mübadiləsi haqqında daxil olan müraciətləri həll etsin [4, səh.221].

Azərbaycan Xalq Cümhuriyyəti hökuməti pensiyalar haqqında qanun layihəsinin hazırlanması üçün komissiyanın yaradılması barədə 26 avqust 1918-ci ildə qərar da qəbul etmişdir.

Hökumətin 14 sentyabr 1918-ci il tarixli qərarı ilə ticarət və sənaye, maliyyə və

xalq maarifi nazirliklərinə səlahiyyət verilmişdir ki, əmtəələrin ölkəyə gətirilməsi üçün rüsumların müəyyən edilməsi məqsədi ilə komissiya təşkil etməklə, bu haqda hökumətə məruzə etsin [4, səh. 231]. Həmin tarixdə Müəssislər Məclisinə seçkilərin keçirilməsi haqda Əsasnamənin əsas müddəalarının hazırlanması üçün komissiya yaradılması barədə də qərar qəbul edilmişdir.

Beləliklə, Azərbaycan Xalq Cümhuriyyətinin müvəqqəti hökuməti Gəncədə fəaliyyət göstərdiyi dövrdə 91 qərar, o cümlədən maarif və təhsil sahəsində də bir sıra qərarlar qəbul etmişdir.

Yalnız Nuru paşanın komandanlığı ilə Qafqaz İslam Ordusu Bakı şəhərini 15 sentyabr 1918-ci ildə ermənilərdən azad etdikdən sonra, sentyabrın 17-də Azərbaycan Xalq Cümhuriyyətinin müvəqqəti hökuməti Fətəli Xan Xoyski başda olmaqla, Gəncədən Bakıya köçür və Bakı şəhəri Azərbaycan Xalq Cümhuriyyətinin paytaxtı elan olunur, başqa sözlə, müvəqqəti hökumət fəaliyyətini Bakıda davam etdirir.

*Rəyçi: dos. N.Nəcəfov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin “Azərbaycanlıların soyqırımı” haqqında 26 mart 1998-ci il tarixli Fərmanı. // Dirçəliş - XXI əsr, № 3-4/ 1998, 150 səh.

2. Paşayev A. Açılmamış səhifələrin izi ilə. Bakı: Azərbaycan, 2001, 535 səh.

3. Azərbaycan Xalq Cümhuriyyəti (1918-1920), Parlament (Stenoqrafik hesabatlar), I cild, Bakı: Azərbaycan, 1998, 974 səh.

4. Азербайджанская Демократическая Республика (1918-1920) Законодательные акты (Сборник документов). Баку: Азербайджан, 1998, 423 стр.

5. Nəsibzadə N. Azərbaycan Demokratik Respublikası (məqalələr və sənədlər), Bakı: Elm, 1990, 95 səh.

6. Abbasov İ. // Ümumilli lider Heydər Əliyev Ana dilinin hamisidir. // Azərbaycan dünyası, № 107, iyun 2013, 85 səh.

7. Azərbaycan Respublikasının Konstitusiyası. Bakı: Qanun, 2009, 67 səh.

8. Abbasov İ. Azərbaycan Xalq Cümhuriyyətinin maarif və təhsil sahəsində fəaliyyəti. Azərbaycan hava yolları QSM-nin Milli Aviasiya Akademiyasının elmi məcmuələri, oktyabr-dekabr, Bakı, 2013, 251 səh.

**И.Аббасов**

**Правовые акты Азербайджанской Народной Республики, принятые в Гянджинский период**

**Резюме**

Статью автор посвятил актуальной теме – правовым актам, принятым в Гянджинский период Азербайджанской Народной Республики.

Анализируются различные правовые акты, в том числе, постановления о государственном языке и государственном флаге.

**I.Abbasov**

**Legal acts of Azerbaijan national republic in Ganja period**

**Summary**

The article is dedicated to the Legal Acts which were adopted by Provisional Government of Azerbaijan National Republic in Ganja. The author comes to the conclusion that91 resolutions were accepted during that period. In the article state language and national flag are also analyzed.

***“Azərbaycan məktəbi” - 90 - jurnalımızın arxivindən***

# AZƏRBAYCAN MAARİFİNİN GÜZGÜSÜ

**Zahid Qaralov**
***pedaqoji elmlər doktoru, professor***

“Azərbaycan məktəbi” jurnalı, Azərbaycanda xalq maarifinin inkişafına əməli xidmət göstərmiş ən dəyərli dövri mətbuat orqanı hesab olunur.

Jurnalın mövcud olduğu 75 il ərzində göstərdiyi xidmətin bir neçə mühüm istiqamətini qeyd edə bilərik. Onlardan:

Birincisi, Azərbaycanda pedaqoji və psixoloji fikrin inkişaf dinamikasının məqbul səviyyədə işıqlandırılması.

İkincisi, Azərbaycanda təhsil quruculuğu təcrübəsinin ümumiləşdirilməsi və sistemlə çap edilməsi.

Üçüncüsü, təlim və tərbiyə nəzəriyyələrinin formalaşdırılmasına kömək edən tədqiqatların əsas ideyalarının ardıcıl işıqlandırılması.

Dördüncüsü, Azərbaycanın yaradıcı və zəhmətsevər maarifçilərinin xalqa ətraflı tanıdılması.

Beşincisi, təhsili idarəetmənin müxtəlif yollarının, forma və metodlarının çox geniş işıqlandırılması.

Altıncısı, məktəb, ailə və ictimaiyyətin təlim-tərbiyədə əlbir fəaliyyətinin yolları barədə geniş materialların əks olunması.

Yeddincisi, yüksəkixtisaslı elmi-pedaqoji kadrların yetişməsinə yardım.

Səkkizincisi, pedaqoji kadrların hazırlanması, təkmilləşdirilməsi və yenidənhazırlanması problemləri üzrə ardıcıl materialların, təkliflərin işıqlandırılması.

Doqquzuncusu, xarici ölkələrdə xalq maarifi üzrə biliklərin maarifçilərimizə təqdim olunması.

Onuncusu, pedaqoji və psixoloji biliklərin, qabaqcıl pedaqoji iş təcrübəsinin, dünyanın mütərəqqi təhsil quruculuğu nailiyyətlərinin, maariflənmək mədəniyyətinin sistemli təbliği.

Azərbaycanda maarifin və pedaqoji fikrin tarixini öyrənməklə məşğul olan mütəxəssislərimizin araşdırmalarının əsas nəticələrini öz səhifələrində ardıcıl çap etməklə, jurnal, həqiqi mənada bir dəyərli salnamə yaratmışdır. Belə ki, xalqımızın tarixinin müxtəlif mərhələlərində böyüyən nəsillərin hansı yollarla və necə tərbiyə edilmələri barədə ümumi bir mənzərəni görmək imkanını gerçəkləşdirmişdir.

Məlum olduğu kimi, Azərbaycanda xalq maarifinin dövlət səviyyəsində sistemli təşkili XX əsrə aiddir. Lakin böyüyən nəsillərin təlim-tərbiyəsinə, inkişafına, dünyanı dərk etməsinə qayğı çox qədimlərdən başlamışdır. Təəssüf ki, bu barədə nailiyyətlər xəzinəsinin hələlik cüzi hissəsini öyrənə bilmişik.

Jurnal elmi pedaqogikanın, pedaqoji psixologiyanın, fənlərin tədrisi metodikasının yaranmasında, inkişafında və təbliğində xüsusilə fərqlənmişdir.

Jurnalın xalqın maariflənməsində əməli köməyini, xalq maarifinin inkişafı üzrə ayrı-ayrı dövrlərdə irəli sürülmüş vəzifələrlə necə ayaqlaşdığını xatırlatmaqla da duya bilərik. Belə ki, iyirminci illərdə kütləviliklə savadsızlığın ləğvi tələbi irəli sürülmüşdü. Jurnal ümummilli əhəmiyyətli işə fəal qoşuldu. Otuzuncu illərdə icbari ibtidai təhsili həyata keçirmək vəzifəsi irəli sürüldü. Jurnal fəaliyyətini bu istiqamətə yönəltdi.

Qırxıncı illərdə icbari 7 illik təhsilə keçmək vəzifəsinin yerinə yetirilməsində jurnal geniş fəaliyyət göstərdi.

Əlli-altmışıncı illərdə icbari 9 və 11 illik təhsil sisteminə keçid geniş ölçüdə aparıldı. Jurnal bu sistemə keçidə elmi-pedaqoji istiqamət verdi, faydalı təcrübənin öyrənilib yayılmasında çox səmərəli iş apardı.

Yetmişinci illərin əvvəllərindən başlayaraq, jurnal, təhsilin elmi-nəzəri problemlərinin həllinə kömək göstərən tədqiqat nəticələrinin çapına daha çox yer verdi.

Hamılıqla 11 illik təhsilin həyata keçirilməsinə, məktəb şəbəkəsinin genişləndirilməsinə, təhsil-tərbiyə müəssisələrində keyfiyyətin artırılmasına xüsusi qayğı göstərildi.

Təhsil sisteminin təkmilləşdirilməsi, pedaqoji işin keyfiyyətinin artırılması, ali təhsilli kadrların sayının çoxalması, bunlarla bərabər pedaqoji və psixoloji elmlərin inkişaf sürətinin artması jurnalın da işini çoxaldırdı. Ona görə də jurnala əlavə kimi fənlər üzrə 1947-1972-ci illər arasında 8 adda metodik məcmuələr yaratmaq zərurətə çevrildi. Müxtəlif vaxtlarda yaradılmış “İbtidai məktəb və məktəbəqədər tərbiyə”, “Fizika və riyaziyyat tədrisi”, “Azərbaycan dili və ədəbiyyat tədrisi”, “Tarix, ictimaiyyat, coğrafiya tədrisi”, “Kimya və biologiya tədrisi”, “Əmək və politexnik təlim”, “Məktəbdə bədən tərbiyəsi” (sonralar adlarında qismən dəyişikliklər aparılmışdır) yarandı.

Bu tədbir imkan verdi ki, “Azərbaycan məktəbi” jurnalı pedaqogika nəzəriyyəsi və tarixi problemlərinə, məktəbşünaslıq məsələlərinə aid materialların işıqlandırılmasına daha çox yer ayıra bilməz.

“Azərbaycan məktəbi” jurnalı Azərbaycan maarifinin son 75 ildəki fəaliyyətinin həqiqi tarixi, onun güzgüsü olmaqla yanaşı, hər bir pedaqoqun, məktəb rəhbərinin də həyatının, uğurlarının və müvəffəqiyyətsizliyinin həqiqi göstəricisi sayıla bilər.

Bu fikri öz həyatımda jurnalın xidmətini xatırlatmaqla təsdiq etmək istərdim.

1956-cı ildə indiki N.Tusi adına ADPU-nun fizika-riyaziyyat fakültəsini bitirən kimi doğma kəndimə-Gürcüstanın Dmanisi rayonunun Ormeşən məktəbinə direktor təyin edildim (20 yaşım var idi). İşə necə başlayacağımı bilmirdim. Həyəcan keçirirdim. Kəndimiz rayon mərkəzindən çox uzaq idi. İlk köməkçim ailə kitabxanamız oldu. Mərhum qardaşlarım–Ziyəddin və Nəsirəddin müəllim idilər (biri ədəbiyyat, dil, tarix; o birisi fizika-riyaziyyat müəllimi). Jurnalın birinci nömrəsindən 1956-cı ildə çıxmış 2-ci nömrəsinə qədər bütün nömrələr ailə kitabxanasında var idi. Avqust ayını bütövlükdə jurnalları birinci səhifədən son səhifəyə qədər oxumalı, öyrənməli oldum. Lakin bu qədər nömrədə məktəb direktorunun praktik fəaliyyətinə, məktəb işinin işıqlandırılmasına aid cəmi 6-7 dəyərli məqalə tapıb oxuya bildim. Bir çox suallara cavab tapa bilmədim. Pedaqogika fənnini bizə tədris etmiş mərhum müəllimim professor Mərdan Muradxanova məktub yazmaq məcburiyyətində qaldım, konkret suallara cavab istədim.

Son dərəcə həssas, xeyirxah, mahir müəllimlik bacarığına malik olan Mərdan müəllim mənə geniş məktub yazdı. Məktubunda suallara cavabla yanaşı, mənə ürəkdirək verir, uğurlar diləyirdi. Eyni zamanda məktəb direktorunun işinə aid iki kitabça da göndərmişdi. Məktubda bildirmişdi ki, sualların bir neçəsinin cavabını “Azərbaycan məktəbi” jurnalı vasitəsilə verəcək. Belə də oldu. Məqaləyə girişdə mənim müraciətimi verməklə bərabər məsələnin aktuallığını da göstərmişdi. İnstitutun pedaqogika fənni proqramında dəyişiklik aparılmasını, məktəb direktoru barədə proqramda olan 6 saatın 2 dəfə artırılmasını təklif etmişdi.

1961-ci ildə əyani aspiranturaya daxil olandan sonra sevimli müəllimim, elmi rəh-

bərim, çox yüksək insani keyfiyyətləri, dərin pedaqoji bacarığı ilə fərqlənən akademik Abasqulu Abaszadənin məsləhəti və vasitəçiliyi ilə "Azərbaycan məktəbi" jurnalı ilə əməkdaşlığa başladım. O zaman Abasqulu müəllimin özü "Fizika və riyaziyyat tədrisi", "Əmək və politexnik təlim" məcmuələrinin redaktoru idi. O, mənə jurnala və bu iki məcmuəyə elmi məqalə yazmağın qaydalarını öyrətdi. Müəllimlərin məqalələrinin redaktəsi işini mənə tapşırır, sonra özü onları yenidən redaktə edir, dəqiqləşdirirdi. Mənə deyirdi: "Bu işi sənə tapşırıram ona görə yox ki, özüm tənbəllik edirəm. Məqsədim sənə elmi araşdırmaları öyrətməklə yanaşı, elmi axtarışların nəticələrini oxuculara çatdırmaq, eyni zamanda başqalarının yazılarını qiymətləndirmək bacarıqları aşılamaqdır. Bunlar sənin gələcəyin üçün lazımdır. Yazıları redaktə etmək özü də yüksək elmi səriştə tələb edir. Elə etməlisən ki, yazı sahibi düzəlişlərin üçün nəinki səndən incisin, hətta sənə minnətdar olsun".

İlk elmi məqaləm 1962-ci ildə çap edildi. Həmin vaxtdan keçən dövr ərzində "Azərbaycan məktəbi" jurnalında 106 elmi məqaləm çap olunub. Elmi-pedaqoji fəaliyyətim, monoqrafiyalarım barədə 40-dan çox material çap edilib. Elmi-tədqiqat yaradıcılığımın məhsullarına 300-dən çox məqalədə istinad edilib. Ümumiyyətlə, jurnal həyatımın çox vacib bir payı, bələdçisi olub. Uzun illər redaksiya heyətinin üzvü, məqalələrin rəyçisi olmuşam. Doğma jurnalımla sıx əməkdaşlıq, yəqin ki, ömrüm boyu davam edəcəkdir.

1973-cü ildən "Fizika və riyaziyyat tədrisi" məcmuəsinin redaktorluğu mənə etibar edildi. O vaxt maarif naziri olan, çox dəyərli insan, "Azərbaycan xalq maarifinin canlı tarixi" (ifadə SSRİ PEA-nın 1-ci vitse-prezidenti Antonina Xripkovanındır), əsrimizin dörddə biri qədər Maarif Nazirliyinə rəhbərlik etmiş mərhum akademik Mehdi Mehdizadə məni redaktor təyin edərkən bildirdi: "Məcmuəyə redaktor olmaq istəyənlər çoxdur, içərilərində professorlar da var. Amma qərara gəlmişəm ki, bu işi sən aparasan. Tədqiqat institutundasan, məktəbdə dərs deyirsən, müəllimlərlə əlaqələrin genişdir. Bir də ki, öz müəllimin mərhum Abasqulu uzun illər bu məcmuədə zəhmət çəkib, sən onun bu işini davam etdirə bilərsən".

Ümumiyyətlə, "Azərbaycan məktəbi" jurnalı 75 il ərzində bütün Azərbaycan ziyalılığının ən etibarlı yol yoldaşı olmuşdur. Respublikada yetişmiş 1000 nəfərdən çox pedaqoji və psixoloji elmlər namizədi və doktorunun hər biri özünün formalaşması, elmi fəaliyyəti üçün "Azərbaycan məktəbi" jurnalına minnətdardır.

Bizcə, eyni ilə "Azərbaycan məktəbi" jurnalı da şərəflənməsində, yaşamasında, uğurlar qazanmasında mühüm rolu olan yaradıcı ziyalılarımıza, gözəl müəllimlərimizə minnətdardır. Çünki onun məzmunu həmin insanların əməyinin nəticəsidir.

Jurnal ziyalılığın inkişafına, ziyalılarımız isə jurnalın fundamental maarif bilgiləri xəzinəsinə çevrilməsinə qarşılıqlı xidmət göstərmişdir.

1990-1993-cü illərdə Azərbaycanın xalq maarifini fəlakətə uğratmış naşı, səriştəsiz, dağıdıcı qüvvələr – inqilabçı ölkə rəhbərlərinin cinayətləri "Azərbaycan məktəbi" jurnalından və ona əlavə metodik məcmuələrdən də yan keçmədi. "Maarifi inqilabi yolla dəyişəcəyik!" şüarı altında jurnalların nəşrini dayandırdılar, onları maliyyələşdirməkdən imtina etdilər. Bu, təkcə onların maarifdən baş çıxarmaq qabiliyyətsizliklərindən deyil, eyni zamanda bəşəriyyətin inkişaf qanunauyğunluqlarından xəbərsizliklərindən irəli gəlirdi. Təhsil sisteminin mahiyyətini, insanlığın formalaşdırılması fəlsəfəsini dərk etməyən həmin "inqilabçılar" 1992-ci ilin dekabrında qəbul etdikləri çox zərərli "Təhsil qanunu" ilə mövcud sistemi

alt-üst etdilər, əvəzinə sistemsizlik mühiti yaratdılar. Yəqin ki, bu ziyan hələ uzun müddət öz təsirini göstərəcəkdir.

“Azərbaycan məktəbi” jurnalının 1990-cı ildən indiyə qədər özünü birtəhər saxlamasını onun yaradıcı kollektivinin, redaksiya heyətinin şərəfli əməyi kimi qiymətləndirməliyik. Onlar bildirdilər ki, maarif mətbuatının bağlanması maarifin ölümünü yaxınlaşdıran addımdır. Odur ki, öz güclərinə, maarifçi alimlərimizin müdafiəsinə arxalanmaqla jurnalın çapını dayandırmadılar.

Maarif sistemi özünün köklü islahatını gözləyir. Bu prosesdə maarif mətbuatının xüsusi rolu nəzərə alınmalıdır. Jurnalın tirajı artırılmalı, həcmi çoxaldılmalıdır. Nəşri tamamilə haqsız dayandırılmış metodik məcmuələr yenidən işə başlamalıdır. Bu, bizim sadəcə istəyimiz yox, həyatın real tələbidir.

İndi Azərbaycanın həyatının elə bir mərhələsidir ki, hər şey: iqtisadi-siyasi sistem, mülkiyyət formaları kökündən dəyişir. Kommunist ideologiyası və mənəviyyatı, kommunizm və sosializm psixologiyası öz dövrünü artıq başa vurur. Qloballaşan dünya prosesləri Azərbaycanın da həyatını əhatə edir. Ölkədə “açıq qapı” siyasəti yeridilir. Dünyanın mötəbər birlikləri Azərbaycanda gedən dəyişmələrə fəal surətdə qoşulur və təkan verir. Dünya dövlətləri ilə yeni münasibətlər qurulur. İslam elmi və tərbiyəsi insanların həyatına, mənəviyyatına daxil olur.

Bütün bunları nəzərə almaqla jurnalın 75 illik məzmununun yenidən qiymətləndirilməsi kimi çox ağır və məsuliyyətli iş aparılmalıdır. Maarif quruculuğu tarixindəki dəyərli elmi ideyalar seçilməli və inkişaf etdirilməlidir. Artıq dövrünü başa vurmuş, bu günlə ayaqlaşmayan, hətta bəzən ziddiyyət təşkil edən ideyalardan əl çəkməyin texnologiyası işlənməlidir. Bu cəhətdən kommunist tərbiyəsi sistemi məktəb həyatından çıxarılmalıdır. Müəllim-şagird-valideyn-ictimaiyyət münasibətləri tamam yeniləşdirilməlidir.

Təhsilin və tərbiyənin məzmunu əsaslı şəkildə təkmilləşdirilməli və yeniləşdirilməlidir.

Təhsili idarəetmə sistemi kökündən dəyişməlidir. Demokratik prinsiplər işlənib həyata keçirilməlidir.

Bu işlərin hər biri elmi əsasda qurulmalıdır. Yüz minlərlə maarif işçisinə yeni elmi bilgilər verilməlidir. Sistemlə nəşr olunan dövri mətbuatsız bu qədər işi görmək mümkün deyil.

Ümid edirik ki, müvafiq icra orqanları deyilənləri nəzərə alacaq, dövri maarif mətbuatının normal məcraya salınmasına, o cümlədən “Azərbaycan məktəbi” jurnalının yeni tələblərə uyğun nəşrinə, metodik məcmuələrin bərpasına və müstəqil jurnallar kimi nəşrinə, yetərincə tirajla çap olunmasına, yayılmasına imkan yaradacaqdır.

“Azərbaycan məktəbi” jurnalının yaradıcı heyətini, onun daimi oxucularını, fəal müəlliflərini, bütün maarifsevərləri jurnalın 75 şərəfli yaşı münasibətilə ürəkdən təbrik edirəm, həmişəyaşarlığını diləyirəm.

**“Azərbaycan məktəbi”, 1999, № 6**

# MİNNƏTDARLIQ HİSSİ İLƏ...

**Əbdül Əlizadə**
***"Azərbaycan məktəbi" jurnalının redaksiya heyətinin üzvü, psixologiya elmləri doktoru, professor***

Sevimli yazıçımız İlyas Əfəndiyev gözəl əsərlərindən birini "Geriyə baxma, qoca" adlandırıb. Gənclik illərinin allı-güllü ovqatında bu sözlərin hikməti, bəlkə də adamın diqqətini cəlb etmir. Sən demə, yaşın öz məntiqi varmış: ömrün romantikası qocalığın xatirəli günlərində imiş. Yaşlandıqca özözünə geriyə baxmaq istəyirsən, baxanda isə gah uşaqlaşıb xatirələrin xoş ilğımında təskinlik tapırsan, gah ilk məhəbbətin səngimiş odunda-alovunda kövrəlirsən, gah qayğısız tələbəlik illərinin həsrətini çəkirsən, gah ata olduğun ilk günlərin fərəhli sevincinə qərq olursan, gah da...

Kim bilir, insan həyatının böyük mənasını ömrün hansı məqamında arayıb-axtarırsan...

Ömrün payızlı günlərində bu munis və həzin hislərin axarında geriyə baxanda mən də həyəcanlanıram, xatirələrin qanadında özüm-özümlə söhbət edirəm, ancaq ürək söz-söhbətinin məhrəm məntiqində sakitləşib təskinlik tapıram, qəlbim öz-özünə dağa dönür. N.Tusi adına Azərbaycan Dövlət Pedaqoji Universitetində-evim-eşiyim kimi sevdiyim bu məşhur ali məktəbdə sadə, təvazökar və təmənnasız müəllim ömrü yaşasam da, bu illər ərzində mənim həmişə "Azərbaycan məktəbi" adlı böyük bir mənəvi aləmim olub. Mən bu nurlu aləmdə respublikanın görkəmli jurnalistləri ilə bahəm məşhur filosofları, psixoloqları və pedaqoqlarının gündəlik qayğısı ilə pedaqoji mətbuatın sirlərini öyrənmişəm və böyük Azərbaycan elminə qovuşmuşam.

...1955-1956-cı illər idi. Azərbaycan Dövlət Universitetini fərqlənmə diplomu ilə bitirmişdim. Ə.Əzimzadə adına Azərbaycan Dövlət Rəssamlıq məktəbində psixologiya və pedaqogika müəllimi işləyirdim.

1953-cü ildə, III kursda oxuyarkən universitetin elmi əsərlərində məqaləm dərc olunmuşdu. İlk yaradıcılıq sevincimin xoş ovqatında həyatımı psixologiya elminə həsr etmək istəyi ilə yaşayırdım. Rəssamlıq məktəbində, necə deyərlər, cəmi-cümlətanı 6 saat dərsim vardı. Həmin illərdə psixologiya sahəsində iş tapmaq əslində mümkün deyildi. Psixologiyanın imici nəinki yox dərəcəsində idi, həm də başlıcası çox adam bu qeyri-adi elmin hətta nə demək olduğunu bilmirdi. Bu şəraitdə universitetin psixologiya şöbəsini seçimli qiymətlərlə bitirmiş məzunların çoxu başqa sahələrdə iş axtarmağa məcbur oldular və Azərbaycan psixologiya elmi neçə-neçə istedadlı alimi hiss olunmadan itirdi. Mən isə kiçik ailəmlə birlikdə 6 saatlıq məvacibin bütün çətinliklərinə səngiməyən ata-ana qayğısı sayəsində dözürdüm. Təskinliyi dostlarımın-sonralar görkəmli Azərbaycan alimləri kimi məşhurlaşmış Əliheydər Haşımov və Əkbər Bayramovun qətiyyətində tapırdım. Bizim üçümüz də müəllimimizlə, görkəmli Azərbaycan psixoloqu, ADU-nun psixologiya və pedaqogika kafedrasının müdiri dosent M.C.Məhərrəmovla dostluq edirdik. Bu, mahiyyətcə iki nəslin elmi dostluğu idi və psixologiya elminin təntənəsinə fanatik inam onun kökünü təşkil edirdi. Dosent M.C.Məhərrəmov bütün qəlbilə psixologiya elmi ilə bağlı idi və bu bənzərsiz hissi qüdrətli psixoloq məharətilə bizə də aşılayırdı. Mən də bu qayğılı günlərdə öz problemimi axtara-axtara Bakıdakı 5 nömrəli uşaq poliklinikasına gəlib çıxmışdım. Xeyirxah baş həkimin rüsxəti ilə həftədə üç gün nevropatoloqun qəbul saatla-

rında müşahidələr aparırdım və əsəbi uşaqların xüsusiyyətlərini öyrənirdim. Bir ildən çox müddətdə topladığım klinik materiallar əsasında "Əsəbi uşaqların tərbiyəsi haqqında" məqalə yazdım və poçtla "Azərbaycan məktəbi" jurnalına göndərdim.

3-4 aydan sonra məqaləm dərc olundu. Bu xəbəri eşidəndə heç bilmirdim nə edim. Çaşıb qalmışdım. Elə bil sehrli aləmə düşmüşdüm.

Redaksiyada məni gülərüzlə qarşıladılar. Xoş sözlər dedilər. Əməlli-başlı qonorar da verdilər. Və... məni tərifləyə-tərifləyə jurnalın baş redaktorunun kabinetinə apardılar.

Baş redaktoru ilk dəfə görürdüm. Sadə və qılıqlı adam idi. Əvvəlcə məqaləmi xeyli təriflədi, tələbəlik illərimlə maraqlandı, III kursda oxuyarkən elmi məqaləmin nəşr olunmasını böyük uğur kimi dəyərləndirdi... Söhbətin yönümü tədricən dəyişilirdi. Azərbaycanda psixologiya və pedaqogika elmlərinin inkişafı haqqında şirin söhbət başlamışdı. Sən demə, baş redaktor məni sınayırmış. O, məni redaksiyaya işə götürmək istədiyini bildirdi. Mən tərəddüd etmədən razılıq verdim. Ərizə yazdım. Baş redaktor əmri imzaladı. Gözləmədiyim halda həyat yolumda yeni mərhələ - "Azərbaycan məktəbi" mərhələsi başladı. Mən qətiyyətlə bunu "mərhələ" adlandırıram və fikrimi açıqlamaq istəyirəm.

Redaksiyanın 5 nəfər əməkdaşı vardı. Ştat cədvəlində onların çoxu şöbə müdiri sayılırdı, əslində isə jurnalın səhifələrində dəsti-xətti bilavasitə görünməyən fədakar ədəbi işçilər idilər. Onların əməyi məşəqqətli və əzablı olsa da, yaradıcılıq fərəhi ilə ondan seçilirdi. Jurnalın hər dəfə siqnal nüsxəsinin çapdan çıxması redaksiyada coşqun əhvali-ruhiyyə ilə qarşılanırdı. Redaksiyanın hər bir əməkdaşı jurnalda çap olunmuş bu və ya digər məqalədə öz qələminin qeyri-adi möcüzələrini görəndə məqalənin bəlkə də həmmüəllifi kimi fərəhlənirdi. Gənc müəllimlərdən bir çoxu məhz jurnalla əməkdaşlıq edə-edə yazmaq öyrənmişdi və redaksiyanın təcrübəli şöbə müdirlərini özlərinin bu sahədə müəllimi sayırdılar.

Redaksiyada yaradıcı bir kollektiv formalaşmışdı. Redaksiyanın məsul katibi Məmmədəli Əliyev artıq tutumlu pedaqoji oçerklər müəllifi kimi məşhurlaşmışdı. Onun rus dilindən tərcümə etdiyi pedaqoji məqalələr də jurnalda tez-tez nəşr olunurdu. Təcrübəli metodist kimi tanınan Nağı Günəşli və Əmiraslan Rəcəbov Azərbaycan dili və ədəbiyyat tədrisi sahəsində respublika müəllimlərinin iş təcrübəsini ümumiləşdirən sanballı məqalələrlə diqqəti cəlb edirdilər. Nağı Günəşli uşaqlar üçün bir-birindən gözəl bədii əsərlər də yazırdı və onun ilk oxucusu şirin söz-söhbəti ilə redaksiyada özünəməxsus yaradıcılıq ovqatı yaradan Əmiraslan müəllim olardı.

Redaksiyada səmərəli elmi mühit bərqərar olmuşdu. Respublikanın görkəmli alimləri tez-tez redaksiyaya gəlir, jurnalın əməkdaşları ilə onları narahat edən, düşündürən problemləri götür-qoy edir, oxucular üçün maraqlı olan mövzuları müəyyən edirdilər. Mən qısa müddətdə görkəmli psixoloq və pedaqoqlarımızla yaxından tanış olmuşdum, onlarla müxtəlif yönümlərdə elmi-metodik əməkdaşlıq edirdim. Qısa müddət ərzində jurnalda müxtəlif məqalələrim nəşr olunmuşdu.

1959-cu ilin oktyabr-noyabr aylarında aspiranturaya imtahan verirdim. Rəqibimin təəssüf ki, elə institutun özündə "nüfuzlu" havadarı da vardı. Mən bunu ürək ağrısı ilə qeyd edirəm və yenə də öz-özümə vahimələnirəm. 1957-ci ildə də aspiranturaya daxil olmaq istəyəndə bu adamların haqsız müqavimətinə tuş olmuşdum və ağrısını çəkmişdim. Lakin imtahan komissiyasının sədri görkəmli Azərbaycan pedaqoqu professor M.Mehdizadə idi. Mehdi müəllim həyatını elmə həsr etmək istəyən gənclərin nəinki cavablarını diqqətlə dinləyir, həm də onların yaradıcılığı ilə yaxından maraqlanırdı. Mənim müxtəlif qəzet və jurnallarda 18 məqaləm dərc olunmuşdu, rəqibim isə hələ bir məqalə belə yazmamışdı. Mehdi müəllimin

qətiyyətli sözləri indi də yaxşı xatirimdədir. O, “aspirantın elmi fəaliyyəti aspiranturadan əvvəl başlayır” – dedi və məni təbrik etdi.

Aspirantura dövründə mən “IV və VI sinif şagirdlərinin təxəyyül fəaliyyətində analiz və sintezin xüsusiyyətləri” mövzusunda axtarışlar aparmağa başlamışdım. Bu problem üzrə yazdığım elmi-metodik səpkili məqalələr “Azərbaycan məktəbi” jurnalında dərc olunurdu. Bir cəhəti də vurğulamaq istəyirəm: aspiranturaya daxil olandan sonra ictimai əsaslarla “Azərbaycan məktəbi” jurnalına əlavə kimi nəşr olunan “Əmək və politexnik təlim” məcmuəsinin redaktor müavini təyin olunmuşdum. Məcmuədə sanballı pedaqoji və metodik məqalələr dərc edilirdi. “Əmək və politexnik təlim” məcmuəsi respublikamızda əmək psixologiyası məsələlərinin işıqlandırılmasında da önəmli rol oynamışdır.

Jurnalın redaksiya heyətinin üzvü kimi fəaliyyət göstərdiyim illərdə də psixologiya elminin aktual problemlərinin sistemli işıqlandırılmasına yaxından kömək göstərməyə çalışmışam. Bu axtarışlarda həmişə jurnalın ayrı-ayrı dövrlərdə baş redaktorları olmuş hörmətli Rüstəm Hüseynovun, Əjdər Ağayevin və Zəhra Əliyevanın gündəlik qayğısını hiss etmişəm. Onlar yaşadığımız zəmanədə psixologiya elminin əhəmiyyətini müdrikcəsinə dəyərləndirmiş, yaş və pedaqoji psixologiyanın aktual problemlərinin jurnal səhifələrində səslənməsi üçün əlverişli şərait yaratmışlar. Respublikanın görkəmli psixoloqları M.Məhərrəmov, Ş.Ağayev, Ə.Bayramov, R.Rəsulov, M.Həmzəyev, Ə.Qədirov və b. sanballı məqalələri ilə təlim-tərbiyə problemlərinin həllində müəllimlərimizə yaxından kömək göstərmişlər. Bu gün bir böyük həqiqəti iftixar hissi ilə qeyd etmək lazımdır: 75 yaşlı jurnal XX yüzillikdə Azərbaycan psixoloji və pedaqoji fikrinin əsl salnaməsi olmuşdur. Dövrün başlıca psixoloji və pedaqoji ideyaları “Azərbaycan məktəbi”nin səhifələrində özünün dolğun əksini tapmışdır. Görkəmli Azərbaycan psixoloq və pedaqoqlarının sanballı əsərləri, ilk növbədə, jurnalın səhifələrində işıq üzü görmüşdür. Bu işıq Prometey odu kimi nurlu olmuş, neçə-neçə kitabın ərsəyə gəlməsində, neçə-neçə fundamental tədqiqatların başa çatdırılmasında önəmli rol oynamışdır. Jurnalın müəllifləri içərisində respublikanın qabaqcıl müəllimləri də xüsusi yer tutmuşlar. Bunların bir çoxunun böyük elmə - Azərbaycan psixologiyası, pedaqogikası və metodikasına yolu elə jurnalda dərc olunmuş məqalələrindən başlanmışdır.

Mənim də onlarla məqaləm jurnalın səhifələrində oxucu qəlbinə yol tapmışdır. Bu məqalələrdən hər birinin dərc edildiyi gün mənim üçün sadəcə olaraq yaradıcılıq fərəhi ilə yaşadığım gün olmamışdır, onlardan hər biri mənim üçün sözün əsl mənasında yaradıcılıq məktəbi olmuşdur və mən bu əzəmətli məktəbdə jurnalın səmimi, xeyirxah əməkdaşlarının qayğısı ilə möcüzəli bir sənətin – mücərrəd elmi həqiqətləri kütləviləşdirmək, elmi-kütləvi üslubda ifadə etmək sənətinin sirlərini öyrənmişəm.

90-cı illər jurnalın həyatında da keçid illəri olmuşdur. Onun nəşrində fasilələr əmələ gəlmiş, səhifələri azalmış, tirajı əskilmişdi. Lakin jurnalın əməkdaşları böyük bir yola-müstəqillik və suverenlik yoluna çıxmış respublikamızın nüfuzlu pedaqoji jurnalını fədakarlıqla yaşatmışlar. Bu illərin əzablı-ağrılı günləri arxada qalsa da, onları xatırlayanda həyəcanlanmaya bilmirsən və jurnalda gecə-gündüz bilmədən Fərhad hünəri ilə çalışan maarif fədailərinin, ilk növbədə, jurnalın baş redaktoru Zəhra xanımın qətiyyətinə heyran qalırsan. Jurnalın redaksiya heyətinin üzvlərinin də bu təntənələrdə özünəməxsus sevinc payı vardır.

Redaksiya heyətinin üzvü kimi mənim də tərcümeyi-halımın və həyat yolumun ən parlaq səhifələri “Azərbaycan məktəbi” ilə bilavasitə bağlıdır. Mən özümün bütün uğurlarıma görə bu jurnala minnətdaram.

**“Azərbaycan məktəbi”, 1999, № 6**

***Unutsaq, unudularıq***

# HƏMİŞƏ XATIRLANACAQ İNSAN!

**Vaqif Qurbanov**
***pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

***Açar sözlər:*** *özfəaliyyət dərnəyi, rolları oynamaq, elmi əsərlər, məqalələr, dilin qanunları, didaktik prinsiplər, nəticələr, dil duyumu.*

***Ключевые слова:*** *самодеятельности, играть роли, научных работ, статьи, законы языка, дидактических принципов, результаты, языковое чутье.*

***Key words:*** *circles, role play, scientific works, articles, language rules, didactic principles, results, language sense.*

Azərbaycan xalqı pedaqogika üzrə elmlər doktoru, professor Bəşir Əhmədovu yüzlərcə elmi-pedaqoji məqalələrin müəllifi, 50-dən çox aspirantın elmi rəhbəri, minlərlə tələbənin sevimli müəllimi kimi xatırlayır.

Bu fikri cəsarətlə söyləməyə hər kəsin mənəvi haqqı vardır.

Prof. B.Əhmədov 50-60-cı illərdə qırmızı diplomla universitet qurtarıb, Şirvan (Əli Bayramlı) rayonunun Kərimbəyli kənd orta məktəbində müəllim işləmişdi və az müddətdə çox yaxşı da ad-san qazanmışdı. Valideynlər və şagirdlər onun müəllimlik fəaliyyətindən möcüzələr danışardılar. Dram dərnəyi yaratması, özünün də rollarda çıxış etməsi haqqında söhbətlər indi də unudulmamışdır.

Bəşir müəllim əmək fəaliyyətinə kənd məktəbindən başlamışdır. 7 illik məktəblərini bitirənlər oxumaq üçün rayonun məktəblərinə, o cümlədən Kərimbəyli orta məktəbinə gedirdilər. O zamanlar Xalac dəqiq elmlər, Kərimbəyli humanitar fənlər sahəsində güclü sayılırdı. Uşaqların əksəriyyəti Bəşir müəllimə görə Kərimbəyliyə gedirdi. Az sonra Bəşir müəllimin iş yerini dəyişdilər. Lakin onun izi məktəbdə qaldı. Qabaqcıllar sırasına çıxan Kərimbəylidə isə xüsusi layihə əsasında bina tikildi, kəndə qarnizon və ya qəsəbə tipli fin yaşayış evləri gətirildi. Baxımlı məktəbi, kitabxanası, kinoteatrı, rəqs meydançası, mağazası, bufeti, idman qurğuları, artezian quyuları və s. iaşə obyektləri olan bu məktəbin yerləşdiyi ərazidə ruslar da yaşayırdı. Məktəbin hər cür şəraiti vardı, mədəniyyət evi hər an məktəbin xidmətində idi. Məktəbin dram dərnəkləri, görüşləri, müsamirələri orada keçirilərdi. Bəşir müəllimin qoyduğu ənənə uzun müddət yaşadı. Sonrakı nəsildən olan Əfrayıl Məmmədov, Allahverdi Eminov, Natiq Əliyev və neçə-neçə tanınmış insanlar (şairlər, alimlər) Kərimbəyli məktəbini bitirdilər. Sonralar isə onun işindən razılıqla danışır və hətta bu barədə yazırdılar. Bəşir müəllim isə öz işini Həşimxanlı kənd məktəbində də davam etdirirdi. Onun Kür sahillərindən Xəzər sahillərinə atılan yetirmələri isə Bəşir müəllimi bu gün də hörmətlə yad edirlər. Onun sonralar ədəbiyyatçı olan şagirdləri güclü dil-ədəbiyyat müəlliminin təsiri ilə dram dərnəkləri yaratmaq, bədii söz ustası kimi böyük bir mətni əzbərdən söyləmək, natiqlik məharəti göstərmək arzusu ilə yaşayır və bu sahədə əllərindən gələni edirdilər. Az sonra elmə böyük həvəsi olan Bəşir

müəllim aspiranturada oxumağa getdi.

O, Bakı məktəblərində təkmilləşmə kurslarında görüşdüyü müəllimlərə çox böyük həvəslə mühazirə oxuyur, seminar keçirir, hamı ilə mehriban davranır, sual verir, bilməyənləri həvəsləndirir, məsləhətləşir, rəy öyrənirdi və s. O bəzən müdavimlərlə yaxınlaşıb nə üçün müəllimliyə gəldiyi, harada işlədiyini soruşurdu. Düz deyirlər ki, ideal bir addımlıqda olsa belə, yenə səndən uzaqdır. Tale elə gətirdi ki, mən onunla bu kurslarda görüşdüm. Təkmilləşmə kurslarının metodisti işləyən rəhmətlik İbrahim Zülfüqarov məni dostu Əziz Əfəndizadəyə tərifləmişdi, mənə mövzu verməsini, elmi rəhbər olmasını xahiş eləmişdi. İbrahim müəllim Bəşir müəllimi də tez-tez tərifləyər, nümunə göstərər və deyərdi: "Sürətlə yüksəlmişdir, aspiranturanı qurtaran kimi namizədlik, daha iki-üç ildən sonra doktorluq müdafiə edib, ETPEİ-də elmi katib işləyib, professor olub..."

1975-ci ildə İbrahim müəllimin zəmanəti, Əziz müəllimin təklifi ilə məni həmin instituta elmi işçi qəbul etdilər. Bəşir müəllimlə bir yerdə işləmək çox maraqlı idi. Onun necə alim olduğunu görürdüm, duyurdum, eşidirdim və getdikcə də daha çox bəyənirdim. O, mükəmməl orta məktəb biliyi, ali təhsil savadı olan, tədqiq etməkdən, araşdırmaqdan, ümumiləşdirməkdən həzz almaqda səbri-hövsələsi olan bir alim idi. Pedaqoji-metodik yeniliklərə hamıdan tez reaksiya verməyi bacarırdı. Bəziləri ona qısqanclıq edir, onu Azərbaycan dilinin tədrisi metodikasından uzaqlaşmaqda və pedaqogikaya meyil etməkdə qınayırdılar. Halbuki o, metodikanı, didaktikanı da pedaqogikanın tərkib hissəsi kimi dərindən və hərtərəfli bilməkdə mahir idi. Linqvodidaktlığı rus alimlərindən M.T.Baranov və A.A.Dudnikovun diqqətini cəlb etmiş, onlar öz kitablarında prof. Bəşir Əhmədovun bəzi fikirlərinin şərhini vermişdilər.

Bəşir müəllim 5 il rayon məktəblərində necə əfsanələşmiş müəllimlik etmişdisə, Bakıdakı alimlik həyatında da eləcə yüksəlməyə başlamışdı.

1975-ci ildən sonra Bəşir müəllim professor kimi böyük coşqu ilə yazıb-yaratmağa başladı, yazıları çap olundu.

Onun yetirmələri gündən-günə çoxalırdı. O çoxlu aspirantların elmi rəhbəri olurdu. Əziz Əfəndizadə kimi onun da zəif yetirmələri ya olmurdu, ya da çox az olurdu. Əziz müəllim onu gənclərə həmişə nümunə göstərirdi. Bəşir müəllim bir dəfə dərslik müzakirələri zamanı yetirmələrini təriflədi, "Əziz müəllim, gənclər yetişiblər" – dedi. Ənvər Abbasov, Haşım Qafarov, Fərrux Həsənov və mən bu qiymətdən çox ruhlandıq. Didaktın bu sözlərindən qürur duyduq. Müdafiəm zamanı Bəşir müəllimi mənə opponent təyin etdilər. Dissertasiyamı oxumuşdu. Rəy üçün onun yanına gedəndə birinci fəsli bəyəndiyini, ikinci və üçüncü fəsli bəyənmədiyini söylədi. Belə dedi, ancaq rəydə çox da qabartmadı. Mən bunun səbəbini sonralar dərk etməyə başladım. Çünki onun söz birləşmələrinin tədrisinə dair tədqiqatdan gözlədiyi mənim gəldiyim nəticələrin tamam əksi idi. Mən başqa yol seçmişdim. Dissertasiya müdafiəsində mənim işimə prinsipiallıqla yanaşdı. Arqumentlərimi eşidib "Sən bunları haradan götürmüsən və kimdən öyrənmisən?" sualına "Sizdən" – deyə cavab verdim və müəllifi olduğu bir dərslikdən çalışmaların icra şərtlərini oxudum. Bundan sonra məclisdə gözəl bir abhava, yeni bir ovqat yarandı. Artıq Bəşir müəllim ucadan gülür, razılıqla danışırdı. O, çox yumşalmışdı, mənə münasibəti tamam dəyişmişdi. Daha tədqiqatın nəticələrinə dair etiraz etmirdi. Sonradan Əziz müəllim həmin maraqlı məqamı şöbədə açıb danışmış və demişdi: "Mən Bəşirin qulağına pıçıldadım ki, Vaqif düz demir, Bəşir isə mənə dedi: "Yox, Əziz, mən belə deməzdim, o, öz

sözünü deyir, belə də olmalıdır".

Bəşir müəllim humanizmlə yoğrulmuş haqq-ədalət adamı idi. O, əsl tənqidçi alim idi.

2005-ci ildə AMİ-də keçirilən dövlət imtahanına sədrlik edirdi. Xəstəliyinin getdikcə şiddətləndiyi hiss olunurdu. Tale ona 80 il yaşamağı qismət eləmədi. Məndən "Əziz neçə yaşında vəfat etdi?",- deyə soruşdu. 75 – cavabını verdim, inanmadı. Əslində elə deyildi. Söhbəti dərhal dəyişdim. Dedim ki, Tovuzda oldum, siz qurtaran orta məktəbi ziyarət etdim. Orada gözəl bir tədbir keçirdim. Sizi xatırladıq. Nazirliyin Kollegiya iclasında həmin məktəbi təriflədim – Bəşir müəllimin məktəbidir-dedim, razılığını bildirdi. Kərimbəyli məktəbini yada saldım. Sevindi, o zamankı əlaçı uşaqlardan bir neçəsinin adını çəkdi, onlarla əlaqə saxladığını dedi.

Bu gün Bəşir müəllim aramızda yoxdur. Ancaq onun elmi-nəzəri-pedaqoji fikirləri yaşayır.

Bəşir müəllim səmimi yoldaş, yaxşı dost idi. Onunla həmsöhbət olmaq, məsləhətləşmək, yaradıcılıq əlaqəsində olmaq adamda xoş əhvali-ruhiyyə və səmimi hislər yaradırdı. O, respublikamızda gedən təhsil quruculuğunun fədailərindən biri idi. Bəşir müəllim həmkarları arasında çoxşaxəli yaradıcılığı, elmi-pedaqoji fəaliyyəti və şəxsi keyfiyyətləri ilə fərqlənirdi. Gərgin zəhmət, əzab-əziyyət, işgüzarlıq və inadkarlıq onun təbiətindən doğurdu.

Bəşir Əhmədov didaktika sahəsində elmi ideyalar generatoru, metodika sahəsində elm animatoru, linqvistika sahəsində elm moderatoru idi. Dilimizin tədrisinin tədqiqi və təbliğində onun xidmətləri böyükdür.

*Rəyçi: AJB-in üzvü N.Musayev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan pedaqoji antologiyası. XIX əsr-XX əsrin əvvəlləri. Bakı: ADPU, 2011.

2. Əhmədov B. Azərbaycan dili təliminin qanunları, prinsipləri və metodları. Bakı: Maarif, 1973.

3. İlyasov M. Peşəyönümün əsasları. Bakı, 2011.

**В.Курбанов**

**Вечно запоминающийся человек**

**Резюме**

В статье отмечаются научно-педагогическая деятельность проф. Б.А.Ахмедова, отмечается, что он является известным методистом в современной азербайджанской педагогической науке. Он подготовил более 50 аспирантов и докторантов. Автор статьи а также характеризует человеческие качества Б.А Ахмедова.

**Y.Gurbanov**

**The person -who is always remembered**

**Summary**

The article is dedicated to the famous instructor, professor Akhmadov who trained more than 50 graduate and doctoral students and taught them moral values.

**Azərbaycan Respublikası Təhsil Nazirliyinin
16 may 2014-cü il tarixli,
600 nömrəli əmri ilə təsdiq edilmişdir**

# MÜƏLLİMLƏRİN ETİK DAVRANIŞ QAYDALARI

**1. Ümumi müddəalar**

1.1. Müəllimlərin etik davranış qaydaları (bundan sonra - Qaydalar) təhsilin bütün səviyyələrində peşə fəaliyyəti zamanı təhsilverənlərin ümumi davranışını və təhsil prosesi iştirakçıları ilə qarşılıqlı münasibətlərini tənzimləyən normalar məcmusundan ibarətdir.

1.2. Bu Qaydalar "Təhsil haqqında" Azərbaycan Respublikası Qanununa, digər qanunvericilik aktlarına və "Təhsil prosesi iştirakçılarının etik standartlar modeli"nə uyğun hazırlanmışdır.

1.3. Bu Qaydalar müəllimlərin etik davranış prinsiplərini və onlara uyğun tələbləri, təhsil prosesi iştirakçılarının qarşılıqlı münasibətlərinin xüsusiyyətlərini müəyyən edir və onları tənzimləyir.

1.4. Bu Qaydalar bütün növ təhsil müəssisələrində çalışan müəllimlərə şamil edilir.

1.5. Bu Qaydaların tətbiqində əsas məqsəd təhsil müəssisələrində sağlam işgüzar durumun bərqərar olmasına, vətəndaşların təhsil müəssisəsinə və müəllimə etimadının artırılmasına, təhsil müəssisələrinin idarə olunmasında valideynlərin və cəmiyyətin daha yaxından iştirakının təmin edilməsinə, təhsil müəssisələrinin fəaliyyətində səmərəliliyin və şəffaflığın artırılmasına, təhsil müəssisəsində korrupsiya hallarının və maraqların toqquşmasının qarşısının alınmasına və müəllim nüfuzunun yüksəldilməsinə nail olmaqdan ibarətdir.

**2. Etik davranış prinsipləri və onlara uyğun tələblər**

Müəllim peşə fəaliyyətində aşağıdakı etik davranış prinsiplərini gözləməli və müvafiq tələblərə ciddi şəkildə əməl etməlidir.

**Qanunun aliliyi** – müəllim vəzifə funksiyalarının icrası zamanı Azərbaycan Respublikası Konstitusiyasının, Azərbaycan Respublikasının qanunlarının, habelə Azərbaycan Respublikasının tərəfdar çıxdığı beynəlxalq müqavilələrin tələblərinə, insan hüquqlarına və demokratik prinsiplərə əməl etməyə borcludur.

**Vicdanlılıq** – müəllim cəmiyyət və dövlətin maraqları naminə öz peşə fəaliyyətini keyfiyyətlə və səmərəli yerinə yetirməyə borcludur. Müəllim bütün hallarda hər bir şəxs üçün vicdanlılıq nümunəsi olmalıdır.

**Peşəkarlıq və fərdi məsuliyyət** – müəllim öz fəaliyyətini Azərbaycan Respublikasının qanunvericiliyi ilə müəyyən olunmuş səlahiyyətlər çərçivəsində peşəkar səviyyədə yerinə yetirməyə borcludur və vəzifə funksiyalarının keyfiyyətlə yerinə yetirilməsinə görə məsuliyyət daşıyır. Müəllim peşəkar fəaliyyəti və şəxsi nümunəsi ilə təhsilalanların, valideynlərin, cəmiyyətin təhsil sisteminə, təhsil müəssisəsinə və təhsil işçilərinə inamını artırmalı və möhkəmləndirməlidir.

**Loyallıq** – müəllim onun peşə vəzifəsinə aid olmadığı hallarda işlədiyi və digər təhsil müəssisələrinin, dövlət orqanlarının, onların rəhbərlərinin fəaliyyəti ilə əlaqədar (qanunsuz fəaliyyət istisna olmaqla) tənqidi ictimai mülahizələrdən, çıxışlardan və onların fəaliyyətinə ictimai qiymət verilməsindən çəkinməlidir. Müəllim peşə fəaliyyəti zamanı müəllim adına və nüfuzuna, habelə təhsil müəssisəsinin işgüzar nüfuzuna xələl gətirə biləcək hərəkətlərə yol verməməlidir.

**Mədəni davranış** – müəllim təhsilalanlarla, rəhbərlik və həmkarları ilə davranışında nəzakətli, xeyirxah, diqqətli və təmkinli olmalıdır. Müəllim peşə fəaliyyəti ilə əlaqədar iradları, tənqidi fikirləri qəbul etməli, qiymətləndirməli və onlardan düzgün nəticə çıxarmalıdır. Müəllim səmimi, çalışqan, intizamlı, təşəbbüskar olmalı, xarici görkəminə, geyiminə xüsusi fikir verməli, hər zaman səliqəli olmalıdır.

**Qərəzsizlik** – müəllim peşə vəzifəsini yerinə yetirərkən qərəzsiz olmalı, irqinə, milliyyətinə, dilinə, cinsinə, sosial mənşəyinə, dinə münasibətinə, əqidəsinə, ictimai mənsubiyyətinə görə təhsilalanlara və təhsil prosesinin digər iştirakçılarına fərq qoymamalıdır. Müəllim özünün və ya maraqlı şəxslərin mənafelərinin vəzifə funksiyalarının icrası zamanı ona təsir etməsinə yol verməməli və buna şərait yaratmamalıdır. Müəllim öz peşə vəzifəsindən və səlahiyyətlərindən kənar məsələlərə müdaxilə etməməlidir. Müəllim peşə fəaliyyətini yerinə yetirərkən siyasi bitərəfliyə əməl etməyə borcludur.

**Gender bərabərliyi** – müəllim təhsil və tərbiyə prosesində kişi və qadın cinsindən olan təhsilalanların bərabərliyi prinsipinin gözlənilməsinə davamlı olaraq əməl etməlidir.

**İctimai etimad** – müəllim peşə nüfuzunu möhkəmləndirməyə, müəllim adını, şərəf və ləyaqətini uca tutmağa borcludur. Müəllim etik davranış qaydalarını pozduğu halda pozuntunu tez bir zamanda aradan qaldırmalı, ictimai etimadın bərpasına çalışmalıdır. Müəllim işlədiyi təhsil müəssisəsinin fəaliyyəti barədə KİV nümayəndələrinin qanunla müəyyən edilmiş qaydada doğru məlumatlanmasına kömək göstərməlidir.

**Konfidensiallıq** - qanunvericiliklə nəzərdə tutulmuş hallar istisna olmaqla, müəllim peşə vəzifələrinin icrası ilə bağlı təhsilalanların, onların valideynlərinin, habelə həmkarlarının şəxsi həyatı barədə ona məlum olan məlumatların konfidensiallığını təmin etməlidir.

**3. Müəllim şəxsiyyəti**

3.1. Müəllimin peşə fəaliyyəti qanunvericiliklə müəyyən olunmuş vəzifələrinin yerinə yetirilməsi və hüquqlarının təmin olunması ilə əlaqədar fəaliyyətdir.

3.2. Müəllim təhsil sahəsində dövlət siyasətinin həyata keçirilməsində iştirak edir, təhsil proqramlarının təhsilalanlar tərəfindən mənimsənilməsini təmin edir.

3.3. Müəllim təhsilalanlarda fəal vətəndaş mövqeyi formalaşdırır, onları vətənpərvərlik, azərbaycançılıq və dövlətçilik ruhunda tərbiyə edir, müstəqil həyata və əmək fəaliyyətinə hazırlayır.

3.4. Müəllim əlavə təhsil və özünütəhsil yolu ilə ixtisasını, elmi-pedaqoji və peşəkarlıq səviyyəsini daim artırır, təhsilin nəticə və göstəriciləri üzrə araşdırma və təhlillər aparır, keyfiyyətin yüksəldilməsi və nailiyyətlərin əldə edilməsi üçün təkliflərlə çıxış edir.

3.5. Müəllim yenilikçidir, innovasiya və yeni tədris texnologiyalarını mənimsəyir və öz təcrübəsində tətbiq edir.

3.6. Müəllim ona həvalə edilmiş işin keyfiyyətinə və nəticələrinə görə və hər bir təhsilalanın intellektual, emosional, mənəvi inkişafı üçün məsuliyyət daşıyır.

3.7. Müəllim gənc nəslə milli və bəşəri dəyərləri aşılamaqla təhsilalanların mədəni inkişafı prosesində birbaşa iştirak edir.

3.8. Müəllim təhsilalanlara keyfiyyətli təhsil verməklə peşəsinə olan ictimai etimad və hörməti doğruldur.

3.9. Müəllim pedaqoji etika və əxlaq normalarına riayət edir, müəllim nüfuzunu yüksək tutur, ziyalılıq nümunəsi göstərir.

3.10. Müəllim şəxsi nümunəsi ilə təhsilalanlara Azərbaycan Respublikasının Konstitusiyasına və qanunlarına, dövlət rəmzlərinə, Azərbaycan xalqının tarixinə, mədəniyyətinə, dilinə, adət və ənənələrinə,

milli və ümumbəşəri dəyərlərə, cəmiyyətə, ətraf mühitə hörmət və qayğı hissi aşılayır.

3.11. Müəllim təhsilalanların şərəf və ləyaqətinə hörmətlə yanaşır, əsassız mühakimələrə yol vermir, obyektivlik və qərəzsizlik nümayiş etdirir.

3.12. Müəllim peşə fəaliyyəti dövründə maraqların toqquşmasına yol vermir və vəzifə səlahiyyətlərindən şəxsi maraqları üçün istifadə etmir.

3.13. Müəllim bilərəkdən yalan, təhrif olunmuş, yaxud öz şəxsi marağı naminə həmkarının vəziyyətini pisləşdirən və ya yaxşılaşdıran məlumat verilməsinə görə qanunvericilikdə nəzərdə tutulmuş qaydada məsuliyyət daşıyır.

3.14. Müəllim təhsil müəssisəsinin əmlakından səliqəli və səmərəli istifadə edir, onu qoruyur. Müəllim təhsil müəssisəsinə məxsus əmlakdan (sinif otağı, tədris resursları, telefon, kompyuter, mebel və s.) şəxsi maraqları üçün istifadə etmir.

3.15. Müəllim icra və əmək intizamına riayət edir, iş vaxtında kənar işlərlə məşğul olmur, üzürsüz səbəbdən işdən yayınmır.

3.16. Müəllim şəxsi həyatında milli əxlaq, ictimai davranış normalarına riayət edir.

**4. Münasibətlər**

**4.1. Təhsilalanlarla münasibət**

4.1.1. Müəllim təhsilalanlarla münasibətdə qarşılıqlı hörmətə əsaslanan ünsiyyət tərzi seçməlidir.

4.1.2. Müəllim özünə və təhsilalanlara qarşı tələbkar olmalı, bu tələbkarlıq əsaslı və müsbət xarakter daşımalıdır.

4.1.3. Müəllim təmkinli davranmalı və hər bir vəziyyətdə özünü ələ almağı bacarmalıdır.

4.1.4. Müəllim təhsilalanlarda müsbət keyfiyyətlərin formalaşmasına və inkişafına təkan verəcək müasir təlim texnologiyalarından və strategiyalarından istifadə etməlidir.

4.1.5. Müəllim hər bir təhsilalanın sağlamlığını və rifahını düşünərək, onları zərərli vərdişlərdən çəkindirməlidir.

4.1.6. Müəllim təhsilalanların fəaliyyəti, nailiyyətləri və kompetensiyalarının qiymətləndirilməsində obyektiv və qərəzsiz olmalı, təhsilalanlarda özünəinam hissini möhkəmləndirməli, motivasiyanı yüksəltməlidir. Təhsilalanlara verilən qiymətin qərəzli şəkildə azaldılmasına və ya əsassız olaraq artırılmasına yol verməməlidir.

4.1.7. Müəllim təhsilalanlara qarşı xeyirxah və ədalətli olmalı, onlara qarşı haqsızlığa yol verdikdə səhvini etiraf etməyi bacarmalı, onun nəticələrini aradan qaldırmağa çalışmalıdır.

4.1.8. Müəllim hər zaman nitqinə fikir verməli, nitqində kobud və təhqiredici sözlər işlətməməlidir.

4.1.9. Müəllim təhsilalanlara qarşı fiziki zor işlətməməli, onların şərəf və ləyaqətini alçaldan hərəkətlərə (və ya hərəkətsizliyə) yol verməməlidir.

4.1.10. Qanunvericilikdə müəyyən olunmuş hallar istisna olmaqla, müəllim təhsilalanlar tərəfindən ona verilən şəxsi məlumatların məxfiliyini qorumalıdır.

4.1.11. Təhsilalanlarla münasibətdə müəllim öz vəzifə səlahiyyətlərindən sui-istifadəyə yol verməməlidir.

4.1.12. Müəllim peşə fəaliyyətini yerinə yetirmək müqabilində təhsilalanlardan hər hansı maddi və qeyri-maddi nemətlər tələb etməməlidir.

4.1.13. Müəllim qanunvericiliklə müəyyən edilmiş qaydada təhsilalanlara göstərdiyi əlavə təhsil xidməti (xidmətləri) müqabilində hədiyyə və ya pul tələb etməməlidir.

**4.2. Kollektivlə münasibət**

4.2.1. Müəllimlər arasında münasibət əməkdaşlıq və qarşılıqlı hörmət prinsipinə əsaslanmalıdır. Müəllim yalnız şəxsi nüfuzunu deyil, işlədiyi təhsil müəssisəsinin və həmkarlarının da nüfuzunu qorumalıdır.

Təhsilalanlar və digər şəxslər qarşısında müəllimin öz həmkarını təhqir etməsi və zor tətbiq edilməsi yolverilməzdir.

4.2.2. Müəllim öz həmkarının peşəkar baxış və fikirlərinə hörmətlə yanaşmalıdır.

4.2.3. Müəllim pedaqoji münasibətlərdə əsassız münaqişə və mübahisələrə yol verməməlidir. Münaqişə yarandıqda isə onun konstruktiv həllinə çalışmalıdır.

4.2.4. Müəllim ümumi vəzifələrin icrasına və əməkdaşlığa mane olacaq rəqabətə yol verməməlidir.

4.2.5. Müəllim həmkarlarının fəaliyyətini düzgün qiymətləndirməli, onların səhvlərinə göz yummamalı, fikir və baxışlarına yönəlmiş tənqidləri təhqirə çevirməməlidir, tənqid əsaslandırılmış, dəqiq və xoşniyyətli olmalıdır.

4.2.6. Müəllim öz fəaliyyəti ilə işlədiyi kollektivin nüfuzunun artmasına çalışmalıdır.

**4.3. Rəhbərliklə münasibət**

4.3.1. Müəllim vəzifəyə təyin edilərkən və işlədiyi müddətdə rəhbərlik onu etik davranış qaydaları, korrupsiyaya qarşı mübarizə və maraqların toqquşmasının qarşısının alınması ilə bağlı normativ hüquqi aktlarla tanış etməlidir.

4.3.2. Müəllim səlahiyyətləri daxilində rəhbərliyin qanuna uyğun yazılı əmrlərini, sərəncamlarını və ya şifahi tapşırıqlarını yerinə yetirməyə borcludur.

4.3.3. Müəllim təhsil müəssisəsinin rəhbərliyi tərəfindən ona verilən əmrin və tapşırığın qanuna və ya digər normativ hüquqi akta zidd olmasına əmindirsə, o, həmin əmri və ya tapşırığı yerinə yetirməkdən imtina edə bilər. Bu barədə yazılı əsaslandırmanı birbaşa rəhbərliyə və ya yuxarı orqana təqdim etməlidir.

4.3.4. Rəhbərliyin qanuni göstərişlərinin müəllimlər tərəfindən yerinə yetirilməməsi intizam məsuliyyətinə səbəb olur.

4.3.5. Təhsil müəssisəsinin rəhbərliyi kollektivin etik davranış qaydalarına əməl etməsinə birbaşa məsuliyyət daşıyır.

4.3.6. Rəhbərliyin müəllimlərlə münasibəti qarşılıqlı hörmət əsasında qurulmalıdır.

4.3.7. Rəhbərlik tərəfindən müəllim əməyinin qiymətləndirilməsi həqiqi xidmətlərinə görə olmalı, qərəzsiz və ədalətli formada həyata keçirilməlidir.

4.3.8. Rəhbərliyin müəllimdən peşə vəzifələrinin icrasına aid olmayan və ya şəxsi həyatı haqqında məlumatlar tələb etməsi və yayması yolverilməzdir.

4.3.9. Müəllim rəhbərliyə öz həmkarları barədə bilərəkdən yalan və ya təhrif olunmuş məlumatlar verməməli, məlumatı verməzdən əvvəl bütün imkanlardan istifadə edərək onun düzgün olub-olmamasını müəyyən etməlidir.

4.3.10. Təhsil müəssisəsinin rəhbərliyi tərəfindən müəllim əməyinin keyfiyyətinə və onun karyerasına təsir edəcək məlumatların gizlədilməsi və ya ona təhrif olunmuş məlumatların verilməsi yolverilməzdir.

4.3.11. Rəhbərlik təhsil müəssisəsinin fəaliyyətinə mənfi təsir göstərən münaqişələr və maraqların toqquşması hallarının qarşısını vaxtında almalı, yaranmış münaqişəni konstruktiv həll etməyə çalışmalı və nizam-intizam yaratmalıdır.

**4.4. Valideyn və qanuni nümayəndələrlə münasibət**

4.4.1. Müəllim valideyn və qanuni nümayəndələrin hüquqlarını bilməli, mütəmadi olaraq onlara təhsilalanlarla bağlı tövsiyələr verməli, valideyn və uşaqlar arasında yaranan münaqişələrin həllində yardımçı olmalıdır.

4.4.2. Müəllim tərəfindən valideynlərin qanunazidd hərəkətlərə sövq edilməsi yolverilməzdir.

4.4.3. Müəllim valideyn və digər qanuni nümayəndələrlə hörmətlə və nəzakətlə davranmalıdır.

4.4.4. Valideyn və qanuni nümayəndələrlə münasibətlər təhsilalanlarla münasibətlərə və onların nailiyyətlərinin qiymətləndirilməsinə təsir göstərməməlidir.

4.4.5. Valideyn və qanuni nümayəndələr tərəfindən könüllü və qanuni yollarla təhsil müəssisəsinə edilmiş yardım, müəllim - təhsilalan münasibətlərinə və nailiyyətlərin qiymətləndirilməsinə təsir göstərməməlidir.

**4.5. Müəllim və cəmiyyət**

4.5.1. Müəllim milli-mənəvi dəyərlərin, mədəni irsin qoruyucusu missiyasını daşımaqla bərabər cəmiyyətin fəal üzvü olmalıdır.

4.5.2. Müəllim hər zaman cəmiyyətə fayda verməyə çalışmalıdır. Yalnız peşə fəaliyyətini həyata keçirərkən deyil, bütün hallarda münaqişələrə və yersiz mübahisələrə yol verməməli, problemlərin həllinə, münaqişələrin qarşısını almağa çalışmalıdır.

4.5.3. Müəllim vətəndaşlıq borcunu dərk etməli və yerinə yetirməli, cəmiyyət üzvləri ilə münasibətlər qurarkən öz şəxsiyyətini qorumalı və mənfi təsir altına düşməməlidir.

**5. Müəllim andı**

5.1. And Azərbaycan Respublikası ilə müəllim arasında açıq hüquqi borc və sədaqət münasibətlərini təsdiq edir.

5.2. Müəllim ilk dəfə daimi işə qəbul olunarkən belə bir and içir: "Azərbaycan Respublikası Konstitusiyasına və qanunlarına riayət edərək Azərbaycan təhsilinin ənənələrinə sadiq qalacağıma, keyfiyyətli təhsil xidməti göstərəcəyimə, peşəkar fəaliyyət zamanı qeyri-etik davranışın hər hansı bir formasına yol verməyəcəyimə, həmkarlarım, təhsilalanlar, valideynlər və digər şəxslərlə münasibətləri hörmət, şərəf və ləyaqət əsasında quracağıma, müəllim adını və şərəfini uca tutacağıma and içirəm."

5.3. Andiçmə təntənəli şəraitdə Azərbaycan Respublikasının Dövlət bayrağı altında Azərbaycan Respublikasının Konstitusiyasına əl basmaqla həyata keçirilir.

5.4. Andiçmə bir dəfə olur. Andın imzalanmış mətni müəllimin şəxsi işində saxlanılır.

**6. Etik davranış qaydalarına riayət olunmasının təmin edilməsi**

6.1. Hər bir müəllim etik davranış qaydalarına əməl etməyə borcludur.

6.2. Müəllimlər tərəfindən etik davranış qaydalarına əməl olunması rəhbərlik tərəfindən müntəzəm təhlil edilir və bu Qaydalarla müəyyən edilmiş tədbirlər görülür.

6.3. Təhsil müəssisəsinin rəhbərliyi:

6.3.1. yeni işə qəbul olunan müəllimləri bu Qaydalarla tanış etməlidir.

6.3.2. müəllimlərin davranışının bu Qaydalara uyğunluğuna nəzarət etməli və onun təhlilini aparmalıdır;

6.3.3. öz davranışı ilə Qaydalara əməl olunmasında nümunə göstərməlidir.

6.3.4. pedaqoji kollektivi və ya hər hansı bir müəllimi hüquqa və etik normalara zidd olan hərəkətlərə sövq etməməlidir.

6.3.5. Qaydaların pozulmasının qarşısının alınması üzrə tədbirlər görməlidir.

6.3.6. pedaqoji kollektivə Qaydaları izah etməli və müraciət edən hər bir müəllimə müvafiq tövsiyələr verməlidir.

6.3.7. bu Qaydaların pozulması hallarının rəhbərlikdə və kollektivdə müzakirəsini təşkil etməli və qayda pozmuş müəllimlərin qanunvericiliyə uyğun intizam məsuliyyətinə cəlb edilməsi üçün tədbirlər görməlidir.

6.3.8. Qaydaların pozulması halları ilə bağlı həyata keçirilmiş tədbirlər barədə kollektivi və ictimaiyyəti məlumatlandırmalıdır.

6.3.9. bu Qaydaların pozulmasının nəticələrinin aradan qaldırılması, təhsil müəssisəsinə ictimai etimadın artırılması üçün tədbirlər görməlidir.